Əlyazma qaynaqları əsasında nəşrə hazırlayan və ön sözün müəllifi: **Azadə Musayeva**

Redaktoru: **Səadət Şıxıyeva**

**894.3611-dc21**
**AZE**
**Şeyx İbrahim Gülşəni Bərdəi. Divan.** Bakı, "Avrasiya press", 2006, 416 səh.

Azərbaycan sufi ədəbiyyatının tanınmış nümayəndələrindən olan şeyx və şair İbrahim Gülşəninin (1426-1534) ondan artıq əsəri bu günədək əlyazma kitablarında qalmaqdadır. Onun türk "Divan"ı Vatikan, Sankt-Peterburq və Ankara əlyazmaları əsasında hazırlanaraq ilk dəfə nəşr olunur.

**ISBN10 9952-421-89-1**
**ISBN13 978-9952-421-89-7**



Azərbaycan Respublikasının Prezidenti
İLHAM ƏLİYEVİN
**"Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında"**
12 yanvar 2004-cü il tarixli sərəncamı ilə nəşr olunur və ölkə kitabxanalarına hədiyyə edilir

## ÖN SÖZ

Özündən sonra zəngin irs qoyub getmiş İbrahim Gülşəni beş əsrə yaxındır ki, tədqiqatçıların diqqətini cəlb etməkdədir. Orta çağlar təzkirələrində, XIX–XX yüzilliklər ədəbiyyat tarixçilərinin, ədəbiyyatşünasların əsərlərində, Şərq əlyazma kataloqlarında, ensiklopediyalarda və s. Gülşənidən bilgilər vardır.

*Orta əsr təzkirələri məşhur şəxsiyyətlərdən söz açan qaynaq kimi* olduqca dəyərlidir. Lakin onlarda mənqəbələrə də istinad edildiyindən, haqqında danışılan şəxsiyyətlərin yaradıcılıqlarına ardıcıl söykənilmədiyi, sonrakı müəlliflərdən bəzilərinin isə oradakı fikirləri təkrar etməklə kifayətləndikləri xüsusi qeyd olunmalıdır. Bunu Gülşəni haqqında yazılanlara da aid etmək olar. Gülşənidən söz açan müəlliflərin bir sırasının əlində şairin əsərlərinin olmadığını, bu səbəbdən belə halların meydana çıxdığını düşünürük. Lakin ilkin qaynaqların bizə Gülşəni əsərlərinin biblioqrafiyasını öyrənməyə köməkçi olması da bir reallıqdır.

İbrahim haqqında məlumat verən ilk mənbələrdən biri Kastamonulu Lətifinin şairin ölümündən 12-13 il sonra – 1546-cı ildə tamamladığı "Təzkirə"sidir (Təzkirəyi-Lətifi. İstanbul, 1308, s.52-53). Lətifi şairin doğulduğu yer, təxəllüsü, gəncliyində Təbrizə köçməsi, Dədə Ömərin himayəsində olması, "ağıllı adamlar arasında şeirləri ilə məşhurluğu", qəzəllərinin oxucularda ruh yüksəkliyi və məhəbbət oyatması və s. haqqında məlumatlar verir. Gülşənidən yazan sonrakı müəlliflərin əksəriyyəti Lətifinin yazdıqlarına ilkin mənbə kimi əsaslanmış və demək olar ki, onun dediklərini təkrar etmişlər.

Hafiz Hüseyn Kərbəlayi Təbrizi "Rövzətül-cinan və cənnətül-cinan" (h.975, m.1567-68) adlı kitabında Gülşəninin adını çəkmişdir. XVIII əsrdə Noizadə Ətai (1583-1635) Taşköprülüzadə Əhməd əfəndinin 1528-ci ildə yazdığı "Əş-Şəraiq ən-ne'maniyyə fi üləma əd-dövlət əl-Osmaniyyə"sinin Ədirnəli Məcdi tərəfindən türkcəyə tərcüməsini örnək edərək Taşköprülüzadənin buraxdığı yerdən (Qanuni Sultan Süleymanın son illərindən) başlayaraq IV Murad dövrünə qədər yetişən "üləma və məşaixin" tərcümeyi-halından ibarət yazdığı zeyldə Gülşənini xatırlamış, Katib Çələbi (1609-1656) məşhur "Kəşfüz-zünun"unda onu anmışdır.

XIX-XX yüzilliklər ədəbiyyatşünas-alimlərinin (xüsusilə Türkiyədəkilərin) Gülşəninin öyrənilməsində danılmaz əməyi vardır ki, bunlara



Şəmsəddin Saminin "Qamus əl-e'lam", Naci əfəndinin "Əsami", Bursalı Məhəmməd Tahirin "Osmanlı müəllifləri, Əlaəddin Kovşanın "Türk məşhurları", "Rəsmli yeni lüğət və ensiklopediyası", Vəsfi Mahir Kocatürkün "Türk ədəbiyyatı tarixi" örnək ola bilər. Sadiq Kamal "Şərhi əsmmayi-ənbiyanın, övliyanın qissəsi"ndə Gülşəni ilə bağlı bioqrafik məlumatları, hətta nəzmlə qələmə almağa müvəffəq olmuşdur. Xacəzadə Əhməd Helmi "İbrahim Gülşəni" adlı kitabçasını adından göründüyü kimi Bərdəli şairimizə, eləcə də onun bağlı olduğu təriqətin sələf və xələflərinə həsr etmişdir. O, Gülşənini "Hacı İbrahim Gülşəni əl-Hacı İbrahim Şihabəddin bin Aytoğmuş bin Güntoğmuş bin Oğuz Ata" deyərək təqdim etmiş, *"silsileyi-nəsəbi-şəriflərini" göründüyü kimi* Oğuz Ataya bağlamışdır. Müəllif Gülşəninin həyatı ilə bağlı bir sıra maraqlı məlumatlar verir ki, bunlara İbrahimin atasını çox erkən itirməsi, əmisi Seyyid Əlinin himayəsində tərbiyə alması, atasından ona çoxlu kitab qalması və s. daxildir. Əhməd Helminin yazdığına görə İbrahim balaca ikən bir sıra üstünlükləri ilə yaşıdlarından fərqlənmişdir: "Bu səbiyi-safdildə başqa çocuqlarda görünməyən fövqəl'adə halət müşahidə olunurdu". Kasım Kufralı "İslam ensiklopediyası"nın dördüncü cildindəki "Gülşəni" məqaləsində özünə qədər deyilmişlərə bir növ yekun vurmağa müvəffəq olmuşdur. XIII yüzillikdən bəri yazılmış abidələrdən toplanan "Tarama sözlüyü"ndə tədqiqata cəlb olunmuş 227 əsərdən biri də Gülşəninin Türkiyənin Millət kitabxanasındakı əlyazmasıdır. Divanın tədqiqatçısı Kilisli Rüf'ət Bilgədir.

Azərbaycan tədqiqatçılarından Məhəmmədəli Tərbiyət "Danişməndani-Azərbaycan"ında orta əsr təzkirələrini əsas götürərək "təfsir elmində və hədisdə mahir", "kəlam və təsəvvüfdə öz zəmanəsinin ustadlarından" sayılan İbrahimin tərcümeyi-halını yazmağa müvəffəq olmuşdur. Əbdürrəsul Xəyyampur "Fərhəngi-süxənvəran"da onu Gülşəni Azərbaycani adlandırmışdır.

Fazil Seyidov "Azərbaycanın görkəmli simaları" rubrikası ilə çap etdirdiyi silsilə məqalələrinin birini İbrahim Gülşəniyə həsr etmiş, M.Tərbiyətə istinadən özünə qədər deyilənləri qısaca ümumiləşdirmişdir. P.Makulu "Ədəbi məlumat cədvəli"nə şairin adını salmışdır.

Akad. H.Araslı "Azərbaycan ədəbiyyatı tarixi"nin 1960-cı ildə nəşr olunmuş birinci cildindəki "XV-XVI əsrlər Azərbaycan ədəbiyyatı" bölməsində haqqında danışılan dövrdə Türkiyəyə getmiş şairlərimiz sırasında Gülşəninin də yalnız adını çəkmişdir.

Bunlardan başqa Səid Nəfisinin "Hicri X əsrə qədər İranda farsca nəzm və nəsr tarixi"ndə, Dehxudanın "Lüğətnamə"sində, Ağa Bozorg Tehraninin "əz-Zəri'ə" kimi tanınmış əsərində, Gibbin "Osmanlı poeziyası

tarixi"ndə, başqa neçə-neçə kitablarda Gülşənidən məlumatlara təsadüf edilir. Həmçinin şeyxi Dədə Ömər Rövşənidən, onun mürşidi Seyid Yəhya Bakuvidən danışılan demək olar ki, bütün mənbələrdə Gülşəninin adı ilə rastlaşırıq.

* * *

Şairlə bağlı mənbə və ədəbiyyatların müqayisəli öyrənilməsinin nəticəsitək həyat və yaradıcılığı haqqında qısaca olaraq aşağıdakıları demək mümkündür:

"Şeyx İbrahim bin Məhəmməd bin Hacı İbrahim bin Şihabəddin Bərdeyi Gülşəni təxəllüs" kimi təqdim olunan bu filosof-şair h.830 (1426-27)-cu ildə Bərdədə doğulmuşdur. Hələ uşaq ikən, təxminən 2 yaşında atasını itirmiş, əmisi Şeyx Əlinin himayəsində böyümüş, boya-başa çatmış, təhsil almışdır. Gəncliyində (F.Seyidov bu zaman onun 14-15 yaşı olduğunu yazır) Bərdədən Təbrizə getmiş, orada Seyid Yəhya Şirvaninin (Bakuvinin) dövründə şöhrəti bütün Azərbaycana yayılmış xəlifəsi Dədə Ömər Rövşəni ilə görüşmüşdür (Seyid Yəhya, Dədə Ömər və Gülşəni əsərlərinə eyni bir əlyazmada təsadüf etmək mümkündür).

Seyid Yəhya Azərbaycanın şəxsiyyət və yaradıcılığı ilə tanınmış filosof-alimi, şairidir. Şeirlərini "Seyyid" təxəllüsü ilə yazmışdır. Doğulduğu tarix məlum deyil, h.868 (1463-64)-ci ildə vəfat etmişdir, qəbri Bakıdadır, Qız qalası yanında Şirvanşahlar kompleksi içərisində "XV əsr sufi dərvişinin məzarı, Seyid Yəhya Bakuvinin türbəsi" adı ilə tarixi abidə kimi qorunur.

Seyid Yəhya Yusif Ziyaəddin Şirvani, Əbdülməcid Şirvani, Kəmaləddin Şirvani, Dədə Ömər Rövşəni tək tanınmış şəxsiyyətlərin müəllimi, şair-filosof kimi məşhurdur. Onun geniş və zəngin elmi-fəlsəfi yaradıcılığı vardır. Dünyanın müxtəlif əlyazma xəzinələri və kitabxanalarında əlyazmalarına həm toplu şəklində, həm də ayrı-ayrılıqda təsadüf olunur. Konya Mövlana Muzeyində "Kəşfül-qülub"u, İstanbulda isə "Mənazil-il əs-sabiqin", "Şərhi-məratibi-əsrari-qülub", "Ətvarül-qəlb", "Fi bəyanül-elm", "Şərhi-əsmmayi-səmaniyyə", "Şərhi-sualati-Gülşəni-raz", "Həft vadi" və s. əsərlərinin toplandığı, köçürücülərdən birinin "Cameül-məani" adlandırdığı "Külliyyat"ı əlyazmasının 3 nüsxəsinin varlığı məlumdur. Lakin bunlar onun əsərlərinin hamısı deyil. Seyid Yəhya əsərləri əlyazmaları bir yerə toplanmalı, ayrı-ayrılıqda, eləcə də külli halında öyrənilməli şəxsiyyəti yaradıcılığı əsasında geniş tədqiq olunmalıdır.



Seyid Yəhyanın tələbəsi və xələfi Dədə Ömər Rövşəni (1486-87) taleyini Azərbaycanla bağlayan şəxsiyyətlərdəndir. Yaradıcılığı Azərbaycan poeziyası tarixi ilə qırılmaz tellərlə bağlı olan Rövşəninin Seyid Yəhya Bakuvi, Gülşəni Bərdəi ilə ədəbi-məfkurəvi yaxınlığı, Qaraqoyunlular və Ağqoyunluların hakimiyyəti dövründə Gəncə, Bərdə, Bakı və Təbrizdə keçən həyat və yaradıcılıq yolu ötən əsrlərdən bəri ətraflı tədqiqini gözləyən məsələlərdən biri sayılmışdır.

Dədə Ömər Türkiyənin Aydın elində anadan olmuşdur. Öncə Aydında və Bursada təhsil almış, sonra Qaramana – böyük qardaşı Əlaəddinin yanına getmişdir. Hafiz Hüseyn Təbrizi bu iki qardaşdan danışarkən yazır: "Qardaşı Əlaəddin və Dədə Ömər Seyid Yəhyanın müridləri idilər, zahiri və batini elmləri bilirdilər... alim idilər". Qaramanda yaşadığı günlər dönüş nöqtəsi kimi Ömərin həyatının mənəvi istiqamətini müəyyənləşdirir. Qardaşı gələcəyinə inanaraq Rövşənini Bakıya – Seyid Yəhyanın yanına göndərir. Bu vaxtdan – gənc yaşlarından başlayaraq Rövşəni mənalı ömrünün qalan hissəsini Azərbaycanda yaşayıb-yaratmışdır. O, bütün yaradıcılığı boyu Seyid Yəhyanı – müqəddəs saydığı bu Şirvanlı şeyxi yad etmiş, ona həsr etdiyi şeirlərində özünün və məsləkdaş müasirlərinin müraciət etdiyi, tapındığı əvəzedilməz mənəvi hamisi kimi dəyərləndirmişdir.

Dünya əlyazma xəzinələri və kitabxanalarında Dədə Ömərin 45 əlyazması aşkar edilmişdir. Bunlardan ən qədimi şairin ölümündən 2-3 il əvvəl h.889 (1484-85)-cu ildə köçürülmüşdür, sonuncusu isə XX əsrdə (1937-ci ildən qabaq) ədəbiyyatşünas alimimiz Salman Mümtaz tərəfindən tərtib edilmiş cüngdədir. Əsərlərinə vaxtilə sufizm dərsliyi kimi istifadə olunmuş "Miskinlik kitabı", Mövlanadan yaradıcı tərcümə etdiyi "Neynamə", "Çobannamə" məsnəviləri, demək olar ki, bütün klassik şeir formalarını özündə cəmləşdirə bilmiş ənənəvi divanı daxildir.

Rövşəni Təbrizdə yaşayarkən Şahzadə Cəmin arzusu ilə 1481-ci ildə türklərin soylarına dair bilgilər verən "Cami-Cəm ayin" adlı tarixi əsərini yazan Hasan Bayati Mahmudoğlu kimi tələbələr yetişdirilmişdir. Lakin Təbrizdəki tələbələrinin ən məşhuru Gülşənidir və onun yaradıcılığına müəlliminin daha qüvvətli təsiri olmuşdur. Hər ikisinin yaradıcılıqlarının birgə, qarşılıqlı öyrənilməsi onların ədəbi-məfkurəvi yaxınlığının ciddi, dərin kökləri olduğunu göstərir. Təkcə, Mövlana Cəlaləddin Ruminin divanını Şəms Təbrizinin adına yazdığı kimi Gülşəninin də Rövşəninin adını az qala bütün şeirlərinin sonunda öz adı ilə qoşa çəkməsi bu fikrimizi bir daha təsdiq edə bilər. Gülşəni Əlyazmalar İnstitutundakı qədim bir cüngdə qorunub saxlanan şeirini bəlkə də ustadının ölümünə yazmışdır:

Bivücudəm, eşq odu bilməm bənim nə yandırur?!
Yanubən külli kül oldum, pəs dəxi nəm yandırur?!

Şəm'ə bir pərvanə düşsə, faş olur aləmlərə,
Məşuqun eşqi bəni gör necə əpsəm yandırur...

Yandırır gərçi cəhanda eşq odi aşiqləri,
Leyk bən zarü zəifi qamu möhkəm yandırur.

Ey cigər dərdinə dərman istəyən əqlin qanı?
Ögülürmi bir cigər kim onu dərman yandırur?

Rövşəni dərdilə yanmış bir cigərdir Gülşəni,
Eşq odu pərvanə nisbət anı hər dəm yandırur.

Rövşəni ilə görüş Gülşəninin gələcək həyatına daha geniş istiqamət vermiş, onun bir şeyx və şair kimi yetişməsinə, tanınmasına başlanğıc olmuşdur. O, könlü işıq Dədənin göstəriş və məsləhəti ilə əvvəlki təxəllüsü "Heybəti"ni "Gülşəni" ilə əvəz etmiş, şeyxinin ölümündən sonra onun xəlifəsi olmaq səlahiyyətini qazanmışdır. Bu haqda orta əsrlərdə yaşamış bir çox şəxsiyyətlər haqqında bilgilər verən "Silsilənameyi-əhli təriqət"də yazılmışdır.

Gülşəni çoxlu səyahətlərdə olmuş, uzun illər Türkiyədə, Misirdə yaşamış, bu yerlərin hər birində doğma övlad kimi sevilmişdir. Yavuz Sultan Səlim h.922 (1516)-ci ildə Misiri aldıqda bu müqəddəs adamla böyük hörmət və ehtiramla rəftar etmişdi. Gülşəni ustad-müəllim kimi məşhurlaşmış, islam dünyasının müxtəlif yerlərindən özünə ardıcıllar cəlb edə bilmiş, Misir məmləkətində böyük nüfuz sahibi olmuş, müridlərinin sayı gündən-günə daha da artmışdı, özü və müridləri pul toplayaraq xanəgah da tikdirmişdilər.

Sultan Süleyman şöhrətini eşidib h.935 (1528-29)-ci ildə onu öz yanına dəvət etmiş, böyük hörmət və ehtiramla qarşılamış, dolanacağını və yaşadığı yeri müəyyənləşdirmişdir. O zaman Gülşəninin yaşı yüzü adlamışdı. Şair İstanbulda bir neçə il yaşadıqdan sonra yenidən Misirə dönmüş, h.940 (1533/34)-cı ildə orada vəfat etmişdir.

Gülşəninin oğulları Məhəmməd Zə'fi (1543-44) Sultan Əmir Əhməd Xiyali (1485-1570), nəvəsi Əli Səfvəti (?-1594), onun oğlu (Gülşəninin nəticəsi) Məhəmməd Haləti Gülşəni (1552-1581) də şair olmuşlar. Onların əsərlərinin əlyazmaları dünya əlyazma xəzinələrində qorunub saxlanmaqdadır.



Əlyazmaların təsvir olunduğu kataloqlar geniş elmi ictimaiyyətə qiymətli əlyazmalar haqqında məlumat verən ilkin mənbə sayıla bilər. Bu baxımdan Gülşəni əlyazmalarının təsvir olunduğu "İstanbul kitabxanaları farsca mənzum əsərlər kataloqu", "Topqapı Sarayı Muzeyi fars əlyazmaları kataloqu", "İstanbul kitablıkları tarix-coğrafiya yazmaları kataloqu" və s. diqqəti çəkməkdədir. Bunlardan bəziləri yalnız şairin öz əsərləri deyil, həm də onun həyatı, təriqəti, xələf və sələfləri ilə bağlı bilgilər verən "Silsilənaməyi-əhli-təriqət" "Ləməzati-hilviyyə", "Əsamiyi-şüərayi-Amid" "Mənaqibi-Şeyx İbrahim Gülşəni" kimi əsərlərin təsviri ilə maraqlıdır. Gülşəninin öyrənilməsində sözsüz maraqlı ola biləcək Mühyinin "Mənaqibi-İbrahim Gülşəni" (İstanbul, Universitet kitabxanası TÜ. pc 1360), Hilvinin "Ləməzat"ı (İstanbul, Universitet kitabxanası. p.1894), Şəmləlizadənin "Şivəyi-təriqəti-Gülşəniyyə"si (Ankara, Millət kit. iç. 888), Salihin "Mənaqibi-övliyayi-Misir" (Bulaq, 1262), Şaraninin "ət-Təriqət"i (Misir, 1299) kimi bir sıra əlyazma və kitablar vardır ki, onları əldə etmək mümkün olmamışdır. "İstanbul kitabxanaları tarix-coğrafiya yazmaları"nda "Mənaqibi-Şeyx İbrahim Gülşəni"nin Millət və Süleymaniyyə kitabxanalarında üç nüsxəsi təsvir olunmuşdur. Əsərin müəllifi "elmiyyə" məsləkindən olan Əhməd Paşanın qardaşı Ədirnə qazısı Mehmed Mühyiddin əfəndidir. O, Misirdə Şeyx Əli Səfvəti əfəndiyə dərviş, xəlifə və damad olmuş, h.1014 (1606-06)-cü ildə vəfat etmişdir. Misirdə Gülşəni təkyəsində dəfn edilmişdir. Onun tərtibli divanı və "Osmanlı müəllifləri"ndə göstərildiyi kimi 20-dən artıq əsəri vardır ki, biri də haqqında danışılan əlyazmadır. Müqəddimə, bab və fəsil yerinə "Sai", "Təkəllüb", "Silahdar", "Rikabdar" ünvanlı qisimlərə ayrılan bu əsərin müqəddiməsi sayılan "Sai"sində kamil bir mürşid tapmaq lazım gəldiyindən, "Təkəllüb"də Gülşəninin doğulmasından, iki əsr öncə dünyaya gələcəyindən xəbər vermiş olan Mövlananın bu xəbərindən, şeyxin atası və cəddlərindən, çocuqluğundakı hallarından, Dədə Ömər Rövşəniyə dərvişliyindən, sülükünü tamamlayaraq xilafət almasından, İraqdan Ərəbistana gedib, Misirdə yerləşməsindən, İstanbula gəlib Qanuni ilə və bəzi şeyxlərlə, alimlərlə görüşməsindən, yenə Misirə dönüb ölməsindən və öldükdən sonrakı bəzi kəramətlərindən, "Silahdar" və "Rikabdar" qismlərində İbrahim Gülşəni zamanındakı sultanlardan və şeyxin Oğuz Ataya çatan silsiləsindən gəlmiş olan hökmdarlardan bəhs edilir.

Araşdırmalar Əhməd Hilminin "Misir Xidviyyə kitabxanası türkcə, farsca kitablar fehristi", Fəxri Rastkarın "Milli Şura məclisinin fehristi", Əhməd Münzəvinin "Fars əlyazmaları fehristi", Hanna Səhrveidin "Türk əlyazmaları", Ettori Rossinin "Vatikan Apostol kitabxanası türk əlyazmaları kataloqu", L.V.Dmitriyevnanın "Şərqşünaslıq institutu türk əlyazmalarının

təsviri" və sairədə Gülşəninin "Məsnəviyi-mə'nəvi", "Şərhi-mə'nəvi", "Əzhari-gülşən", "Pəndnamə", "Təfsiri-ayəyi-fatihə", farsca və türkcə divanlarını, məcmuələrdə, cünglərdə və bir sıra yazarların əlyazmalarında əsərlərini üzə çıxarmağa imkan vermişdir. Gülşənidən danışılan mənbələrin bəzisində onun "Simurğnamə", "Çobannamə", "Qədəmnamə", "Risalətül-ətvar" və İbn əl-Farizin Taiyyəsinə ərəbcə yazdığı cavab qəsidəsi kimi əsərlərinin olduğu göstərilir.

Biz Gülşəninin Misirin Xidiviyyə kitabxanasındakı "Divan" adı altında mühafizə edilən, əslində fikrimizcə onun Müəllim Naci əfəndinin "Əsami"də göstərdiyi kimi Mövlananın "Məsnəvi"sinə "peyrovilik yolunda yazdığı", "Məsnəviyi-mə'nəvi"sinin (bu ayrıca tədqiqat obyektidir), Berlin Ümumi kitabxanasında saxlanan "Pəndnamə"sinin, türk divanının Vatikan Apostol, Ankara Millət kitabxanalarındakı və Rusiya Federasiyası EA Şərqşünaslıq İnstitutunun Sankt-Peterburq bölməsindəki nüsxələrinin mikrofilmlərini (sonuncu həm də yerində tədqiq olunmuşdur) əldə etmiş, şairin Azərbaycan MEA Əlyazmalar İnstitutundakı B-1496 şifrəli cüngdə şeirini və "Əzhari-gülşən"inin naməlum əlyazmasını üzə çıxarmışıq. "Əzhari-gülşən" – "Gülşən çiçəkləri" Mahmud Şəbüstərinin (?-1320-21) "Gülşəni-raz"ı – "Sirlər gülşəni" vəznində və tərzində yazılmışdır. Münzəvi və Tehran Universiteti kataloqlarında bu əsər "Dürrətül-tac" kimi qeydə alınmışdır. Əlyazmanın 277b və 278a vərəqlərinə əsasən müəllifin adı ilə yanaşı yazılmış əsərin adı məhz "Əzhari-gülşən" kimidir. Ölçüsü 21x15 sm-dir, 306 vərəqlik məcmuənin 276a-308a vərəqlərini əhatə edir. Nəstə'liq xəttilə Avropa kağızına köçürülmüşdür. Paleoqrafik əlamətlərinə görə XVIII əsrə aid edilə bilər.

Şairlə bağlı xeyli mənbə və ədəbiyyatın mövcudluğuna baxmayaraq onun həyatı və yaradıcılığının özünün qoyub getdiyi zəngin irsə dayanılaraq layiqincə öyrənildiyini söyləmək olmaz. Sadalanan mənbələr və əldə edilmiş əlyazmalar şairin mürəkkəb və zəngin yaradıcılığından tam olmasa da fikir yürütməyə imkan vermiş, bu sətirlərin müəllifinə istiqamətverici olmuş və o, Gülşəni, onun əlyazma irsi ilə bağlı "Rövşəni və Gülşəni Bərdəi divanlarının naməlum birgə əlyazması", "Gülşəni Bərdəi", "Gülşəni Bərdəi yaradıcılığının qaynaqlarından biri", "İbrahim Bərdəi türk ədəbiyyatşünaslığında", "Gülşəni Bərdəi divanı əlyazmalarının transkripsiyası problemləri", "Şeyx İbrahim Gülşəni Bərdəi və onun əlyazması ilə bağlı bəzi qeydlər" kimi yazılar nəşr etdirə bilmişdir. "Dədə Ömər Rövşəni əlyazmaları üzərində araşdırmalar" və "Əlyazma kitabı və XV-XVI əsrlər Azərbaycan ədəbiyyatı: problemlər, araşdırmalar" adlı monoqrafiyalarımızda həmçinin Gülşəni Bərdəi ilə bağlı bir sıra məqamlara işıq çilənmişdir.



Oxuculara təqdim olunan bu kitab Gülşəninin Türk-Azərbaycan dilindəki divanının Sankt-Peterburq, Ankara və Vatikan əlyazmalarının transfoneliterasiyası və tekstoloji müqayisəsi nəticəsində hazırlanmışdır. Haqqında danışılan divanın dünya əlyazma xəzinələrində hələlik 7 nüsxəsini aşkarlamışıq. İstanbul Universiteti kitabxanasında T-890 şifrəsi altında saxlanan nüsxənin həcmi 257 vərəq, ölçüsü 15,8x10,9 sm, sətir sayı 15-dir. Mətni qalın və incə venesiya kağızına, tə'liq xəttilə yazılmışdır. Əlyazma yaxşı saxlanmış olsa da tərtibsizdir. Gülşəni divanı əlyazmasının bu nüsxəsinin mikrofilmini Azərbaycan MEA Əlyazmalar İnstitutunun mərhum direktoru, professor Cahangir Qəhrəmanov 1990-cı ilin mayında Türkiyəyə birinci Millətlərarası Böyük Azərbaycan konqresində iştirak etməyə gedərkən oradan gətirmişdi. Lakin divanın üç nüsxə əsasında çapa hazırlanmış transfoneliterasiyasına bir sıra səbəblər üzündən yenidən müdaxilə etmək mümkün olmamışdır. Ondan Bərdəi şeirlərinin elmi-tənqidi mətni hazırlanırkən istifadə edilməsi nəzərdə tutulmuşdur.

Sankt-Peterburq nüsxəsi Gülşəni divanının keçmiş Sovetlər İttifaqı ərazisində yeganə məlum əlyazmasıdır. Bu əlyazma haqqında L.V.Dmitriyeva ilk dəfə 1980-ci ildə nəşr olunmuş "Şərqşünaslıq İnstitutu türk əlyazmalarının təsviri" kataloqunda məlumat vermişdir. Kataloqda Rusiya Federasiyası EA Şərqşünaslıq İnstitutunun Sankt-Peterburqdakı Əlyazmalar bölməsində B-1206 şifri altında mühafizə edilən bu əlyazmanın bütövlükdə Gülşəni divanı kimi təqdim edilməsinə baxmayaraq, onun Rövşəni və Gülşəni divanlarının naməlum birgə əlyazması olduğu bu sətirlərin müəllifi tərəfindən lazımi dəlillərlə sübuta yetirilmişdir. Mətnşünaslıq tarixində iki yerə ayrılmış bir əlyazmanın iki, bir əlyazmada birləşdirilmiş iki əsərin bir əsər kimi təqdim edilməsi təsadüfləri az olmamışdır. Eyni zamanda yaradıcılıqları, mənəvi dünyaları bir-birinə yaxın sayılan neçə-neçə sənətkarın əsərlərinin bir əlyazmada birləşdirilərək daha da doğmalaşdırıldığı faktları da mövcuddur.

Əlyazmanın frontispis yerində "Həzə divani-Gülşəni" ("Bu Gülşəni divanıdır") yazılmasına baxmayaraq, o müəllim və tələbənin birgə əlyazmasıdır. Başlıq isə sonradan başqa birisi tərəfindən əlavə olunmuşdur. Belə ki, az qala hər səhifəsində Rövşəninin adı yazılmış birinci divanı da katib özü yalnız Gülşəni divanı kimi məntiqi olaraq təqdim edə bilməzdi. Rövşəni divanının əlimizdəki başqa 6 nüsxəsi ilə müqayisə apararaq haqqında danışılan əlyazmanın 1b-125b vərəqlərindəki əsərlərin məhz onun olduğu aydınlaşdırıldı. Ümumi həcmi 148 vərəq olan əlyazmanın 126a-148b vərəqlərində isə Gülşəni divanıdır. Cildi üzərinə dəri çəkilmiş kartondur, ölçüsü 13x19 sm-dir. Başdan-başa rüq'ə xətti ilə başlıqları

qırmızı, mətni qara mürəkkəblə rəngli Şərq kağızına köçürülmüşdür. Divan tam deyil, 135-136a vərəqləri arasında çatışmazlıq vardır. Burada Gülşəni Bərdəinin ənənəvi divan quruluşunda 69 qəzəl və qəsidəsi yazılmışdır. Əlyazmanın birinci hissəsinin sonundakı qeyddə onun Əmir Əhmədin ayağının torpağı, bəndəsi Mahmud tərəfindən Qustənteniyyədə (İstanbulda) köçürüldüyü yazılmışdır. Araşdırmalar göstərir ki, Əmir Əhməd İbrahim Gülşəninin "Xəyali" təxəllüsü ilə şeirlər yazan oğludur. O, 1485-ci ildə Təbrizdə doğulmuşdur. Qaynaqlarda Rövşəninin "Bu körpə olduqca əcəb xub olacaqdır" misrası ilə başlayan qəzəlini ona ithaf etdiyi göstərilir. Atasının ölümündən sonra Əmir Əhməd "Xəlvəti" təriqətinin xəlifəsi olmuşdur. Bu haqda "Silsilənaməyi-əhli-təriqət"də də işarə vardır. Xəyali 1569-70-ci illərdə ölmüşdür. Bu tarix bizə əlyazmanın L.V.Dmitriyevanın yazdığı kimi (əsaslandırılmadan) təkcə 1831-ci ildən gec olmayaraq" deyil, XVI əsrdə, bəlkə 1570-ci ildən qabaq köçürüldüyünü söyləməyə imkan verirsə də katib qeydindən kənarda, eyni xəttlə xüsusi üslubda yazılmış "zilhəccə, 1023-cü il" qeydi onun 1614-cü ilin sonlarında başa çatdırıldığını göstərir. 148b vərəqində köçürücünün belə bir qeydi də vardır: "Bu kitabı yazdırana həq təalə rəsulullahın pak, münəvvər, mütəhhir ruhiçün neçə yıllar ömrlər verdiqdən sonra cənnət müyəssər eyləyə. Amin ya Rəbbül-aləmin".

Başlanır: Ey məhəbbətdən təcəlla eyləyən eynül-bəqa.

Ankara Millət kitabxanası nüsxəsi "İstanbul kitablıqları yazma divanlar kataloqu"nun birinci cildində təsvir edilmişdir. Göstərilən kitabxanada Ali Əmiri əfəndi (mənzum əsərlər) 379 şifri altında mühafizə olunan əlyazmanın köçürüldüyü tarix məlum deyil. 154 səhifəlik nüsxənin ölçüsü 19,8x13,2, mətn ölçüsü 13,9x9,4 sm-dir. Hərəkəli nəsxlə hər səhifədə 13 sətir yazılmışdır. Kağızı ahərli, cildi meşindir. Birinci vərəqində Ali Əmiri əfəndinin vəqf möhürü basılmış, son vərəqində bir dairə kənarında "Kəlimeyi-tovhid" və bəzi adlar yazılıdır. Nüsxədə 178 şeir vardır.

Başlanır: Ey məhəbbətdən təcəlla eyləyən eynül-bəqa.

Vatikan Apostol kitabxanasının nüsxəsindən Ettori Rossi "Vatikan Apostol kitabxanası əlyazmalar kataloqu"nda qısa məlumat vermişdir. H.XII (XVIII) əsrdə köçürülmüş Vat. Turco 216 şifrli əlyazma iki müxtəlif xəttlə, hər səhifədə 13 sətir (iki sütun) yazılmışdır. Həcmi 148 vərəqdir, ölçüsü 20,2x15 sm-dir. Şərq üslubunda dəri və karton cildi vardır. Ənənəvi divan quruluşunda deyil. Bu nüsxədə 277 şeir vardır.

Başlanır: Aşiqə tə'n eyləyən əql ilə divanədir.

Birinci əlyazma çətin oxunsa da, divandan seçmələr təsiri bağışlasa da qədimdir və ənənəvi divan quruluşunu saxlamışdır. Digər iki nüsxənin, xüsusilə Apostol kitabxanası nüsxəsinin tərtibində ənənənin qorunması, tərtibsizlik istifadəni olduqca mürəkkəbləşdirmişdir. Hər üç divanın müqayisəli öyrənilməsi və hal-hazırkı şəkildə hazırlanıb, oxuculara təqdim olunmasında bu baxımdan bir sıra çətinliklər olmuşdur. Bununla belə göründüyü kimi, illərdən bəri çəkilmiş zəhmət bəhrəsiz qalmamışdır. Son söz isə şübhəsiz ki, oxucularındır.



Kitaba yuxarıda anılan hər üç əlyazmadakı bir neçəsi istisna olunmaqla bütün şeirlər daxil edilmişdir. Şeirlərin hər üç nüsxədə olanları azlıq təşkil etməkdədir. Bəziləri iki nüsxədə vardır. Əksəriyyəti isə yalnız bir nüsxədədir. Beləliklə, şeirlərin bir sistemə salınıb tərtib edilməsi zərurətinə nüsxələrdəki müvafiq olaraq 69, 178, 277 və kitaba salınmış 408 sayı əsas vermişdir. Tərtib etdiyimiz kitaba salınmış şeirlərdən bir neçəsi formaca eyni şeirin variantları sayıla bilər. Hətta ilk beytləri, misraları eyni və ya bənzər olanları da vardır: "Aşiqə tə'n eyləyən əql ilə divanədür", "Eşqün bəni şuridə qılub gör nələr eylər", "Bana sənsiz cihan, ey can, gərəkməz", "Dust elinə gedirəm, gəlməmisən, ey könül", "Bana dərdün gərək, dərman gərəkməz", "Nedüm eşqün əlindən bilməzəm" və s. kimi. Bunlardan eyni əlyazmada olanlar da vardır. Bizcə bu, Gülşəninin eyni misra ilə başlayan bir və ya bir neçə müxtəlif şeir yazma üslubunun da olduğunu göstərir.

* * *

Orta əsrlər klassik poeziyasının transfoneliterasiyası ilə bağlı bir sıra həll edilməmiş problemlərimiz mövcuddur. Dövrün maraqlı çağı sayılan XV-XVI yüzilliklər nümunəsi olan Gülşəni divanının transfoneliterasiyası zamanı qarşıya çıxan, həllinə təşəbbüs göstərdiyimiz bəzi məsələlərdən nəşrə təqdim edilmiş bu kitabın əvvəlində danışmaq bizcə yerinə düşər.

Dil və yazı – iki tamamilə müxtəlif təzahürlərdir. Yazı nə qədər qüdrətli olsa da canlı səsləri dəqiqliklə verə bilmir. Ərəb əlifbası Azərbaycan xalqı ilə eyni dil qrupuna mənsub olmayan bir xalqın əlifbasıdır və öz abidələrimizi transfoneliterasiya edəndə qarşıya çıxan çətinliklər labüddür. Klassik mətnlərin praktik transfoneliterasiyası problemi öz mürəkkəbliyi və çox aspektliyi ilə məhz buna görə belə çətinliklərlə bizi üz-üzə qoyur.

Gülşəni şeirlərinin transfoneliterasiyası zamanı hər sözün çevrilməmişdən qabaqkı fonetik zahiri görünüşü və dilimizin ənənələri qorunmuşdur. Mətndə ərəb yazısında konsonantizmin güclü olması nəticəsində az-az hallarda hərəkələrdən istifadə edilmişdir. Hərəkə olmadıqda

hecaların sait səsləri düşünülmüş, mətnə uyğunu seçilib yazılmışdır. Bu eyni oxunuşlu müxtəlif mənalı sözlərin transfoneliterasiyası zamanı çətinlik törətmişdir.

Mətn boyunca alınma sözlərin əvvəlində yazılan "ğəyn" hərfinin "q" və "ğ", dilimizə xas olmayan diftonqların, məsələn "ou"-nun bir çox hallarda "ov" ouc-ovc (yüksəklik, yüksək nöqtə) rouşən-rövşən (işıq, işıqlı), "و" bağlayıcısının yerinə görə həm "və", həm "vü", həm də "u", "ü" kimi transfoneliterasiya edilməsi qərarlaşdırılmışdır. Əlyazmada "həmzə" işarəsi sözlərin ortasında və axırında səsin bir növ dayandırılmasını bildirir. "Əyn" hərfinə oxşar bir vəzifə daşısa da, bu ərəb dilindən alınmış bəzi sözlərdə işlənir, lakin yazıda "əyn"i əvəz edə bilmir, transfoneliterasiyada əksini tapmır. Səssiz hərflər üzərinə qoyulmuş "sükun" özündən sonra sait səs gələ bilməyəcəyini, iki samit səsin ardıcıl gələ biləcəyini göstərir. Azərbaycan dilinə məxsus sözlərin hər birində transfoneliterasiya zamanı ikidən artıq samit yanaşı düşmür. Təşdiddən lazım olub-olmamasından asılı olmayaraq mənanın dəqiq aydınlığı bilinən yerlərdə mümkün qədər az istifadə edilmiş, bununla tələffüz sadələşdirilmiş, kökünə yaxınlaşdırılmış və bir növ milliləşdirilmişdir.

Alınma sözlərin praktik transfoneliterasiyası fonologiya ilə bağlıdır. Onların yazılışı transfoneliterasiya olunduqları dilin orfoqrafiyasına elə uyğunlaşdırılmışdır ki, haqqında danışılan sözlər dilimizin sözlərinə çevrilmişlər. Bu da qarşıya bir çox tələblər qoymuşdur. Onlar dilimizin spesifik fonetik, orfoepik, aksentoloji, morfoloji, sintaktik xarakteristikasını qəbul etmiş, dilin normalaşdırılması, sistemə salınması, üslubiyyatı və nəhayət, nitq mədəniyyəti ilə məşğul olan mütəxəssislərin tədqiqat obyektinə çevrilə bilmişdir.

Klassik mətnlərin transfoneliterasiyası zamanı "sağır nun"un yenidən bərpa olunmasının vacibliyi qarşıda bir problem olaraq qalmaqdadır. Ərəb qrafikalı yazıda "kaf" və "sağır nun"un yazılışının fərqli olmadığı mətnlərdə oxunuş çətinləşdiyi halda transfoneliterasiyada dəqiqlikdən uzaqlaşmamağa səy edilmişdir. Alınma sözlərin ortasında "eyn" hərfi yazıldıqda özündən əvvəl gələn səsli bir qədər uzun tələffüz olunur, sözlərin axırında isə ondan əvvəl gələn səsli vurğu tələb edir. Səslilərdən sonra gələn "eyn" səsin bir növ kəsildiyini bildirir. Belə hallarda mətnin transfoneliterasiyasında apostrof işarəsi saxlanmışdır, əks halda mətndə sözlərin çalarları aydınlığını itirə bilərdi (bə'd – sonra; bəd – pis və s.).

Klassik dövr poeziya və nəsr abidələrinin transfoneliterasiyası zamanı bir sıra fərqli cəhətlər ortaya çıxır ki, bu, Gülşəniyə də aiddir. Türk dillərinin dəmir qanunu sayılan ahəng qanunu poeziya nümunələrində bir



sıra hallarda pozula bilir. Transfoneliterasiya zamanı şeirlərin ahəngi, vəzni, bəhri, ölçüsü, janrı, xüsusilə qafiyəsinin əsas götürülməsi lazım gəlmişdir ki, bu da yuxarıda göstərilən fərqi yaratmış, poetik ahəngi qorumuşdur.

Ənənəvi quruluşda – ərəb hərflərinə görə tərtib edilmiş divanın transfoneliterasiyası zamanı əlyazmalardakı əvvəlki ardıcıllıq qorunmuşdur. Nüsxələrdəki sözlərdə x||q, b||p, d||t paralelləri əksər halda mətn haqqında aydın təsəvvür yaranması xətrinə saxlanmışdır. Mətnə yalnız məntiqi ardıcıllıq, fikir bitkinliyi, poetik ahəng pozularkən müdaxilə zərurəti yaranmışdır. Əlavələr bəzən belə məqamlarda edilmişdir və transfoneliterasiya [......] şəklində verilmişdir. Transfoneliterasiya zamanı müəllifin şəxsiyyəti, yaradıcılıq üslubu, dünyagörüşü, tutduğu mövqe, əsərlərinin məzmunu, mövzusu, süjeti, mənasının ümumi məntiqi uyarlığı öyrənilmiş və əsas meyartək götürülmüşdür. Bizə gəlib çatmış transfoneliterasiya edilən hər bir yazılı abidə kimi Gülşəni əsərlərinə də dilimizin tarixi inkişafında bir dövrü, onun başqa dillərlə əlaqəsi və zənginləşməsi dövrünü özündə əks etdirən maraqlı linqvistik və sosiolinqvistik faktları üzə çıxarmağa kömək edəcək bir mənbə kimi baxılmışdır.

* * *

Gülşəni Bərdəinin klassik Şərq ədəbiyyatına, xalq yaradıcılığına, folklora bağlılığını, özünəməxsus üslubu olduğunu Divanına daxil edilmiş şeirləri aydın göstərməkdədir. Şair məşhur "Xəlvətiyyə" sufi təriqətinin "Gülşəniyyə" qolunun qurucusu-şeyxi olduğundan yaradıcılığında təriqətlə bağlı şeirlər vardır. Yaradıcılığının məzmunu ardıcıl nəzərdən keçirilərkən filosof-şair kimi onun sufizmin mütərəqqi qoluna mənsub olduğu duyulur. Şeirlərində sufiyə müraciətlərinə, onun kimliyi, necəliyi ilə bağlı fikirlərinə də təsadüf olunur:

Zikri çox edüb, az yeyübən, az uyu, sufi,
Divün bilürəm, çünki bularsuz mələk olmaz.

*(Millət kit. nüsxəsi, 27)*

Lakin ümumiyyətlə götürüldükdə Bərdəi əsərlərində həyati, dünyəvi meyllər, torpağa bağlılıq, bəşəri düşüncə, sevilmək arzusu ilə çırpınan qəlbinin döyüntüləri, eləcə də sənətkarlıqla əks etdirdiyi fəlsəfi fikirlərin çulğalanmış tərənnümü geniş yer tutmaqdadır. Gülşəni şeirləri eşq, məhəbbət, sədaqət, dostluq haqqında ilahi himnlərdir:

Nədür eşqindən özgə canım, ey dust,
Odur can ilə çün cananım, ey dust.

(*Sankt-Peterburq nüsxəsi, 29a*)

Eşq (ilahi və dünyəvi eşq) onun yalnız şeirlərinin deyil, beyt və misralarının da canı, nüvəsidir və sanki həyatı eşqsiz təsəvvür edə bilmir. Bu baxımdan Divanını "Eşqnamə" belə adlandırmaq olar. Bir çox halda isə eşqi elmlə müqayisə edir, qarşılaşdırır, onların yaxın, uzaq və təzadlı cəhətlərinə münasibətini bildirir:

...Qaçub qurtulamadım eşq əlindən,
Biləmcə görürəm hər yerə getdüm.

(*Sankt-Peterburq nüsxəsi, 131*)

...Bana eşqün təriqin nədür, deyüb, soran gəlsün,
Ayax qoyanda ol yola başı ləzgin uran gəlsün.

(*Vatikan nüsxəsi, 93b*)

...Yükənməz dərdi var eşqün, nəhayət yox bəlasinə,
İnanmazsan, anun sorgil bəlasın mübtəlasinə.

(*Vatikan nüsxəsi, 93b*)

...Həqayiq mə'dəninin kanıdır eşq,
Ğərəzsiz cövhərün dükkanıdır eşq.
Məhəbbət dənizin mövcə gətürən
Təcəlli feyzinin ümmanıdır eşq.

(*Sankt-Peterburq nüsxəsi, 147b*)

...Eşqün bəni şuridə qılub gör nələr eylər,
Sevdayi sifət, əqlüm alub bixəbər eylər.

(*Millət kit. nüsx.15*)

...Könül eşqün əlindən parə-parə
Olupdur, bulamazam ana çarə.

(*Millət, 63-64*)

...Eşq ilə bilişəli, əqlümə yad olmuşam,
Ğəm yer ikən əql ilə, eşq ilə şad olmuşam.

(*Vatikan, 19a*)



...Hər nəfəs bir elmə məzhər an ilə şan olmuşam,
Mərifətdən ana görə eyni irfan olmuşam.

(*Vatikan, 84b*)

...Elmini eyn etməyən, eynini həqq əl-yə'qin,
Bilmiyisər şəksüzin elm ilə irfan nədür?

(*Vatikan, 114b*)

Əsərlərindəki lirik qəhrəman və onun idealı olan, zahiri təsvirinə, əlamətlərinə görə türk gözəli sevgilisi təbiilik, həyatilik, səmimiyyət, sədaqət, paklıq rəmzi kimi maraq doğurur, şair özünü həyatının mənası olan bu gözəlsiz təsəvvür edə bilmir:

...Bir türki-şuxü şəngin getməz həvasi başdan
Sevdayə düşəli dil ondağı gözü qaşdan.

(*Millət, 102*)

...Kim gördü mələk yüzlü pəri cinsi-bəşərdən,
Bir sənciləyin ruhi-rəvan əhli-bəsərdən.
Aydan dəxi aydın görürəm yüzini, ey məh,
Mehrin günəşi doğduğu dəm eyni-səhərdən.

(*Millət, 89*)

...Eşqə düşüb şövq ilə yanduğumi danlamın,
Könlüm alan bənə çün qılsa nəzər yanaram.

(*Vatikan, 25a*)

...Görəli gül üzarimi, salub namusi arumi,
Gecə-gündüzdə zarumi nedim, den, bilməzəm nedim?

(*Vatikan, 59b*)

...Kükərüb sevdügine düşdügi dəm
Qararub gözüm özüm biləməzəm.
İtirib könlümi dilbər kuyində
Dilüm bağlanubəni soramazam.

(*Millət, 48*)

Gülşəninin nəzərində kamil insan sadə (Sadədil olanı pir candan sevər), riyadan uzaq (Riyayilən qılanun həqqə taət, əlində təsbihi zünnarə

bənzər), bilgin, xəbərdar (Mütləq biziz azad edən qeydi-cəhandan canımız, Çün qurtarur andan bizi könüldəki irfanımız), qəlbə dəyməyən (Daş atma saxın qəsd edübən dil şişəsinə, Bin şişə sınar dildən əgər bir şişə sınə), bütün millətləri bir gözdə görməyi bacaran, milli, irqi ayrıseçkiliyə yad (Yetmiş iki millətün bir dili var söylərəm), elmli (elm ilədir eyni-həqq şəksüz imanum bənüm), xeyirxah, hiylədən uzaq (Qol qaldıruban urma yetən boynuna yumrux, Xeyr əhli əli çünki bəşərdən kütək olmaz. ...Hiylə qılubən tülkü kimi aldama xəlqi, Çün kərkəsi-nəfsün anun ilə tülək olmaz) və ərən olmalıdır. Ərənlərə neçə-neçə şeir də həsr etmişdir:

Gerçək həqqi sevər isən, gəl könül ver ərənlərə,
Həqqi bilmək uyur isən, gəl könül ver ərənlərə.
...Düş yoluna ərənlərin, doğru yola girənlərin,
Bil neydügini anların, gəl könül ver ərənlərə.
...Ey Gülşəni, eynül-yəqin görmək dilərsən ər güzin
Açmaq içün mə'ni yüzin, gəl könül ver ərənlərə.

(*Vatikan, 62b*)

İbrahim Bərdədə doğulub, Təbrizdə təhsil alıb-oxumuş olsa da zamanının ictimai-siyasi vəziyyəti onu vətənindən didərgin salmış, yaradıcılığına xələl gətirməsə də ona yeni bir mövzu "qürbət, qəriblik" mövzusu əlavə etmişdir:

...Bən bu elə qərib gəldim, kimsə bilməz halum bənüm,

(*Millət, 48*)

...Düşüb qürbətdə avarə olub, tərki-diyar etdüm,
Bu dərdimdən anun içün ölümüm ixtiyar etdüm.
Gəzər biçarə sərgərdan bənüm kimi görəməzəm,
Fələkdən özgə dövr ilə anunçun banə yar etdüm.

(*Vatikan, 17a*)

Şeirlərində tarixi, tarixi-əfsanəvi Çin, Şam, Darüssəlam, İrəm, Rey kimi yer adlarıyla yanaşı özünün gəzib-dolaşdığı Misir, Rum, Türkiyə, Aydın eli və s. rast gəlmək olur:

...Misirdir məskəni mavi durağum,
Anunçun qılmışam anı yatağum.



Biləməzəm nə yüzdən eşidürəm,
Misirdən çıxmadan Rumdan sorağum.
Nedim taliblərün Rum ilə Şamda
Tolar güllər dəmasından qulağum.

(*Vatikan, 2b*)

...Düşüb Aydın eli yolunə candan
Dilərəm qurtulam tirə vətəndən.

(*Vatikan, 2b*)

Gülşəni klassik Şərq ədəbiyyatında məhəbbət, sədaqət, saflıq, müqəddəslik, gözəllik, səbir, dözüm, güc və s. rəmzi olan Leyli, Məcnun, Yusif, Züleyxa, Xosrov, Şirin, Fərhad, Əyyub, Rüstəm kimi tanınmışlarla yanaşı ən çox Həllac Mansurun adını özünə yaxın bilir. Əgər Mənsur "ənəl-həqq" ("mən həqqəm") söyləmişsə, İbrahim "ənəl-eşq" ("mən eşqəm") deyir:

...Mənsurə dönüb mehr ilə dərəm ənəl-eşq,
Çün qeyrət ilən asmaq içün darumi buldum.

(*Vatikan, 77a*)

...Mənsur ənəl-həqq dedigin eşidəli bəs sözüni
Deyüb ənəl-eşqi rəvan leys fi əd-dar olmuşam.

(*Vatikan, 31a*)

Divanda eşq, məhəbbət, dostluq, insanlıqla bağlı şeirlərlə yanaşı təbiət təsvirlərinə də rast gəlmək olur. Yazın tərənnüm olunduğu gözəl təbiət lövhəsi təsiri bağışlayan aşağıdakı şeirdə belə Allaha, yaradana, insana, onun varlığına, əhvali-ruhiyyəsinə, həyatına bağlılıq duyulur:

Qış gedib, aləm gülüstan oldu yenə,
Dövri-bülbül gəldi, zağun rövnəqi xar oldi yenə.

Açılubən yer dutdi güli-günəş sifət,
Qızarubən kuhü səhra laləzar oldi yenə.

Göyübən ziynətlü xəl'ət zali-dünya yenidən,
Nov ərusə dönübən nəqşü nigar oldi yenə.

Gül kimi nərgis əlindən camini sunar müdam,
Baxub ol sərxoş liqadən göz xumar oldi yenə.

...Görsədəli suzi-dildən lalə dağın aşiqə
Göndərüb aşiq rəvanın daği nar oldi yenə.

(*Vatikan, 37b-38a*)

Şairin yaradıcılığı ilə bağlı deyilmişlərə onun Şərq ədəbiyyatının, xüsusilə, türkdilli ədəbiyyatın Yunus İmrə (1238-1320), Qazi Bürhanəddin (1344-1398), Nəsimitək (1370-1417) klassiklərindən daha artıq bəhrələndiyi də əlavə edilməlidir. Gülşəninin Yunus İmrə və Nəsimi şeirləri ilə forma, məzmun, ideya bağlılıqlarını daha qabarıq göstərə biləcək örnəklərdən bir sırasını burada verməyi lazım bildik:

Yunus İmrə

Eşqin aldı bəndən bəni, bana səni gərək, səni,
Bən yanaram düni güni, bana səni gərək, səni.
Nə varlığa sevinirəm, nə yoqlığa darılıram,
Eşqin ilə avunuram, bana səni gərək, səni.

(*Yunus İmrə, Divan, İstanbul, 1298, s.169-170*)

Gülşəni

Zikrim budur, ya Rəbb, həman bana səni gərək, səni,
Fikrim kibi, ey müstəan, bana səni gərək, səni.
Tərk edübən canü cəhan sənin içün, ey cani-can,
Zikr edübən verdim aman, bana səni gərək səni.

(*Vatikan, 65a-66a*)

Nəsimi

Ey nuri-dilü didə, didarınə müştaqəm,
Vey yari-pəsəndidə, didarınə müştaqəm.
Ey mahi-pəripeykər, vey huri-mələkmənzər,
Vey lə'li-ləbi şəkkər, didarınə müştaqəm.

(*Nəsimi, Seçilmiş əsərlər, B., 1973, s.138*)

Gülşəni

Ey hüsn elinün şahi, didarünə müştaqəm,
Ey hər gözəlün mahi, didarünə müştaqəm.
Ey şahidi-xoşmənzər, şirin dodağun kövsər,
Ey xub olana sərvər, didarınə müştaqəm.

(*Millət, 50,51*)



Nəsimi

Məndə sığar iki cəhan, mən bu cəhanə sığmazam,
Gövhəri-laməkan mənəm, kövnü məkanə sığmazam.
Ərşlə fərşü kafü nun məndə bulundu cümlə çün,
Kəs sözivü və əbsəm ol, şərhi bəyanə sığmazam.

(*Nəsimi, 319*)

Gülşəni

Halumə dut qulaği çün qali-lisanə sığmazam,
Sorma bu dəmdə kim bəni nitqü bəyanə sığmazam.
Qüdrəti həqqi-hikmətin bəndə sığar, vəli nedim,
Qüdrətinə dönüb həqün kövnü məkanə sığmazam.

(*Vatikan, 24a-b*)

Nəsimi

Könlümün viranəsində gənci-pünhan bulmuşam,
Olmuşam ol mahə qurban, yüz dilü can bulmuşam.
Eşq dərdindən qaçan könlüm usana, çünki mən
Dilbərin dərdində hər dəm bunca dərman bulmuşam.

(*Nəsimi, 146*)

Gülşəni

Gün kimi rövşən cəmalun mahi-taban bulmuşam,
Görəli xədd ilə xalun küfrü iman bulmuşam.
Olalı zahir cəmalun, ey mələk yüzlü bəşər,
Əhsəni-təqvimə məzhər, lövhi-Qur'an bulmuşam.

(*Vatikan, 27b-28a*)

Nəsimi

Mana sənsiz cahanü can gərəkməz,
Vüsalın var ikən hicran gərəkməz.
Ləbi-lə'lin zülal abindən ayru,
Şərabi-çeşməyi-heyvan gərəkməz.

(*Nəsimi, 70*)

Gülşəni

Bana sənsiz cəhan, ey can, gərəkməz,
Gecə-gündüz gəzən dövran gərəkməz.

Ləbündən kövsər içən dirilüb der:
– Xızır kimi bana heyran gərəkməz.

(*Millət, 23-24*)

Gülşəni bir şəxsiyyət tək Rövşəninin yetirməsi olduğu kimi şair tək də onun arxadaşıdır. Dədə Ömər poeziyası Gülşəni yaradıcılığının əsas qaynağıdır. Yuxarıda qeyd etdiyimiz kimi Mövlana özünün məşhur "Divani-kəbir"ini ustadı Şəms Təbrizinin adına yazdığı kimi Gülşəni də divanındakı şeirlərin, demək olar ki, hamısında müəllimi Rövşəninin adını öz adı ilə qoşa çəkmişdir:

...Rövşəni pərvərdəsidir Gülşəni, anun içün
Gün kimi rövşən görünür aləmə ondan ziya.

(*Sankt-Peterburq, 128a*)

...Bilindi Gülşəninin Rövşənilə
Əzəldən əhd ilə peymanıdır eşq.

(*Sankt-Peterburq, 148a*)

...Ey Rövşənidən gün kimi rövşən göz açan, Gülşəni,
Bilür ol aydın bəsərdən baxmışam didarə bən.

(*Vatikan, 34a*)

Gülşəni Rövşəninin təkcə adını anmaqla kifayətlənməmiş, onun bəzi misra və beytlərini olduğu kimi şeirlərinə gətirmişdir: "Artı ey dil, könül evini candan, Çü dilbər girübən arayasıdır" beyti kimi. Onu da qeyd edək ki, Gülşəni yalnız beytin ikinci misrasındakı "ki"-ni "çü" ilə əvəz etmişdir. Bəlkə də bu katibin işidir. Rövşəniyə şeirlər həsr etmiş, qəzəllərinə nəzirələr yazmışdır. İki şairin yaradıcılığının birgə, qarşılıqlı öyrənilməsi onların ədəbi-məfkurəvi yaxınlığının ciddi, dərin kökləri olduğunu bir daha göstərir. Gülşəninin Rövşəninin "Olmaz" rədifli qəzəlinə yazdığı cavab şeiri bu iki sənətkarın yaradıcılıq ideyalarının sıx bağlılığına ən gözəl nümunədir. Gülşəni hətta ara-sıra Rövşəni qəzəllərinin qafiyələrindən istifadə edib, yeni qəzəl də yazmışdır: pirayəsidir, vayəsidir, sayəsidir, sərmayəsidir, arayasidir, oxşayasıdır, dayəsidir, yayəsidir, həmsayəsidir və s. Bu qəzəllərdə fikri ifadə formasındakı yaxınlığı onların maraqlı cəhətlərindən biri kimi göstərmək olar. Könülə müraciətlə yazdığı qəzəli də Rövşəninin "Könül" müxəmməsi ilə səsləşir. Gülşəni və Rövşəni şeirlərindən bir nümunə dediklərimizi bir daha əyani olaraq göstərə bilər:



### Rövşəni

Gəl-gəl ki, gülüstanda həman bir sənü bir mən,
Seyr edəlim, ey sərvi-rəvan, bir sənü bir mən.

Bülbül ününə guşeyi-gülşəndə tutub guş,
Dinləyəlim, ey ğönçə dəhən, bir sənü bir mən.

Yeyüb-içəlim nöqlü meyü sərxoş olalım,
İlla ki, əya cani-cəhan, bir sənü bir mən.

Bən sənə deyim, padşahım, sən bənə bəndəm,
Xoş söyləşəlim dürlü zəban bir sənü bir mən.

Gəl oynayalım sarmaşı-dolaşı çəməndə
Gəh salınub, ey sərvi-rəvan, bir sənü bir mən.

Gəl gəşt edərək avlayalım ördəkü kəklik,
Könləkçək olub əldə toğan bir sənü bir mən.

Mən Rövşəniyəm eşq ilə, sən hüsn ilə rövşən,
Eyş eyləsəvüz nola həman bir sənü bir mən.

(*Rövşəni. Divan, 120a*)

### Gülşəni

Gəl bağə girüb seyr edəlüm bir sənü bir mən,
Gül kimi ələ cam alalum bir sənü bir mən.

Dövr ilə içüp cami ləbaləb, qılalum zövq,
Saqi ləbi kimi soralum bir sənü bir mən.

Xəlvət qılubən gülşəni-hüsnün həvəsini
Həmdəm olubən cam içəlüm bir sənü bir mən.

Gül çağıdır, ey sərvi-səhi, gülşənə meyl et,
Ta seyr edüp anda verəlüm bir sənü bir mən.

Yüzüni görən qiblə kimi der bana səcdə,
Bu vəchə nəzər gəl qılalum bir sənü bir mən.

Ney kibi nəva qılubənü inləsə aşiq
Dəf kimi yüzinə çalalum bir sənü bir mən.

Sirrini desəm Rövşəninün Gülşəniyə, der
Candan ondan məxfi biləlüm bir sənü bir mən.

(*Millət, 53-54*)

Gülşəni irsi araşdırılarkən qabarıq nəzərə çarpan cəhətlərdən biri də dilinin zənginliyi, sadə olduğu qədər, həm də mürəkkəbliyidir. Xalqa, onun yaradıcılığına, dilinə bağlılığına örnək olacaq şeirləri o qədər şirin və cazibəlidir ki, onlara heyran olmamaq mümkün deyildir:

Qapub əqlümi başumdən, qomadi bilgu huşimdən,
Soraram yad-bilüşimdən, gedər derlər, gedər derlər.

Nə sevdadır deyniz bana, eşidüb qalmanuz tana,
Könül bəndən qaçub ana, gedər derlər, gedər derlər.

...Nedüm, ey uslulsər, degüz, dəlürmədən ğəmüm yegüz,
Çu başdan əqlümi yaz-güz, gedər derlər, gedər derlər.

(*Vatikan, 61a*)

Xalq dilindən gələn hikmətli ifadələrlə, aforizmlərlə bəzənmiş misraları, beytləri poetik donda daha gözəl səslənməkdədir:

...Bənümlə eşq arasına girirsən, nasih, eşitgil,
Girən çün iyüyüb çıxar ətü dırnax arasına.

(*Vatikan, 2b*)

...Ey dil, qoyuban yaruni əğyarə yapuşmə.

(*Millət, 109*)

...Nəfsüm imiş düşmənüm, dust edübən bəslərəm.

(*Vatikan, 104*)

...Kim gördü mələk yüzlü pəri cinsi-bəşərdən?

(*Millət, 88*)



...Daş atma, saxın dil şişəsinə,
Bin şişə sınar dildən əgər bir şişə sınə.

(*Vatikan, 56b*)

...Nedim elm ilə yox cəhlün təmizi,
Müməyyiz seçəməz ətləsilə bezi.
...Mələk yanında çün şeytan gerəkməz

(*Millət, 77-78*)

Tanınmış türk alimi Vəsfi Mahir Kocatürk Gülşənidən danışarkən yazır: "Dilində bariz bir sadəlik və əsasında azəri ləhcəsinə (Azərbaycan dilinə – *A.M.*) qalan ibtidai bir səmimiyyət vardır" (V.M.Kocatürk. Türk ədəbiyyatı tarixi, Ankara, 1964, s. 394). Gülşəni divanında Kocatürkün dediklərini təsdiq edəcək "Qıyməz qəzən kimi daşubən yaş tökər gözüm", "səbə duz aşum üstünə", "gözüm səgrür, qulaq çınlar", "bişürdi bağrumi həsrət", "dağ urma dilər", "göz gördi, könül sevdi", "dərdün dilümi dağlasa", "bir oluban yazü güzüm", "dərdümə dərman bulun, deməgüz uslanadur", "bu can quşi qənət açar" kimi ifadələr onlarcadır. Gülşəni əsərləri dilindəki ritorik suallar (neylər? dad edəyümmi? nedim? nola?) rədiflər, qafiyələr (sultanə, rəhmanə, bürhanə, cananə, ehsanə, divanə, mərdanə, irfanə, Quranə, dövranə və s.), qoşa qafiyələr, xitablar (könül, ey dil, ey gözəlim, ey məh, ilahi və s.), sinonim, antonim sözlər, sufizmlə bağlı ərəb əlifbasının demək olar ki, hər bir hərfinə qoşulmuş beytlər və daha neçə-neçə zəngin sənətkarlıq xüsusiyyətləri baxımından öyrənilməlidir.

Gülşəni yaradıcılığı ilə bağlı vacib bir məsələni də qeyd etmək istəyirik. Bu, onun şeirlərinin bütövlükdə forma, məzmun, sənətkarlıq və s. baxımından eyni səviyyədə olmaması məsələsidir. Bəziləri gözəl, axıcı, üslubi baxımdan kamildirsə, bəziləri qüsurludur. Fikir və onun ifadəsinə daha çox diqqət yetirildiyi bir sıra hallarda şairin formanı məzmuna qurban verməli olduğu duyulmaqdadır. Hətta, elə misra və beytlərə, şeir parçalarına təsadüf edilir ki, ilk baxışda onların mənasını tutmaq çətindir. Zahirən bunlar mənasız da görünə bilir. Şairin dünyagörüşü, mənsub olduğu təriqət, həyata baxışı və s. əhatəli öyrənilməyincə belə zərif mənaları, hətta bəlkə də təzadları üzə çıxarmaq mürəkkəb olaraq qalacaqdır.

İndiyədək Gülşəninin vətəni Azərbaycanda yalnız 1984-cü ildə prof. C.Qəhrəmanov və filologiya elmləri doktoru A.Musayeva tərəfindən bir neçə şeri müvafiq olaraq 20 cildlik "Azərbaycan klassik ədəbiyyatı kitabxanasının III cildində və "Elm və həyat" jurnalında nəşr olunmuşdur.

Orta çağlar Şərq ədəbiyyatının gərəyincə öyrənilməmiş şəxsiyyətlərindən biri olan Şeyx İbrahim Bərdəinin əsərlərinin elmi-tənqidi mətninin hazırlanması, yalnız türk Divanının deyil, türkcə bütün əsərlərinin transfoneliterasiyası, başqa dillərdə (ərəb, fars dillərində) olan irsinin tercüməsi, həyatı və yaradıcılığının əsərlerinə söykənilərək daha dəqiq tədqiq olunması azərbaycanşünaslıq qarşısında duran məsələlərdən biridir. Gülşəninin XV-XVI yüzilliklər ədəbiyyat, dil və fəlsəfi fikir tariximizin müxtəlif yönlərdən öyrənilməsinə yardım edə biləcək ilk dəfə nəşr olunan türk Divanının həm də elmi-tənqidi mətninin hazırlanması, əsərlərinin tam şəkildə nəşri türkşünaslığa, dünya şərqşünaslığına layiqli hədiyyə ola bilər.

***Azadə Musayeva***





* * *

1. Ey məhəbbətdən təcəlla eyləyən eynül-bəqa,
Elminün eynin görən la təyyundən liqa.

Sevübən sevdürdi özün özünə biçün sifət,
Yoğ ikən sevmə-sevilmə aləmində mavü ma.

"Kun"[1] deyub qüdrət dilindən zahir edən hikmətin,
Şeş cəhət bir əmr ilə xəlq edən ərzü səma.

Aləmi şeybi-şəhadət görsədən hər vəch ilə
Sənsən, ey dana, alimü qadirü hikmətnüma.

Yoğ ikən mülki-ədəm, şey qüdrətün verüb vücud,
Zahir edən əvvəlü axır sənsən, ey rəbbül-vəra.

Dövr ilə xəlqə məkan ilə zəmanı göstərən
Şən'i-vəchündür təcəllidən sənə ilən ziya.

Birdən iki vəch ilə yüz görsədən şən'i vücud,
Qüdrətün izharidir həm xəlqə hikmətdən əta.

Surətə mə'ni sözün vəchün verüb, zahir qılur,
Hər nə vəch ilə dilərsə şən'i-xəlqindən liqa.

Gənci-məxfi vəchüni eyni-möhübbətdən səvüp,
Göstərən sənsən sənə vəhdət dəmində bieza.

Şahidü məşhud sənsən, əzəldən ləmyəzəl,
Vəchü baqi layəzali zahir olan bixəfa.

Vəsf edən, ya rəbbi, şanun mə'rifətdən bixəbər
Əczini idrak edərmiş heyrət ilə bilməgə.

Bilmədiginə vücudin əqli-küll heyran olub,
Nəfsi-küll bilməz nə deyə vəsf edən dəm zatuna.

Mə'rifət külli-lisandur səndən, ey biçünü cud,
Ol səbəbdən samit olub söyləməz əhlün-nəha.

Kim bilür genə vücudun neydügin, ta vəsf edə,
Ey Ğəni, Mütləq olan cüzvü küllüdən kibriya.

Gün kimi eynül-yəqini görsədən, ey Zülcalal,
Şanü vəchündür ziyadən xəlqə görə mütləqa.

Sən Ğəniyə fəqri xəlqün zahir, ey qadir vücud,
Fəzlü cud ehsanun, ol yüzdən umar bayü gəda.

Cüzvü küll yox sana görə, ey min zərrə zati-bəxt,
Leyk sənsiz cüzvü küllə yox vücud ilə bəqa.

Bulmuyan vəchün həyatın biləməz dirlik nədür,
Anun içün bulur ol niyyət həlak ilə fəna.

Rövşənidən vəchün imiş Gülşəninün dirligi
Andan istər, ya İlahi, hər nəfəs nəşvü nüma.

* * *

2. Ey əzəli şani-ədəb ibtida,
Əvvəlü axır olana pişva.

Vəchün imiş mətlə'ü məqtə' təmam,
Hər nə isə məbdəyilə müntəha.

Sevmiş idi vəchüni həqq, ey vədud,
Sevmə-sevilmə yoğ ikən tinü ma.

"Küntu nəbiyyən"[2] dedin, ey şahi-din,
Surətü mə'niyə nəzər müqtəda.



Şanuna "lövlak" dedi sevübən,
Yaradıcax vəchün içün mavü ma.

Kənzi-xəfi zahir edən günsifət,
Yüzün imiş xəlqə məhəbbətnüma.

Surəti-mə'ni səndən yoğ ikən
Xəlqə nəzər görünən ərzü səma.

Kim ki, sana münkirü biganədür,
Olmaz imiş həqq ilə ol aşina.

Səni sevən Həqqi sevər bixilaf,
Vəhy ilə çün böylə buyurdu Xuda.

Həqqün adıyla deməyən aduni
Rəddi-şəhadətdür, imandan cüda.

Taci-ləmərin başuna səvübən
Qodi əzəl güni ədəb kibriya.

Mə'nin içün surət olan mavü tin
Buldu həyat ilə dəmi-əsfiya.

Hər ki müti' oldu sana həqqədür
Taəti xalis oluban biriya.

Qiblə yüzündür görənə Kə'bədə
Anı görüb, təvaf edər əhli-səfa.

Səndən imiş əvvəlü axır gəlüp
Dəvət edən xəlqi güzün ənbiya.

Vəchün imiş cümlədə zahir olan,
Mö'cüz ilə xirqi-vəliyyi-hüda.

Adəmü Nuh ilə Xəlili həqün
Vəchün imiş sevgün ilə əsfiya.

Mehri-nübüvvətdən idi sevgilü
Həqqə sənün vəchün ilə əsfiya.

Nuri-nübüvvətdən idi ax sana
Mö'min olan cümlə vəli ətqiya.

Sevdi səni can kimi yüzün görən
Qılubənü vəchünə canın fəda.

Mehr ilə yüzini görəndür vəli
Rövşəni tək Gülşəniyə rəhnüma.

* * *

3. Ey əzəli ləmyəzəl, əvvəli-biibtida,
Əvvəlü axir nədür sanə görə intəha.

Əvvəlü axir sənün vəchün ilə görinür,
Zahirü batin vəli şənünə yox müntəha.

Olu deməK mümkünə cayiz olursə, vəli
Vacibə demək anı, əvvəlü axır xəta.

Zatə görə əvvəlün əvvəli yoqdur, vəli
Vəchü sifatə desən əvvəlü axır rəva.

Əvvəlünin əvvəli elmün imiş eyni-eyn,
Ğeybə şəhadətdən ol olmamış ikən liqa.

Eyni-ədəmdən vücud qüdrət ilə hikmətün,
Görəsidir mümkünat bütsifat andan həya.

Ay ilə gün qüdrətün, ərzi-səma hikmətün
Xəlqidir, ey kirdar, xaliqü ərzü səma.

Rövşənidən görəli Gülşəni Aydın elin
Bildi neçün dirini eyni-əyanə əma.



* * *

4. İtirüb, ya Rəbb, bir dil bulmazam layiq sana,
Zikr edüb adun dənədüm olmuya onda həva.

Teyyibü tahir həvəsdən ari dildən istərəm,
Şövq ilə zikrin deyələr dinləyüb, ya Rəbbina.

Eşidürəm xəlq içündür xaliqə zikrin deyəm,
Əksəri xəlqi cəhanun fikr edüb dildə həva.

Dəprədüb dilün həvadan anma sufi xaliqi,
Sallıyub bad ilə başun qarğu nisbət hər yana.

Gər dilün qurbağə kimi qal ilə zikr etmədin,
Dönübən balığa etgil səmt ilə xəlqə nida.

Qoğıl qal ilə zikri etmədən hal əhli ol,
Dilər isən edə sənsiz zikrini biçün Xuda.

Şər olur dilində zikri mə'rifətdən kamilün,
Dərk ana der heyrət issi anmalı əhlün-nəha.

Lavü illadən keçüb, de hüviyyət zikrini,
Ta biləsin nədir andan icazüllahi səna.

Liməallah zikri nədür sorانə derəm bunu
İrişüb məzkurə, olmaq fikrü zikrindən cüda.

Rövşənidən özgə netsün Gülşəni zikrün degüz,
Vardı, gördü, çünki oldur ibtidavü intəha.

* * *

5. Eşqə könül verməyən canını qıymaz bana,
Bənligini tərk edüp, eşq ilə gəlməz bana.

Eşqi murad edübən, tərki-murad etmiyən,
Olubanı namurad eşq ilə uymaz bana.

Eşq ilə Məcnun olan, əql ilə divanəvəş,
Olubənü münkirim qal ilə gəlməz bana.

Diri ikən ölmişi istəyübən bulmazam,
Çünki diri ölmədin eşq ilə duymaz bana.

Cani-cəhandan keçüp, istəmiyən eşq ərin,
Dirlik içün eşq ilə canını verməz bana.

Bir nəfəs yüz belə can verübəni almıyan,
Diləsəm ondan bəha, eşq ilə saymaz bana.

Eşq oduna yanmıyan Gülşənidir sanmaguz,
Rövşəninün yürəgi mehr ilə yanmaz bana.

* * *

6. Eşidürəm dəmbədəm eşqə səladur səda,
Dolanü bu səm'i-can zövq ilə andan nəda.

Şövq ilə zövqü fəlah deyülənədür səlah,
Də'vət edər eşq eşit kuhü kəmərdən səda.

Eşq özüdür çağıran, yuxuda isən, oyan,
Can qulağun aç, deyən zahirü batin sana.

Ey gəlübən bilmədin eşqə nəhayət soran,
Əvvəlini kim bilür ta deyə axır ana.

Eşqə zamanü məkan "var" deyənə, "yox" derəm,
Əvvəlü axır sifət seyyid ilə müntəha.



Eşq ilə bildim nədür lövhə yazılan rəqəm
"Nun"ü qələm çəkmədin ana qədərdən qəza.

Aşiq üçün hal olan xəlqə mühal olmasa,
Tə'n edübən cəhl ilə qılmaz idi macəra.

Əmr ilə əqlə həram, eşqə mübah olduğun
Bilməyən inkar edüp, nəhy ilə deməz rəva.

Rövşənidən eşq ilə Gülşəni əhd edəli,
Dilər ana can verüb, əhdinə qıla vəfa.

* * *

7. Ey əzəli vəchə iridən liqa,
Sevdi görüb şanuni eynül-bəqa.

Surətü mə'ni sandun yoğ ikən,
Eyni-yəqini soranə masəva.

Eynün idi-elm ilə eynin görən
Məzhər edən vəchini biçün nüma.

Əvvəl ikən axırı zahir edən
Bilməz ikən kimsə nədür xakü ma.

Qüdrətə məzhər sən idün əmr ilə
"Kün" deyicək xaliqü ərzü səma.

Vəchün idi zahir edən hikməti
Çünki mürid oldu iradət ana.

Kənzi-xəfi şə'nun imiş, ey vədud,
Mə'rifət oldur bilinə istə'fa.

Elmə görə qıldı məlayik sücud,
Adəmə əmr etdügi dəmdə Xuda.

Elmin asanun oxu, bil nədür
Adəm isən daniş edüp rəhnüma.

Hər kim anı bilməz isə bilmədi
Həq nəyimiş, batin ilə mütləqa.

Hər kim özin bulmadı həqdən iyüt
Tərk edüp əbqayi, bulamaz bəqa.

Mehr ilə görən yüzüni məhsifət,
Gülşənidür Rövşənipərvər ziya.

* * *

8. Bilməzəm eydi-cəmalun görmiyən, ey məhliqa,
Canımı qurban edən dəm nəyə edisər fəda?!

Görəli qaşun hilalın bədri-vəchindən derəm,
Bir nəzərdən iki bayram sana etməkdür rəva.

Kə'bə nisbət kuyin təvaf etmiyənlər, ey sənəm,
Mürvətün sirrin biləməz oluban əhli-səfa.

Eşq ilə görüb cəmalun eydi-əkbər demiyən,
Yariləğənməz rəhmət ilə əfv olub ondan xəta.

Mə'rifətdən ülüvvə irən arifi-dövran bilür
Hacilər vəchünə qarşu neçün ederlər dua.

Olmasa şeytan həsudun, ey mələksima bəşər,
Atmaz idi daş ana sakini ərzü səma.

Həqq bilür məhrum oluban həcci məqbul olmadı,
Tovf edərkən görmiyənlər vəchün, ey nuri-Xuda.

Bir nəfəs sənsiz olanda yüz yılun olur isə
Dönərəm çün necə olam, ey pəri, səndən cüda.



Dilərəm yüzün görübən şövq ilə bayram edəm,
Çünki bayram andan eylər sahibi-zövqü səfa.

Rövşəni vəchünə sorar tovf edərkən Gülşəni
Kə'bəyə yüzin sürən dəm şövq ilə xəlqi-Xuda.

* * *

9. Bəndən özgə yox hicab baxdum isə hər yana,
Anun içün bənlügi salmışam öndən sona.

Yolum uran azduran nəfsim imiş, tanıdum,
Düşmən anı bilürəm ə'da ədudən bana.

Dedi kimmiş söyləyən, ikiyi bir eyləyən,
Adını Adəm qoyan tapşur özünü ana.

Qəbzə salan nəfs imiş, bəst ilə derəm rəvan
Tərk edübən qəbzü bəst, varlığı sal, çıx günə.

Bən degüləm söyləyən, biri iki eyləyən,
Sağ ilə sol söyləyən həqq imiş öndən sona.

Birə iki deyənün olduğunu görmədüm,
Düşmənidür həqqün ol, pəs necə işi ona.

Rövşənidən açuban Gülşəni Həqqə gözün,
Ona görə doğru yol görsədübən düş önə.

* * *

10. İstəyüp dərdinə eşqin bulmazam ondan dəva,
Nə qədər dəryayi-şumə bilməzəm ondan qəza.

Bir nəfəsdə yüz bəlasin çəkmədin eşqün, nedim?
Çün usanmaz könlüm ondan çəkübən yüz bin bəla.

Gün kimi yüzüm sürübən hər qapudən istərəm,
Sevdügümin izi tozun gözümə kəhli-cila.

Alalı könlümi verməz bir pəripeykər, nedim?
Çün könülnisbət dilər kim, canımi daxi ala.

Nasehim tərki-həva deyübənü ögüt verər
Bilmezəm tərkindən alun nədir anunçun həva.

Girəli meydani-eşqə başumi top etmişəm
Kim çalub çövqan, dilər ardına düşüb qova.

Rövşəni pərvərdəsidir Gülşəni anun içün
Gün kimi rövşən görinür aləmə andan ziya.

* * *

11. Aşiq xaçan bəlayə düşübən məlul ola,
Çün səbr edüb bəlasinə anun həmul ola.

Eşqün yolunda kim kim, bəladən qaçar, bilün,
Talib degil ki, mürşidi-həqdən qəbul ola.

Lütf ilə qəhri-dilbəri bir bilməyən, nedəm,
Kim qəhr edəndə dilbəri andan nəqul ola.

Naqis qalub kəmalə irişməz yolun əri,
Övrət kibi ki, rəhbəri-naqis üqul ola.

Götür bəlayi-eşqi əmanə bilüb rəvan
Gərçi götürə [zəmanın] cəhul ola.

Aşiq oldur ki, kəndü muradını tərk edüb,
Mə'şuqun muradi pəs onda hüsul ola.

Arif odur ki, xəlvət edə guşəgir olub,
Rövşən gözü kibi nəzər içrə həmul ola.

Mə'şuqun vüsalini hicr ilə istəyən
Aşiq demin ki, adı onun bül-füzul ola.



Vəchün kitabınun diləsən şərhi-eyşini,
Elmi anun bəyan ilə yüz bin füsul ola.

Me'raci-hüsnüni neçəsi vəsf edüb deməz,
Çün Cəbrayıl vəhy ilə andan rəsul ola.

Gəlməz bəyanə vəsfi-rüxün kim deyəm anı
Ta dünya fər'i-şə'ninə kamil üsul ola.

Abid demən, derəm ana kim, çoq yeyüb yata
Qarnı qulu deylür ona kim "əkül" ola.

Elmi-lədun qənimətidir ne'məti-kəlam
İlhami-həqdür ol deməgüz kim, qəlil ola.

"Ümmi" demin vəliyə nəbi elmin eşidüb,
Arif çü elmi-həqqə lədundən fühul ola.

Mürəssəl dilinə indi kəlamü səhfa kitab
Demin bundan özgəyə Qur'an nüzul ola.

Qılsa bəyan kəşfə görə, əhli-dil demən
Nəqli anun rəvan eşidilmiş nəqul ola.

Mö'cüznüma yüzün görən nə desün, ey pəri, rəvan
Kim vəchünün bəyaninə andan şümul ola.

Tovhidə irsən belə gər Gülşəni kibi
Rövşən nədür, bu mə'niyi sanma hülul ola.

* * *

12. Yerdə var cürmün kibi dərd əhlinə abü həva
Kim, verən zəhmətlə ana sağalub bula şəfa.

Hər zəmin kim yuya suyundan anun bir gəz tənin,
Qurtulur yüz dərdü möhnət rənc olandan bidəva.

İssi sudur, leykən andan sarudur canın məriz,
Anun içün issi sudan yuyana oldur dəva.

Bin təbibi aciz edər bir gəz andan tən yuməq,
Bu Əliveş andan istər hikmətin əhli-şəfa.

Gər edəm nisbət anı abi-həyatə danlamın,
Çün dirilür ölü kimi hər dirani anda ma.

Şəllü götürəm, məfluc olan anda varsə sağalur,
Bulur istirca o sudan qüvvəti-tənlə qova.

Sövməyi İsavəş andə bağlurəm zaviyəm,
Çün anın həmmamidir dərd əhlilə hacət rəva.

Öyüz-qotur girənlər cürmünün həmmaminə
Qurtulur xarişti-təndən pak oluban dəstü pa.

Dərdmənd olan dəvasız cürmünə salar özün,
İstəyüb dərman suyundan isfəndlə cabəca.

Yel içün ol oda nisbət toprağun suyni tənə
Gülşəni yağmur kibi verər rəvan nəşvü nüma.

* * *

13. Əcəb yüzün görən necə qılur tab?
Çu ondan bidil olur şeyx ilə şab!

Əcəb nərgislərün uyur oyanux,
Görənün gözünə necə girür xab?!

Əcəb dürci-gövhər kimi dəhəndən
Dişünmidür görünən, ya düri-nab?!

Əcəb ay kimi alnından münəvvər
Cahanda varmıdır bir taqi-mehrab?!



Əcəbmi təşnəliqdən can verərsə,
Görənlər ləblərüni lə'li-sirab?!

Əcəbmi, ey pəri, yüzün görəndə
Günəş sararuban, qərara məhtab?!

Əcəbmi gözlərümdən yaş yerinə
Axıdam həsrətündən seyli-sürxab?!

Əcəbmi Gülşəninün Rövşəniçün
İnildü zarisi manəndi dulab?!

* * *

14. Ağlamaqdan gülməz imiş şad olub bir dəm qərib,
Zikri-fikri olubanu dərd ilə nedəm, qərib.

Var əgər həsrətlə verəm canımı axır nəfəs,
Görmədən sevdüklərimi dünyadan gedəm qərib.

Səvnişür xəlqi cəhanun ay görüb bayram içün,
Yaslu kimi qayğuludur bir belə ol dəm qərib.

Dönübən sahib qərayə ün çəkübən dərd ilə
Gözlərindən axıdarmış yaş yerinə dəm qərib.

Ya ilahi, Rövşənidən ayru zari-hüzn ilə
Gülşəni kimi cahanda olmasun adəm qərib.

* * *

15. Bilməzəm dövran nə istər bəni sərgərdan edüb?
Bisükunət kəndü kibi seyrinə gərdan edüb?

Aluban dildən qərarım gərdişi-dövrani-dün,
Döndürür çərxinə dəhrün bəni sərgərdan edüb.

Lütfidür anın bana çün qəhr olubdur den, nedim?
Kim başumi top yerünə çalar ol çovqan edüb.

Mütləq ikən qeydə salub könlümü bəndi sifət
Qəbzini bəstümə görə hübb ilə Qur'an edüb.

Bir deməzəm yüz bəlasın göndərər dövran dünə
Kəndü kimi gərdiş ilə tayəyi-heyran edüb.

Bilməzəm adəm nə yüzdən odü sudan pərvəriş
Nişə dilər ol ələfdən özüni heyvan edüb.

Tifli-çeşmim görəlidən ləzzət, öldü izzətim,
Gülməz oldu matəmivəş özünü giryan edüb.

Ürünübən ayrı bəhrə gözlərimün yağmuri
Qərq edür seylin rəvandan aləmə tufan edüb.

Gözlərüm qanlı yaşını ağlar ikən göstərüb,
Yüzüm üsnə dökdügi dəm dürrünə mərcan edüb.

Sınadım dövrani-dünün kəsvətin ariyədir,
Can verən dəm çünki alur verdügin üryan edüb.

Cəhl imiş verməк, könül, çün elmə nisbət biəməl
Alimim dürlü xirəd cəhlin ana irfan edüb.

Qılmayan təsdiq dilin şək sözini həqdən yəqin
Zənnü batindən biləməz küfrini iman edüb.

Rövşəniyə verəli dil Gülşəni təslim ilə
Bildi üqbai nədir andan vəchin ehsan edüb.

* * *

16. Qiyamət dilsən, ey sərvqamət,
Uru tur kim, qopa xəlqə qiyamət.

Saladur həqr içün nəşrə bu dəmdə,
Oxundu çün qiyamətçün iqamət.



Yüzün görən əfifü zahid, ey can,
Olandur eşq ilə rüsva məlamət.

Cahanda Leylinün Məcnuni birdür,
Sənün xəlqi-cəhan, ey can, təmamət.

Yədi müshəf kimi vəchündən oxur,
Kəlami-eşqi aşiq ayət-ayət.

Tükənməz həsrətün vəsfi, nə deyüm,
Bulunmaz çün o vəsf içün nəhayət.

Soraram xirqə adət Gülşəniyə
Nədir? – der Rövşəni: Görmək kəramət.

* * *

17. Nədür eşqündən özgə canım, ey dust?
Odur can ilə çün cananım, ey dust.

Könül Misrində Yusifdən əzizim
Sənin sevgün imiş sultanım, ey dust.

Saçun küfrin görən iman yüzündən
Bilür ol küfr ilə imanım, ey dust.

Qiyamət vəchün imiş zahir oldu
Günəşdən aləmə bürhanım, ey dust.

Bu gün yüzün görüb, "danla" deməzəm,
Çü danladur bu gün durağım, ey dust.

Xəlayiq həşrin istər nəşr içində,
Qiymətdən görəməz şanım, ey dust.

Dəvasız dərdin içün Gülşəni der:
– Nədür can, vermədün dərmanım, ey dust.

* * *

18. Ey könül, eşqün bəni divanə qıldı aqibət,
Bilgümi əql əhlinə əfsanə qıldı aqibət.

Düşürüb dağlarə eşqün aşinalərdən bəni
Dəlü kimi xəlq ilən biganə qıldı aqibət.

Yaxdı çün könlümi eşqün, saxlamağa gəncini
Əjdəhanun yatağın viranə qıldı aqibət.

Qətrəyi-nisan kimi bu bəhri-canum dürri-saf,
Ha sədəfdən gözgörə dürdanə qıldı aqibət.

Qarə geyüb gözlərüm müğdən betər gör, ey sənəm,
Qaşlarun mehrabini bütxanə qıldı aqibət.

Susayubən ləbləründən tutuşub yanar könül,
Qanımğa andan ləbün peymanə qıldı aqibət.

Yüz çevürmə Gülşəniden, ey könül, hər vəch ilə
Can verübən çün səni cananə qıldı aqibət.

* * *

19. İçəli camini eşqün olmuşam, ey yar, məst,
Onun içün görürəm mən dövr ilə dəyyar məst.

Məsti-didarəm kim, onun sərxoşudur hər nə var,
Ol təcəlla camın içüp oldu hər hüşyar məst.

Eşq ilə ruzi-əzəldə içmişəm cami-ələst,
Ol səbəbdəndir edə gəldim, ey dildar, məst.

Rindi-meyxanə bilür ol cami-şövqi-zövqini
Kim, içən şövq ilə olur aşiqi-didar məst.

Gəlməz ol meydən içənlər ayığ olub özünə,
Olduği budur o meydən aşiqi xummar məst.



İçən eşqün şərabın sərxoş olup deyəməz,
Xasü amə görə hər dəm yar məst, əğyar məst.

Vəhdətin camindən olmuş kəsrət əsrüp sərbəsər
Qalmayub ayıq nə isə oluban yekbar məst.

Xəlqi-aləm-hər nə isə insü cin, divü mələk
Nitq ilə cüzvü küll olan məcbur, həm muxtar məst.

Ərşü kürsi, cənnətü duzəx, xəlayiq sərbəsər,
Abü xakü bad ilə həm nur məstü nar məst.

Cizginür dövran kimi başi bu dünya xəlqinün
Olalı mirü vəzirü ləşkərü sərdar məst.

Ənbiyavü övliyavü əsfiyavü Murtəza
Şövqi-həqdən sərbəsər oldu qəmu əbrar məst.

Yerü gögdə hər nə var cünbandəvü camid, nəbat,
Dövrə görə seyr edərlər saliki-ətvar məst.

Ənbiyanın sərvəri Şahi-rəsul, Məhbubi-Həq,
Vəhdətin camindən içən Əhmədi-muxtar məst.

Ol imami-övliya, sirri-vilayət bu Türab
Camini Əhməddən içən Heydəri-Kərrar məst.

Mustəfanun yarü əshabivü ətba'i-təmam
Əvvəlü axır, sərbəsər ol cümlə didar məst.

Əmri-"kün"dən kainatun cünbüşini görəli
Dövr edən çərxə girübən günbədi-dəvvar məst.

İki aləm vəhdəti çün bir dükandur açılu,
Ol dükandan kəsrət ilən qurulan bazar məst.

Zahidü abid, müridü şeyxü sufi, müttəqi
Zikrü fikrü taət ilə cümlə əxyar məst.

Nöh fələk bir cam içübən cizginür leylü nəhar,
Gecə-gündüz dövrə girüb döyünər tərrar məst.

Şeyxi Sən'an oldu tərsa, tərk edü imanım,
Küfr ilə bağladı belə çünki ol zünnar məst.

Seyr edüb tövr ilə gör Turun təcəllisin ki, ta
Biləsən Turi olupdur anda Musavar məst.

Sanmanuz cənnət binasın camidü bixəs ola
Hurü qılman kimi gördüm dar ilə divar məst.

Münkirün inkiri qılmaz sərxoş olan dəm eşit,
Canü dildən qıldığun inkar ilə iqrar məst.

Qazivü müfti, müdərris, vaiz ilə qissəxan,
Möhtəsib həm şeyxü zahid, mö'minü kəffar məst.

Kə'bəvü bütxanədə hər mö'minü müşrik olan
Cami-heyrətdən olupdur rədd ilə muxtar məst.

Qarə geyüb rindü tərsa muğsifət xirqənişin,
Öldüği dəm bağlanur gər belünə zünnar məst.

Cəngü dəfü ud, nayü suzü saz olan qamu
Söyləyən dildə nəvadən nitq ilə övrad məst.

Eşq ilə cami-ilahi cür'əsindən içəli
Görürəm bir nöqtədür bu cizginən pərgar məst.

Bir nida eşidübəni zövq ilə iki cəhan
Cizginür girüb səma'yə seyr ilə ətvar məst.

Sərxoş olub eşq ilə, ayılmazam içüb müdam,
Ol səbəbdən görürəm çar məstü dar məst.

Qılma derəm Gülşəniyə aşikarə sirrini,
Anlanılmaz çünki sirdən etdigün izhar məst.



* * *

20. Ey camalun eşqə məzhər, surətün mir'ati-zat,
Vəchün imiş hikmətullahi-qüdrət içün sifat.

Surəyi-"Rəhman" yüzündür, "Qaf vəl-Qur'an" sifət,
Qaşü gözü kirpigindür sadü nun vəl-mürsəlat.

Zülfü rüxsarun görənlər "Vəzzüha", "Vəlleyl" oxur
Gecə-gündüz, sübhü şami vəsf edən dəm "Vəs-səfat".

Qılalı zülfün pərişan sübhdəm badi-səba,
Ol pərişandan bilindi asifatü nasirat.

Görəli me'raci-hüsnün bildim "əsr"i-surəsin
Kol "üruci-qabi-qövseynə"[3] qaşundur tariqat.

Oxuyan "Və-n-nəcm" bilür vəsl ilə fəslün nədür,
Ey danadan qürb onu ülvünə yox səfilat.

Ey məhəbbətdən iradət sirri-"lövlakə"[4] vücud
"Küntu-kənzə"[5] məzhər olan vəchün imiş bicəhət.

Gün kimi yüzündən imiş zahir olan hər nə var,
Eyni-əyani-həqayiq hər nə isə kainat.

Görsədən qeybi-şəhadət surətindür mə'nidən,
Qiblə oldur, Kə'bə xəlqə qamu yüzdən şeş cəhət.

Görmiyən yüzünü qiblə Kə'bə içrə, ey sənəm,
Öz həvasın büt qılandır Kə'bədə Latü sifat.

Rövşənidən gör ki, der Gülşəni öz vəchini,
Görmiyən vəchüni baqi, fani imiş əqəlat.

* * *

21. Qiyamət dilsən, ey sərvqamət,
Rəvan ol kim qopə xəlqə qiyamət.

*Görənlər fitnədən qaş ilə gözün*
Bilür nədür qiyamətdən əlamət.

Bu gündə görmiyən vəchüni, danla
Çəkir fövtü fürsətəndən nədamət.

Nədür vəchündən özgə, ey pərixu,
Görünə bir nəzər eyni-kəramət.

Səkkiz cənnət kimi görən cəmalın,
Nə yüzdəndür bilür cənnət təmamət.

Nədür kuyindən özgə bilməzəm,
Məqami-ümmətilə daru səlamət.

Saladın Rövşənidən əhli-eşqə,
Dəgibdir Gülşəniyə çün imamət.

* * *

22. Nedim sirdür məhəbbət eşqə nisbət
Ki, zahirdə oddur, batində rətbət.

Məhəbbət məzhəridir eşq neçün
Ki, hikmətdən odur bikeyfi-fitrət.

Əzəlsüz biəbəd eşqün zühuri
Məhəbbət vəchidir bikeyfi-ruyət.

Nədir ol zühuri-eşqə axır
Yetupdür çün bilinməz qeybi-qüdrət.

"Nəfəxtu fih min ruhi"[6] dəmindən
Dirilən Adəmə eşq oldu surət.



Müqəddəs surət oldu vəchə mə'ni
Olan qeybi-şəhadətdən hüviyyət.

Verilməz qeyrə ol sirri-ğüburun,
Diləməz anı faş olmaq çü qeyrət.

Əmanət sirrini hər kim edə faş,
Qılub qeyrət ana darini ibrət.

Nədir insandan özgə sirri eşqün
Məhəbbət məzhəri qüdrətlə sövlət.

Sancanlar Rövşənidən Gülşəniyi,
Biləməz neydügin birlikdə hikmət.

Hezanan Rövşənivəş Gülşəniyə
Verər vəhdət dəmi birlikdə qürbət.

* * *

23. Ey talib, ər dilərsən elmül-yəqinlə hikmət,
Eşit neydir müşəyyət həqq ilə əbdə nisbət.

Ruyi fərqlə nədir cəm' əvvəl müşəyyət içün,
Ta kim, təmiz edəsən fərqini bisəviyyət.

Rəbbün müşəyyətini nisbət edüb ilahə,
Cəbr edüb ixtiyarın, "yox" deməgil zərurət.

Cəm'ilə fərqi alə nisbət rəvadır, amma
Rəbbə görə deməgil məşiyyət ilə şirkət.

Əbdün var ixtiyari xeyr ilə şərə görə,
Rəbdən odur mürəbbə, yolunda fe'li-xilqət.

Fe'l ilə quli-əbdün Rəbdən bulur muradın,
Şər ilə xeyrə görə hər nə dilərsə rətbət.

Məcburdir müxəyyər əql ilə hissi olan
İsbat edər çü təklif bixəbər ana qüdrət.

Əmr ilə nəhi həqqün biixtiyarə olmaz,
Məcburə zülmi olur, çün ixtiyarə sövlət.

Ədl ilə hikməti-Həqq cəbr olmaz ixtiyarat,
Əmrini Həqqün amma nəhinə vermə xəlvət.

Cəbr etmə ixtiyarun cəhl ilə bilməyübən,
Elm ilə ixtiyarat cəbrüni həqqə xidmət.

Məcburi həqq olanun cəbr olur ixtiyari,
Çün yoxdur ana görə ol dəmdə çünki kəsrət.

Cəbrümi Rövşənidən vəhdət dəmində sorman,
Məcbur ikən bunu der, yox ana bə'dü qürbət.

* * *

24. Eşqü məhəbbət sevib qıla əxissi-sifat
Məzhəri-məzhərsifat oldur olan qeyri-zat.

Külli-lisandan bəyan mə'rifəti-eşq olur,
Səmt olub andan zəban qalə deməк bəyyinat.

Kim bilisər cəm' ilə fərqini eşqün nədür,
Çün eşidilmiş degil anı biləndən rəvat.

Nəfxəyi-ruhül-qüdus nəydi məhəbbət dəmi
Məhv oluban eşq ilə sabit olan dəm səqat.

Eşq ilə seyr etməyən birdən iki vəch ilə
Bilmiyisər neydügin ona nəzər ba murat.

Eşqi-məhəbbət sevib bir-birini dövr edər
Ay ilə günəşsifət yəsar olub nasarat.



Hər ki görər eşq ilə dövri-məhəbbət nədir,
Bilür o dövrə görə neydügini kainat.

Mə'niyə məcla olan aləmi-surət degil,
Eşqə nəzər seyr ilə dövredici mümkünat.

Mə'ni gözün açubən surəti-eşqə baxan
Görər od içün bəsər fərrəti-eyni-səlat.

Fəqr ilə fəxrin bulan bildi ğina neydügin
Verdügi dəm cüz' küllə eyni-əyandan zəkat.

Kim bilisər neydügin eşq ilə təyyub vücud,
Tahir olub geymədin kisvəti-hərbi-məmat.

Eşq ilə alül-məqam bulunmamış bilməyən
Nəflə nəzər neydügin afil ilə safilat.

Rövşənidən Gülşəni eşq ilə biçün sifət
Hər dil isə olmayan ana derəm türrəhat.

* * *

25. Ya İlahi, kimə deyim yalvarubən əl-qiyas!
Bün zəmində acizü müztər qılubən, əl-qiyas!

Səndən özgə kim qılur bana məded, ey kirdikar,
Ta ki umam bir dəmin anun deyübən əl-qiyas!

Bilürəm buni, bana bəndən yaqınsan bicəhət,
Anun deməzəm yerün sorubən əl-qiyas!

İstərəm övni-pənahun bulam, ey rəbbi-kərim,
Çün qəzayilə qədər derəm görübən əl-qiyas!

Kim alur iman ilə axır nəfəs, ya Rəbb, canum
Səndən özgə, ta ki, deyəm can verübən əl-qiyas!

Zikrü fikrim gecə-gündüz söyləməkdir aduni
Anun içün derəm ismün vird edübən əl-qiyas!

Rövşənidən dilərəm sana mədəd, ey Gülşəni,
Dildə zikrim dəmbədəm ondan olubən əl-qiyas!

* * *

26. Necə deyim münkirə təsxir edüb, gözün ac,
Seyri-dilin əxsəğü kurə çü yoxdur xərəc.

Aydın eli yolunə başdan ayəx qoyana
Didə gərək gün kimi ay bilə mənzilü zəc.

Dur gedəlüm, ey fəna, yüz dutuban həzrətə,
Uğrar isən cənnətə, qalma ana, durma kəc.

Batilisi həqq ilə olubənü gər yola,
Varlığun ondan diləyəydi qoyub qəmə qəc.

Dildə həvavü həvəs büt kimidir, ey ğəni,
Tapmə ana hər nəfəs sevgün edüp ana həc.

Tiləyibən sevgilü, qılma həbis özünü,
Ta ki görənlər səni həbs ilə deyə ləc.

Mö'min isən xeyrü şər bil ki, nədir nəfü zər,
Almağa sana yürər nəqd ilə qəlbini səc.

Misri-dilə qıl səfər, Yusifinə can ver, al,
Ta ki, Əzizdən qulun şah olub alə xərac.

Rövşəniyə münkirün zahir olub kurluğu,
Ancılayın ögmədə, Gülşəni, yoxdur fərəc.



* * *

27. Necə kim qəmdən dilərəm könlümi qılmax fərəc,
Diləməz vərhəmligindən istəyüb bulmax fərəc.

Dilərəm himmətlə ğəmdən qurtaram canım, nedəm,
Qayğulu könlüm əlindən diləməz olmax fərəc.

Girübən bazari-eşqə dəmbədəm ver həm könül
Verübən nəqdini, ğəmdən diləməz almax fərəc.

Ağladuğum görübəni şad olub gülənə sor
Ki, nə xilqətindir ana cəhl ilə qılmax fərəc.

Həm ğəmdür istədügi könlümün, eyşü nəşat
Ver, anunçun gərəkməz könlümə salmax fərəc.

Rövşəninün ğəmi imiş Gülşəniyi şad edən,
Andan özgə diləməz, çün könlünə dolmax fərəc.

* * *

28. Ey bana gəlüb soran dünya nədür, ur qulax,
Dünya odur kim, edə yaxını Həqdən irax.

Dünyaya aldanuban qəflət ilə uyuma,
Oyanuban yuxudan axirətə qıl yərax.

Ölmədən ölən bilür iki cahan birligin
Birlik ilən sən dəxi gözün açup birə bax.

Dünya edən nəfs imiş axirəti çün sana,
Axirətin diləsən, dünyayi əldən burax!

Nəfsün odu yandırur canuni, ey bixəbər,
Onun içün kim dedi sən özüni oda yax?!

Yandurəli nəfsi-şum nari-həva şamini,
Yandurur canını çoxlarun ol oda bax.

Rövşəninün pəndini Gülşənidən eşidüb,
Dürri-yetim yerinə qulağuna onu dax.

* * *

29. Eşq elinə getməgə, dur, könül ilə bir ax,
Həmdəm olub deməgil yolu yaxındır, irax?

Dur yola düş gedəlüm, yoxluğu zar edəlüm,
Varlığum nedəlüm, sən bəni tərk et, burax.

Mavü mənlikdən qaçub, bənlik olandan keçüb,
Eşq ilə gözün açup, istədügin yüzi yax.

Eşq elini qıl məqam, əqlə uyub qurma dam,
Ta ki xəyalından müdam urmuya boynuna fax.

Tərki-həva qıl həvəs, əldəyikən dəstrəs,
Cani verüp son nəfəs, deməyəsən ah-vax.

Diri ikən ölə gör, axirətün bilə gör,
İstədügin bula gör saxlamıyup xəlqə çax.

Rövşəninün şəm'inə dutuşuban, Gülşəni,
Eşq ilə pərvanəvəş ancax özün oda yax.

* * *

30. Ey əhədi-eynə şəhadət vücud,
Vəchin edən şani-məhəbbət vədud.

Səvibənü səvdürən öz vəchini,
Şahidü məşhur edüp özin şühud.

Əvvəlü axır kim edər şanunə,
Çünki nəhayət yox ana, həm vürud.



Mütləq imiş qeydi-vücudun sənün,
Zahirü batin yoğ ana qeydi-bud.

Cüzvü küllün vəchi, əya fərd, əhəd,
Səndən imiş hər nə isə feyzi-cud.

Eyni-ədəmdən yaradub surəti
Sənsən edən mə'ni yüzündən nümud.

Qüdrətünün hikmətidir, ey Səməd,
Cüzvü küləl hər nəyisə vəch bud.

Rövşənidən şanun imiş bildim uş
Gülşəniyə əzm ilə Darül-Xülud[7].

* * *

31. Nə bəladür bilməzəm kim eşq olupdur ana ad,
Eşidün anun kimi bidad əlindən dadü ad.

Kimə varub dad edim, den kol yersə ğəvsimə
Çünki ana hökm edəməz dad içün Şəddadü Ad.

Sevübənü lütf umana qəhr edər düşmən kibi,
Namurad olsun, deyüp, istəyənə bəndən murad.

Nerə varsam eşq əlindən, yoxsulü bay
Dərtlüdür, guya ki, ondan ayru şəhrü bilad.

Eşq həmvar olanı əql ilə daim xərab,
Eşq imiş sərsər kim, ondan halik oldi qövmi-Ad.

Eşq əlindən ağlıyub gülməz degin hər bidili,
"Vərhəm"[8] Andandır ğəm ilə bulmuyan könli güşad.

Rövşəni eşqə "bəla"[9] der, leyk nedim, Gülşəni,
Ol bəlasız edəməzəm vərhəm ikən könli şad.

* * *

32. Diləsən qayğulu könlün ola şad,
Təəllüqdən qıl özün əvvəl azad.

Olub vərhəm, yemə qəm gecə-gündüz,
Nə bir deyübənü əndüxtə övlad.

Yetürər rizqini qayırma xəlqün,
Yaradub can verən danəndə həddad.

Yedi gögə verən qüdrətlə dövri,
Bilür hikmətlə nədür ana bünyad.

Zehi, dana hakimi-qadirimi
Ki, dağları yerə eylədi övtad.

Zehi, sane' ki, icz ilə görəndir
Gögi xəlq eyləyən qüdrətlə ustad.

Gecə-gündüz gəlüb-getməsi yetər
Ay ilə gün kibi xəlq içün, ey şad.

Bəladur başimə eşq ibtilası,
Çəküb andan bəla eyləməzəm dad.

Necə fəryad edüb dad etməyim, den,
Yanub eşq əlindən, dadü fəryad.

Tükənməz Gülşəninin virdi-dili,
Ana aşiq olaldən zikrü övrad.

* * *

33. "Eşq" bil Adəm, "məhəbbət", "məzhəri-məzhər" nəmud
Kim, məlayik ana nisbət əmr ilə qılmış səcud.

Elmən əl-əsma müsəmmadan odur tə'lim içün
Məzhər olan elmə eynəl tə'limdən şəhud.



Əvvəl-axırü zahirü batin məhəbbətdən odur
Görsədən hər vechə nisbət elmin əyandan vədud.

Kimsə bilməz sirrini ol adəmi eşqün nədür,
Faş edəməz çünki anın neydügin köfti-şənud.

Adəmi eşqi biləndir arifi cüz'-küll şeyin
Kim, nəfindən şəksüz olur elm ilə eyni-vücud.

Sirri-eşqi bilməyəndir arifə inkar edən,
Həqqə batil deyici hər cahilə əhməq cühud.

Rövşənidən sirri-eşqi, Gülşəni, faş etmə, çün
Anlamadan münkir olur ana hər gövdən ənud.

* * *

34. Dilərəm məlcə'yi bana Həqdən məlaz,
Qövs ola öndən-sona həqdən məlaz.

Oldu müztər cəhandə dövr ilə
Ol kim oldu övn ana həqdən məlaz.

Yerü gög qövsi-mədəddür bilənə,
Rətbü bayis görsənə həqdən məlaz.

Səndədir həqrün, bilürsən ğövs ilə,
Andan istə sən sana həqdən məlaz.

Qəbzisi bəstünə verübən mədəd,
Ta bulasan sən ana həqdən məlaz.

Sənlügindir yolun uran, çün sənün
Enüb özün bulsana həqdən məlaz.

Rövşənidən Gülşənidir qövsi-vəqt
Gözün açubən dönə həqdən məlaz.

* * *

35. Görən yüzün nurun, edən münəvvər
Olur rövşəndil, ey mahi-müsəvvər.

Yüzün bayramına qurban edüpdi,
Bixi çalup bana Allahü əkbər.

Baxan "Səb' ül-məsani"[10] der yüzünə,
Görüp müshəfsifət vəchün müsəttər.

Oxur zülfün görən "vəlleyl", yüzün
Təcəlladir nəhar içün müqərrər.

Deyübən yüzün içün lövhi-məhfuz,
"Ələm nəşrəh"[11] oxur vəchün görənlər.

Olub cənnət yüzün, uş gör isə yer,
Nə varsa cənnət içrə hüsnə məzhər.

Gözündən rövşən oldu hurü qılman,
Ləbündən səlsəbil, abi-kövsər.

Nədür Tuba qədündən özgə Sidrə
İkidən bir budax kimi, ey sərvər.

Səkkiz cənnət yüzündən rövşən oldu
Olandan bərlü hüsnün eynə mənzər.

Nə var cənnətdə ol kim səndə yoxdur,
Sənün vəchündür olmayan mükərrər.

Sən idün küntü kənzə məzhər olan
Məhəbbətdən bilinən gənci-gühər.

Sənin şanun içün denildi lövlak
Nə var yüzündən özgə xubi-behtər.



Yüzün görən qılur vəchin nəmazin
Görüb mehrabə nisbət qaşə minbər.

Qara xalun görən ağ yüzdə zahir
Bilür toəm doğurur anı madər.

Məgər zülfün qılub dilbər pərişan
Durar kim, aləmi qıldı müəttər.

Əsən badi-səba ğaliyəbudur,
Məşamə irən uş qoxu müənbər.

Qaşun mehrabi bəsdir rəmzü həm faş
Ki, vəchün qiblədür beyti-mütəhhər.

Ləbün camindən içənlər dirilür,
Anunçun istərəm andan mükərrər.

Bana der Gülşəni kim, Rövşənidən
Cəhanda görmədim eşqli sərvər.

* * *

36. Yüzün görmək gözümün vayəsidür,
Baxub can vermə ömrün mayəsidür.

Gözümdən düşən ol xali-siyahun
Günəşpərvər qılur, ay dayəsidür.

Nə var qəddündən ə'la Sidrə, ey sərv,
Çü ərş ol qəddün əvvəl payəsidür.

Görən gün kimi yüzdə alnun ayin
Bilür məhü mehr olan həmsayəsidür.

Denəlüb dürsifət mehründə yulduz
Görünməz zərrədən kim, sayəsidür.

Arıt, ey dil, könül evini candan,
Çu dilbər girübən arayasidir.

Verüb canın könül, sevgüni aldı,
Anunçun mehrin anun ayəsidür.

Görən Məcnunsifət, ey Leyli, halım
Yenidən aləm içrə yayəsidür.

Qayırma, ey könül, qəhr etsə dilbər,
Çü lütf edüp rəvan oxşayasıdır.

Tök, ey gözüm, yaşun mehr ilə dildən
Ki, dürr tökmək gözün sərmayəsidir.

Bulubdur Gülşəniyə Rövşənidən
Ki, gündən rövşən anun sayəsidir.

* * *

37. Eşqün bəni şuridə qılub, gör nələr eylər,
Sevdayi sifət əqlüm alub bixəbər eylər.

Məcnun kimi divanə könül "Leyli" deyübən,
Hər gördügünə hey bihi andan həzər eylər.

Bir sorun axı neçün alup könlümü dilbər,
Mehr ilə rəvan mehr kibi dərbədər eylər.

Bəndən nə dilər yanmaq içün bu dili-pürsuz
Kim, dəmbədəm ürküp canım ondan həzər eylər.

Rövşən qılubən gözlərümi mehr ilə ol mah,
Qoyub qədəmin Rövşənidən rəhgüzər eylər.

Qəhr etmə dilər bana, rəqibə qılubən lütf,
Ol şuxi-bəla zəxminə canım sipər eylər.

Qəddinə desəm sərvi-rəvan, qəhr edübən der
Kim, gördügi var cani tənə sərbəsər eylər?



Rövşəndil olan dedügümi, halumi görüb
Bilür ki, bana cövrü cəfa ol bisər eylər.

Göz səgriyüb, oynar yürəgüm mehr ilə hər dəm,
Tən çimçişübən canə rəvandan xəbər eylər.

Pərvərdə qılan Gülşənini Rövşənidən mehr,
Gün kimi görən eyni-əyandan nəzər eylər.

* * *

38. Eşqin bana, ey şuxi-bəla, gör nələr eylər?!
Sövdayi sifət əqlüm alub bixəbər eylər?!

Dəlürübəni dağə necə düşməsün, ey can?
Çün əqli gedür, hər kim sana bir nəzər eylər.

Yerüyəməzəm, bidilün, ey dilbəri-məhru,
Kuyində görür bibakini hər kim güzər eylər.

Eşqün yoluna necə qədəm qoya olar kim,
Şərbətinü caninə başdan həzər eylər.

Gün gördigiçün yüzünü hər sübhdəm, ey məh,
Başın ayağə salıbanü dərbədər eylər.

Eşqinə könül verəlidən sanadım, ey şux,
Qeyrin eşidüb-görməsini kurü kər eylər.

Eybin görəməz sevdüginün aşiqi-bidil,
Çün eybin anun gözinə sevgü hünər eylər.

Zövq edənə şövq ilə ğəmündən necə deyim?
Könlüni onun hüllə, ğəmün kədər eylər.

Gün kimi yüzün Rövşənidən, Gülşəni, görən
Ay kimi cəhan xəlqinə nuri-bəsər eylər.

* * *

39. Könül sana verənlər canı neylər?
Dəvasız dərdünə dərmanı neylər?

Başın tup eyləyən eşqin yolunda,
Ayaxdan özgə ol çövkanı neylər?

Sana bəndə olan Misrində hüsnün,
Degil Yusif kibi sultanı neylər?

Könül aqilinə şah oldu eşqin,
Ona qullux qılan xaqanı neylər?

Könül qan içdügin tökəndə gözdən,
Gözüm tifli kimi giryanı neylər?

Düşüb mehrünlə dil qınasa gözüm,
Cihan qərq etməgə tufanı neylər?

Bişürən xam ikən mehrünlə bağrın,
Kəbab edüb cigər, büryanı neylər?

Dəhanun dürci-gövhərdür desələr
Ləbi-lə'lündən özgə kanı neylər?

Soran cəhlü mürəkkəbdən dəm uran
Ki ol elmi ilə irfanı neylər?

Görənlər Rövşənidən Gülşənini
Dəlilü hüccətü bürhani neylər?

* * *

40. Vüsalun istəyən, billah, əcəb fikri-məhal eylər,
Çıxan başına sövdadan ələ girməz xəyal eylər.

Sana könül verən bilməz məgər kim, ey pəri, halın
Ki, görən halını anun qılubən tə'nə, qal eylər?



Neçə bidilləri gördüm dönüb Məcnunə eşqündən,
Səni sanuban özündən cəvab içün sual eylər.

Görən iqlimi-hüsn içrə ziyayi-vəchün, ey məhru,
Günəş kimi cəmalundan özin dürrə misal eylər.

Yüzini nagəhan görən könüldə bir nəzər, ey məh,
Alınmayub anı netsün özündən, çünki al eylər.

Nə surətdir ki, sevübən məhəbbətdən mürid anı,
Şühudi-ğeyb içün biçün cəlalindən cəmal eylər.

Sevübən sevdürən özün iki sanmayasan, birdir,
Çıxan nöqsanını fərqün o həqq içün kəmal eylər.

Günəş yüzünə vəchüni məgər bənzətmək istər kim,
Başına qeyrəti vəchün, kəmalini zəval eylər.

Nedim şəh Rövşəni deməz bana, ey Gülşəni, sorsam,
Nə vəch ilə məhəbbətdən gəhi bədrin hilal eylər.

* * *

41. Talib isən verme şeyxünə kədər
Kol kədərdən döndürür səndən nəzər.

Ğəlü ğəşdən aridi gör könlünü,
Çünki qəlbi safdür, safi sevər.

Baxma inkar ilə pirün yüzinə
Kol nəzərdən rədd olunan bixəbər.

Ğürrə olma qəhr edən dəm pir əgər
Lütf edübən yüzünə baxub gülər.

Nəqdi-qəlb içün məhəkdür qəlbi-pir,
Saxlayuban qəlbün andan qıl nəzər.

Eşidüb anlamadun nə dedügin
Sadədil taliblərə xeyrül-bəşər.

Dedi müxlis çün xətər vardır əzim,
Bəs nədən sən fariğ oldun bixətər?

Cəhlüni elm edüb, ey talib, sana
Nəf'üni zər etməgil, xeyrüni şər.

Rövşənidən eşidürəm, Gülşəni,
Sadədil olanı pir candan sevər.

* * *

42. Cahanda Rövşəni nisbət kimün kim, rəhnüması var,
Günəş kimi baxan görür anun rövşən ziyası var.

Əcəbmi Rövşənipərvər günəşdən bəxtülü olmaq,
Yədi-beyzayə nisbət çün təcəlladən sənası var.

Görənlər Rövşəni vəchün ziyadən Aydın elində,
Bilür kim aydın edinən kimün nurdən liqası var.

Degil yıldız kimi bir-bir geyənlər Rövşəni tacın,
Neçə hadi olub xəlqə zəlalətdən hədası var.

Kəramət xirqəsin geyüb, mükərrəm olanı bildim,
Ziyadan Rövşəni kimi kimün aldan əbası var?

Girənlər Gülşəni kimi həqün doğru təriqinə,
Bilür ol rövşən, ayyüzlü o gəncə müqtədası var.

* * *

43. Bəla den sorana eşqi, bəladur,
"Bəla" der hər kim ana mübtəladur.

Çəkən eşqün bəlasın gecə-gündüz,
Bəlanun aşiqinə əs-səladur.



Bəla darın dilər Mənsuri eşqün,
Çü dərdinə anun daru-dəvadur.

Mərizi-eşqə səhhət sorana den,
Ölümün şərbəti ana şəfadur.

Bəladur lütfi eşqün talibinə,
Vəfası çün ana eyni-cəfadur.

Bəladır püxtə qılan xam olanı,
Ol oddan püxtəlik xamə ətadur.

Bəladur, Gülşəni, qəlbün cilası,
Günəşdən rövşən edən ol ziyadur.

* * *

44. Görənə adəmi-eşqi, derəm, insanə məhrəmdür,
Anı görən vəli bəndəm cahanda çox degül, kəmdür.

Cüneydü Şiblivü nuri-bəşərsiz adəmi-eşqi
Yaqundan görübən şəksüz, dedilər ibni-Adəmdür.

Görənlər adəmi-eşqi bəşər deməz, pəri nisbət
Mələk dəxi deməz, çünki o dəmdə həqqə həmdəmdür.

Eşidüb limallah neçün inkar edər münkir,
Bəşərsiz adəmi-eşqə ki, gər tanıdən əkrəmdür.

Ənasirdən hənuz adəm vücudi elm ikən eynə
Görən özüni ünsürsiz mükərrəm olan adəmdür.

Əmanət həmli neydügin vücudin elm edən bilür
Ki, aləmna sifat ilə mürəbbivü müəllimdür.

Görənlər adəmi-eşqi əmanət sirrini bilür,
Odur üləması əsrün ki, əqranindən aləmdür.

Bilənlər adəmi-eşqi bəşərsiz Gülşəni nisbət
Günəşdən zahir ol bina zəmanında müsəlləmdür.

* * *

45. Eşqə könül verməyən can ilə aşiqmidür?
Kizb ilə hər müddəi də'visi sadiqmidür?

Eşqə könül verməyən, sevgilü can almayan,
Yoxluq ilə gəlməyən varlığa layiqmidür?

Eşqi səlah edübən, zəhdi fəlah etmiyən,
Talehi tərk edübən salehə lahiqmidür?

Eşq ilə me'racini qılmıyana, ey sə'ni,
Derəm eşitgil bunu lahiqə sabiqmidür?

Eşq ilə sayruluğun bilməyənə sağlığın
Soraram, etsün məyin teyb ilə haziqmidür?

Müşkilüni soruram, sanma düşəm, yürüyəm,
Əbdi-həvaçün derəm bəndeyi-xaliqmidür?

Rövşəninün, Gülşəni, eşqinə can verməyən
Leyliyə Məcnun olup, Əzraya Vamiqmidür?

* * *

46. Aşiqə təklif edən əql ilə divanədür,
Əmri anun nəhy ilə mühməlü əfsanədür.

Eşq ilə dəlürməyən, usluluğun bilməyən,
Özün anun qılmayan, sanma ki, fərzanədür.

Dəlüligüm eşidün, əql ilə fikrüm qılun,
Dərdümə dərman bulun, deməgüz uslanadur.

Eşq ilə bilişübən əql ilə yad olmayan
Olmaz imiş aşina eşq ilə biganədür.

Müstəhəbbi-eşqə var, tərk edübən ixtiyar,
Çünki olan bəxtiyar yeri o meyxanədür.



Kim ki görər eşq ilə yanduğumu, rəşk ilə
Der bana kol mehr ilə yanə gərək, yanədür.

Eşq ilə nərgis kimi qanımı içən müdam
Kami-ləbi saqidən dövr ilə peymanədür.

Surəti-eşqi görüp mə'ni yüzündən derəm
Sorana vəchin bana kol gözü məstanədür.

Rövşənidən mehr ilə Gülşəni nisbət yanan
Bilür onun şəm'inə canımı pərvanədür.

* * *

47. Aşiqə tə'n eyləyən əql ilə divanədür,
Qali anun halinə hərzəvü əfsanədür.

Eşq ilə Məcnun olan, valehü məftun olan,
Haləti biçün olan aqili-fərzanədür.

Eşq ilə alışanun, yad ilə bilişənün,
Vəhdətə ulaşanun kəsrəti biganədür.

Eşqə könül verənin, sevgilü can alanın,
Cismini sormun anun, can ilə cananədür.

Eşq ilə cuş eyliyən, camini nuş eyliyən,
Şövqi-Süruş eyliyən sakini-meyxanədür.

Yeddi fələk ay olu, san xümi-meydir dolu,
Ay ilə gün birgəlü dövr ilə peymanədür.

Rövşəninün şəm'inə yanmayubən neyləsün,
Şövq ilə den Gülşəni çün ana pərvanədür.

* * *

48. Gəl, ey Misri-dilim sultanı dilbər,
Əzizi canımun, cananı dilbər.

Günəş kimi nəzirün yox cahanda,
Mələksima, gözəllər xanı dilbər.

Cahan xublarınun təndə rəvanı
Bilindi səndən imiş canı dilbər.

Müazallah ki, edəm səndən özgə
Dəvasız dərdümə dərmanı, dilbər.

Yanubən həsrətündən axıdurəm
Gözümdən yaş yerinə qanı, dilbər.

Dilərəm sanıyum hüsnün hesabın,
Hesabsız gördüm ondan sanı, dilbər.

Cahanda Rövşənidən özgə degil
Bana, ey Gülşəni, sən xanı dilbər.

* * *

49. İstər idim buldum uş, həqqi-yəqin bəndədür,
Sanma derəm bən sana bəndə olan təndədür.

Cəhd edüb itür səni, görmə dilərsən anı,
Görmiyecəksən səni, istədügün səndədür.

Tərk edübən canuni təndə rəvan anı qıl,
Şirinübən sanmağıl istənilən candadur.

Yoxdur ana bil məkan, bir olubam kün-fəkan,
Nə der isə hər zaman bicəhət olandadur.

Candan eşidüb sözin, görmə dilərəm yüzin,
Gördüm o həkim gözin sultan ikən bəndədür.



Etmiyən özin ədəm, bulmadı payəndə dəm,
Ol dəmdə irən bu dəm bəndəyi-fəxrəndədür.

Ərşi-həqq olan dili qütbi-zamandur, vəli
Sultan olan şəh qulu şahlığa ərzəndədür.

Əqli-küllü nəfsi-küll ondayimiş istə, bul,
Bimənü ma, cüzvü küll bəndəyi-pərvərdədür.

Eşq ilə sultanlığı Gülşəni, bil, ey cəvan,
Rövşənidən bəndənün bəndəsinə bəndədür.

* * *

50. Könül kim şövqi-eşqün pərtəvidür,
Yəqin bil anı kim həqqün əvidür.

Nə tən kim nərm ola eşq ilə candan
Ana can den, çü canan pərtəvidür.

Nə can kim eşq ilə pərvərdə oldu,
Cəhani köhnənün cani-nəvidür.

Nə yerdə tursa bir xubmənzər,
Könül ana verüb candan səvidür.

Günəş kimi görən eşqün cəmalın
Bilür ay ol ziyanun pərtəvidür.

Behişti danədür çün xali-vəchün,
Möhübbət xirməni anun cəvidür.

Çıxargil, Gülşəni, mehrini dildən,
O dəm gör Rövşəni eşqün əvidür.

* * *

51. Ey taliblər, edün bana mətlub məqami xandadur?
Dildəmidür o biməqam, ya can içində candadur?

Gerçək aşiq qanı mə'şuq məqamından xəbər verə,
Gərçi məqam yoxdur ana, nerdə denilsə andadur.

Hər kim könül eşqə verür, mə'şuq yüzin şəksiz görür,
Eşqi yəqindən ol bilür sanmıyasuz gümandadur.

Candan açan könül gözin, görər eşqün şəksiz yüzin,
Eşq əhlindən oldur güzin mə'şuqdən fərmandadur.

Mə'şuqü aşiq, eşqi bir görəndürür bina, bəsər
Bir görməyən anma zərur, kafər sanur imandadur.

Həq ərinə bənəm dedi, varlıx verübən izidi,
Qüdsi hədisi sarmadı, həm vəhy olan Qur'andadur.

Ey Gülşəni, eşqə irən hər kimsə ki, oldu ərən
Bişəkk yəqindir bu, inan, həqin varlığı andadur.

* * *

52. Yenə ol Yusifi-sani, gəlür derlər, gəlür derlər,
Gözəllər Misri sultani, gəlür derlər, gəlür derlər.

Gözüm səkrir, qulax çınlar, eşidübən könül inlər
Ki, candan sevgilü dilbər, gəlür derlər, gəlür derlər.

Bəni bəndən alan meyli, gözümdən axıdan seyli,
Könül Məcnuninə Leyli, gəlür derlər, gəlür derlər.

Əgər bir dəm qalam ansuz, oluram guyiya cansız,
O dərdi bana dərmansız, gəlür derlər, gəlür derlər.

Neçə bir intizarından, soram den sərgüzarından
Eşidürəm çü varından, gəlür derlər, gəlür derlər.



Düşəli arayə firqət bişürdi bağrımı həsrət,
Kimə sorsam o bimürvət, gəlür derlər, gəlür derlər.

Eşidüb Rövşənipərvər, könüllər mülkinə sərvər,
Yetənə Gülşəni sorar, gəlür derlər, gəlür derlər.

* * *

53. Bivücudəm, eşq odu bilsəm bənüm nəm yandurur?
Yanubən külli kül oldum, bəs dəxi nəm yandurur?

Yandurur gərçi cəhanda eşq odu aşiqləri,
Leyk bəndən dil rəvani qati möhkəm yandurur.

Ah edərsəm bir nəfəs dünyayi oda yaxuban,
Yedi çərxi anun odu cümlə der həm yandurur.

Şəm'ə bir pərvanə yansa suzişi avaz edər,
Mə'şuqun suzi rəvanum ondan əpsəm yandurur.

Ey cigər dərdinə dərman istəyən, əqlün qanı?
Ögülürmi şol yara kim, anı mərhəm yandurur?

Çünki dərd imiş dəvası bu yürək yarasının,
Daxi əmsəm istəmə, kim anı əməm yandurur.

Rövşəni eşqinə yanmışdır cigər der: – Gülşəni,
Eşq odi pərvanə nisbət anı hər dəm yandurur.

* * *

54. Kim edər kim tənün gülzarə bənzər,
Çü gülzar ana görə xarə bənzər.

Yanağundan təcəlli buldu Musa,
Anunçün gördi nuri narə bənzər.

Yüzündür müshəfi hüsnün təmamət,
Necə deyəm ana siparə bənzər.

Nəzirün gün kimi yoxdur cəhanda,
Əgər məh desəm ol rüxsarə bənzər.

Bəşərdə yox nəzirün, həm mələkdə,
Pəri desəm sana bir parə bənzər.

Nə gündən gecə düşmüş qədrə nisbət
Saçun kim tabişi ənvarə bənzər.

Görən çinini zülfün Xütənində
Edər bu müşki-Çin tatarə bənzər.

Neçün nərgislərün saqlıqda sayru,
Əlil olan kimi bimarə bənzər.

Gəl, ey zahid, burax əldən əsayi,
Çü sehr ilə düzülmüş marə bənzər.

Riyayilən qılanun həqqə taət,
Əlində təsbihi zünnarə bənzər.

Səfasız talibün ciddilə cəhdi,
Bu sevdakar içün bikarə bənzər.

Gözün seyd etdügi könlümi budur
Ki, qanımiçici xunxarə bənzər.

Nə var zülfün kimi qıyadun, ey can,
Sərasər damü bəndü tarə bənzər.

Görəldən ay yüzə zülfün niqabın
Derəm bu pərdəyi-səttarə bənzər.

Könül vermə sevüb məhbubə zinhar,
Sanuban eşq işi hər karə bənzər.

Nə var mehrün kimi dilpərvər, ey məh,
Ki, can verüb deyəm dildarə bənzər.



Günəş bir zərrədür yüzün günündən,
Necə deyəm məhü istarə bənzər.

Görüb vəchüni zahid səcdə qılmaz,
Həqə münkir çü ol ğəddarə bənzər.

Nə var cadu gözündən özgə rövşən
Ki, ol əyyari-fənni biçarə bənzər.

Rəqibüm həsrətündən ğəm yer ancaq
Ki, der həm yüzi bu timarə bənzər.

Görən dür kimi ağzunda dişün der:
– Bu bəhrün incusi şəhvarə bənzər.

Yanağunun nəziri yox, görüp ta
Dəmə, ey gülrux, ol dildarə bənzər.

Görübən Gülşəni hüsnün gülini,
Deyəməz ol gülü gülzarə bənzər.

* * *

55. Aşiq olanlar bilür sirr ilə faşum nədür?
Başdakı sevdayilə gözdəki yaşum nədür?

Eşq ilə yürək qanın içməyənə nə deyim?
Qan yuduban dəmbədəm zövqi-məaşum nədür?

Öldürübən eşq ilə nəfsimi dirilmişəm,
Bəs degüz anun ilə daxi səvaşum nədür?

Eşq ilə başdan keçən qor imiş ayax yola,
Ol yola ayax qoyub eşq ilə başum nədür?

Göz açuban gün kimi mehr ilə degil bana
Ay kimi yüz görmədən dildə xəraşum nədür?

Eşq ilə olub şəhid bulanacaq qanına,
Görübənü kisvətin sorma fəraşum nədür?

Rövşənidən sorana Gülşəni verür cəvab,
Aydın elindən olan sirrlə faşum nədür?

* * *

56. Eşq ilə yola girən məqsudinə irişür,
Oyalanan əql ilə hərzə yerə duruşur.

Əql ilə yola düşüb oynanuban aşiqə
Əxsəğ deyü gürgsifət bir-birilə yarışur.

Qal ilə münkir olan hal ilə aşiqlərün
Tə'n edübən zikrinə fikri ilə irişür.

Tə'n ilə şeytan kimi münkir olan zakirə
Küfrini iman bilüb, eybü hünər soruşur.

Aşiqə "aqil ədu" dedügimi tanlaman
Div ilə adəm qaçan həmdəm olub barışur?

Münkirə inanmanuz, aşiq ola sanmanuz,
Əql ilə eşq işinə gərçi uyub qarışur?

Vaizi-bimə'rifət düşmənidür aşiqin,
Anun içün Gülşəni arif ilə uruşur.

* * *

57. Dilərsən mə'rifət, imanun artur,
Ölüb eşq ilə diril canun artur.

Demə cəhl arturən elmünə daniş
Özün bilmək içün irfanun artur.

Dilərsən söndürəsin damun odun,
Gözün yaşını tök, tufanun artur.



Dəvasız dərd imiş dərmani eşqün,
O dərdə bidəva dərmanun atur.

Sana kibrü mənə üсbü həvadən
Büt edübən yetər şeytanun artur.

Salub cəhlini elmün eyn edübən
Həqiqətdən həqə iqanun artur.

Könül ver Rövşəniyə Gülşənivəş
Məhəbbət mehrilə ehsanun artur.

* * *

58. Hər ki bilür adəmə nəfx olunan dəm nədür,
Ruhi-qüdüsdən olan ol bilür adəm nədür!

Aşiqü mə'şuq olan, sevibənü sevilən,
Adəm olandır bilən Həqqə mükərrəm nədür.

Qal ilə halın deyən, sirrini faş eyləyən
Bilmədi, eşit, inan, eşq ilə məhrəm nədür.

Ağü qəradən qaçan, vəhdət ilə cam içən
Nə bilə ol, den bana, kəsrət ilə kəm nədür?!

Yaslu kimi göz yaşın tökənə yazü qışın
Dərd ilə dərəm, bilür sur ilə matəm nədür.

Münkiri-şumun sözi tə'n ilə eşq ərinə
Ağudan acı, anı dadana sordum nədür.

Rövşənidən Gülşəni yanubənü, ey səni,
Köçübəni dün güni ğəm ilə vərhəm nədür?

* * *

59\. Könül çün eşqünə, ey can, düşüpdür,
Cəfa cövrün bana həddən aşubdur.

Cəhanda möhnət olandan nə varsa,
Bana dərdündən, ey məh, irişibdür.

Sənün rəşkün ilə qovğayi-aləm,
Başuma arudən bədtər üşüpdür.

Kimə deyim tükənməz dərdi səndən
Ki, cövründən canumə ulaşubdur.

Xiyalundan başum sevdayi-xamın,
Dönə-dönə derəm kim, bişirübdür.

Nə sevdadur başuma biləməzəm
Ki, əqlüm eşqün ilə şaşırubdur.

Çəkənlər Rövşənidən, Gülşəni, baş
Kəsilübən ayağına düşübdür.

* * *

60\. Ay ilə gün birdən iki səridür,
Şəriətlə həqiqət mültəvidür.

Şəriət tərkin uran mülhidə den
Dönüb şeytanə, məxluqun dividür.

Eşidüb əf-əfin kəlpün soran dəm
Edərlər münkiri-həq əv-əvidür.

Görən dəm itsifət münkiri bilür
Qapularə derəm dəylüp çəvidür.

Çü çifə talibidir münkiri-səg
Xəbisi-çiz, derəm, yaxşı kuyidür.



Eşidən münkirül-batil sözini
Həqqə nisbət bilür kim hərzəvidür.

Bilən suratlə mə'ni, cəm'ü fərqin
Bilür ta cəm'ü fərqi məsnəvidür.

Məhəbbət aləmi dildür, dili bil
Ki, köhnəlməz, cəhanun ol nəvidür.

İki aləm dilə məzrə' olalı
Əkilən xərməninün bir cəvidür.

Görən Şirinsifət hal aləmini
Dili bilür o mülkün əzrəvidür.

Günəş nisbət ziyadəndür cəhani
Ki, rövşən cüzvü küllün ol zəvidür.

Dil istə cəm ilə fərqin qılü tey
Çü fərq ol cəm olanun pərtəvidür.

Nedim, ey Gülşəni, şəh Rövşənidən
Nə desəm, surət içrə mə'nəvidür.

* * *

61\. Girənlər gülşəni-eşqə özün bülbül, hezar edər,
O gülşən əndəlibini fəğandan naləzar edər.

Gülüstani-məhəbbətdə ötən dəm bülbüli eşqün
Eşidən naləsin anun özün candan həzər edər.

Səkkiz cənnət dedikləri möhübbətdən behişt imiş,
O ədni istəyən aşiq yeddisin rəhgüzar edər.

Görənlər bir nəzər eşqün gülüstanun möhübbətdən
Töküb qanlu yaşın gözdən, yüzüni laləzar edər.

Açıla bir güli eşqün müvəddət gülşəni içrə,
Anunçun gülşənin anın həzaran mürğizar edər.

Məhəbbət gülşəni içrə şəhidi-eşq olan, qəbrin
Təvafi-Kə'bəyə nisbət mütaf içün həzar edər.

Gülüstani-məhəbbətdən olan pərvərdə eşq ilə
Dönübən dərdinə eşqün cəmalin gülüzar edər.

Müvəddət gülşəni içrə qılan pərvərdə könlüni
Xəçən gül nisbət özini tikəndən xarizar edər.

Görənlər Gülşəni halın məhəbbət pərvərişindən
Edər gör Rövşəni eşqin nə vəch ilə, nəzar edər.

* * *

62. Könüldən talibə həqdən nidadur,
Məhəbbətdən nəmaz içün səladur.

Uyan eşq ilə vəhdətdən nəmazə,
Ana kəsrətlə qılmaxlıx bəladur.

Vücud ilə qılan kəsrət nəmazin
Rəva deməkana çün nə rəvadur.

Eşitdün rədd edər föhşahü münkir,
Nəmazuni kim ol dəxi xudadur.

Səladan dedi: "silə nedügin anla
Ki, həqdən müxlisə andan nəvadur".

İmami xas olan xəlq ilə həqqün
Hidayət aləminə müqtədadur.

Xilafətdən nəmaz olan imami
Məhəbbət aləmində Mustəfadur.



Ulu ə'zəm olanə sor nəmazi
Ki, olan istifadən əsfiyadur.

Kəramətdən bulan ixlas-məhəbbət
Mükərrəm xasi-həqq həm ətqiyadur.

Nəmazini niyaz ilə qılanlar
Məhəbbət aləmində övliyadur.

Soranə Rövşəniyi Gülşəni der:
"Hidayət aləmində rəhnümadur".

* * *

63. Həqdən özgə kim bilür adəm nədür,
Ana nəfxi-ruhənadən dəm nədür?

Sirr olan qüdrətdən Adəmi həyy dəmi,
Nəfx olan dəmdən dəmi-iqdam nədür?

Adəmi dəmdən ğəni qüdrət vücud,
Dəmdən əqdəm adəmə həmdəm nədür?

Dedi: "Bəndən özgə həqq ol adəmi",
Kimsə bilməz dəmdən adəm dəm nədür?

Dəmdən özgə sirrinə ol adəmün
Sirr məhəllin kim bilisər məhrəm nədür?

Kim bilür qüdrətdən Adəm sirrinün
Hikmətin, dəmdən dəmə münzəm nədür?

Sevübən sevdürən özin eşq ilə
Birdən iki vəch ilə vərhəm nədür?

Əvvəl-axır zahirü batin şühud,
Ani şandan dövr ilə müdğəm nədür?

Binəhayət kəsrət ilə vəhdətün
Dövr ilə seyran, bişü kəm nədür?

Nütfəyi-qüdrət müqəddəs Adəmə,
Ana olan atasuz Məryəm nədür?

Yeddi göz qətrəsi dəm bəhrinün
Kim bilür bir qətrədən ol yəm nədür?

Rövşənidən Gülşəniyə soraram
Ki, dəmi-Adəmdən əqdəm dəm nədür?

* * *

64. Səqəl yoldurana demən qələndər,
Təraş eyləmədən özüni yeksər.

Qələndər der təraş edən vücudin
Qomayub bir qıl ondan qalə davar.

Qələndərdür təraş edən sərü riş
Utanmadan özünə hər gəda xər.

Qələndər derilür hər qarnıquli
Sığır nisbət edüp nəfsini pərvər.

Qələndər ana den gedə cəmalın,
Günəşdən məh sifəti nur ilə nar.

Qələndərdür bulan fəqr ilə fəxrin,
Qəniyyül-qəlb oluban etməgil cər.

Qələndər deyəməzəm ölməyənə,
Qərəzsüz biərəz pakizə cövhər.

Qələndər necə deyim hər gədayə
Ki, qoyur baş ayağə diləyüb fər.



Qələndər surəti mə'niyi-qələndər,
Çü mə'nidən olur surət qələndər.

Qələndər demə görüb hər gədayə
Kolupdur bihəya zən nisbət ol nər.

Qələndər Rövşəniveş Gülşənidür,
Günəş nisbət cəhanda fərdi-kişvər.

* * *

65. Çox istədüm, bənüm kibi bulunmaz eşqə kirdar,
Edəm ta ki, möhübbətdən bana həmdəm sifət qəmxar.

Sınadum yaru kim, deyən bana yar olduğun bir-bir,
Neçə bir təcrübə edəm, qılub həmdəm bana təkrar.

Ğərəzdən yarunəm deyən olur düşmən bana axır,
Ədavətdən dilər qanum töküben içə ol xunxar.

Ğərəzdən həmdəmim olan bana nuşini niş edüb,
Dilər səncə rəvanini dönübən əf'iyə ol mar.

Nedəm yar istəyüp çünki bulunmaz biğərəz kimsə,
Çü olur yar kəm deyən ədavətdən bana əğyar.

Ğərəzdən çoxları gördüm səid ikən şəqi olur,
Edüb iqrarini rəvan bütlan ilə inkar.

Ğərəz ümmül-ğəza demiş görüp məzidlərin, bildün,
Edindim hər fəsad əhli qılan dəm şərrini izhar.

Münafiq, münkirü mürtəd ğərəzdür çoxları edən
Ki, andan müşrikə dönüb olur cüz-küll nəcis murdar.

Ğərəzdür qəsvəti qəlbün, dönər daşə ki, yumşanmaz,
Edindüm cəhl ilə ondan həmaqət elminə izhar.

Ğərəzdür nəf' ilə xərdən nə etsə aləmin xəlqi,
Odur çün xeyr ilə şərdən olan kirdar için sərkar.

Ğərəzsüz Rövşəni nisbət bulunmaz, Gülşəni, nedim,
Edəm ta biğərəz anı sana eşq ilə həmkirdar.

* * *

66. Hər kimün "lövlək"ə sirri iç ilə daşindədur,
Səltənət tacı əmirün sevgilü başindədur.

Gözlərindən rövşən olur çeşmi-mazağül-bəsər
"Qabi-qövseyn"ə işarət göz ilə qaşındədür.

Kəm ömr ilə yaşın ol İlahi məzhərin
Çün əzəl kimi əbəd həm əmr ilə yaşindədur.

Aləmi-hüsnə məlahət pərvəriş verən ğida,
Şövq ilə şirin məzaqun sevgilü aşindədur.

Sorar hüsni ğənasın, hər fəqirə buni der
Kol əna fəqr ilə rindü urun qəllaşindədür.

Rövşəni, zövqin istə sən Gülşənidən şövq ilə
Çün şəkərdən datlu anun zövqi əyyaşindədur.

* * *

67. Yüzün həqdən qismi-şəmsi-zühadır,
Məhəbbətdən həbibi-kibriyadır.

Saçundur leyli qədrün, ey pəriru,
Ki, bin edən xeyirlü şəbnümadır.

Cəmalun qibləsidir Kə'bəyi-can
Ki tövqi-fərzi eyni-rəhnümadır.

Təvafi-kuyin edən mərdə nispət
Yəqindən bişəkk ol sahibsəfadır.



Günəşdən rövşən olur billah, ey məh,
Nə göz kim kurdur, ahun tutiyadır.

Könül Misrində hüsnünün məzadın
Eşidən der ana bin can bəhadır.

Vilayət ayinə gün kimi yüzün
Nübüvvətdən, ey məh, rövşən ziyadır.

Nəbilər sərvəri, şahi çü sənsən,
Məhəbbətdə məqamun istifadır.

Səninçün dedi həq, lövlakə, ey şəh,
Nə əmin ki, məhəbbətdən ədadır.

Məlazü məlçəyi sənsən qəmunun
Şəfaqət cüz'-külli səndən ricadur.

Əmusi Gülşəninün yöndəmində
Xilas olmağa lütfündən nəvadur.

Əbubəkrü Ömər, Osman, Əliyi
Xəlifə bin imami-pişvadır.

Demiş bir müctəhid kim, şabi-şeyxin
Kim etsə şər' ilə, qətli rəvadır.

Vəlidir cümlə əshabi rəsulun,
Vəliyi sevməyən işi xətadır.

Nəbivü Murtəza, sibtü zühədə
Xəmusi seyyidü Ali-əbadır.

Həsəndir qüdrətül-eynül-nübüvvət,
Vilayətdən həbibi Mustəfadır.

Hüseyn ibni Əli şahi-fütüvvət,
Şəhadətdən qətili-Kərbəladır.

Vilayət varisi, şahi übadın
Yəqini Zeynül-Abidin pişivadır.

İmami-ətqiya mə'sumi-Baqir
Vəlilər sərvəri, həm müqtədadır.

Əlinin varisi elmi-əməldə
Bilindi Cə'fəri-Sadiq liqadır.

Nə deyim Kazimün kəzm ilə qeyzən,
Çü həqdən kəzmə imrandan rizadır.

Qədərdən razidir Musa Rza həm,
Nə gəlsə həqdən ana, çün qəzadır.

Təqiyi-sərvilayətdən Nəqi həm
Netə kim, Əskəri-sahiblivadır.

İmami-bəhcəti-həqq, rəhbəri-xəlq,
Bilün Mehdiyi, şəksüz, müctəbadır.

Buları sevmiyən münkir, münafiq,
Xəvaricü rafiziyü bihəyadır.

Məhəbbət ali-əshabə gərəkdür,
Sevən, varan, çü məhbubi-Xudadır.

Həqin sevgilü qulun hər ki sevməz,
İki aləmdə bil Həqdən cüdadır.

Sevən al ilə əshabın rəsulun
Həbibi-Həqq, vəliyyül-ətqiyadır.

Təəssüb tərkin uran Gülşəniveş,
Çün ondan qal edən əhli-həvadır.



* * *

68. Nədür yüzündən özgə mahi-ənvar
Kim, ondan rövşən ola həqqə məzhər.

Yüzün bayramına qurban edübdi
Qılub bismil tənum Allahü Əkbər.

Səba ğaliyə qoxudur məşamə,
Məgər zülfündən oldu ol müənbər.

Bilindi cənnət olduğu yüzün, çün
Ləbündür onda olan abi-kövsər.

Dəhanun kimi dürpərvər görən der:
"Zihi dürci-simin, pakizə gövhər".

Yüzün nurundan oldu zahir əşya,
Nə varsa görünən, ey şahi-sərvər.

Müqəddəs vəchün oldu əsli-surət
Ki, əhli-mə'na ondandır sərasər.

"Ələm nəşrəh"dürür sədrün bəyani
Züha-yüzündür, ey xurşidi-xavər.

Sənün vəchün görübən səcdə qıldı
Məlayik baş qoyub ərvahi-yeksər.

Qaşın mehrabidir beytül-ətiqün,
Yüzündür Kə'bədən qiblə müsəvvər.

Bilindi zahir olalı vücudun
Ki, şanundur sifati-həqqə məzhər.

Vücudin künhünə irmədi idrak,
Təalüllah, zehi zati-mütəhhər.

Sənün vəchündən oldu həqq əşyadə,
Nə varsa kün-fəkan ərvah olanlar.

Bu zərər cövhərüdən mə'dəni-cud,
Nə kandandır bilinməz səndə cövhər.

Günəşnisbət verər ay yüzünə tab
Təcəlli qılıuban hüsnün bərabər.

Cəmalun pərtəvidir rövşən edən
Gözün nurini, ey bədri-münəvvər.

Yüzündən zahir oldu dinü iman,
Nəmazü qibləvü mehrabü minbər.

Sənün vəchündürür həqqün kəlami,
Oxunan dəxi Qur'an anı söylər.

Ləbün zikridir, ey can, Gülşəniyə
Ki, şəkkər kimi şirindir mükərrər.

* * *

69. Yüzün çün fitnəyi-axır zəmandur,
Qiyamət qamətün andan əyandur.

Çalub cəmmadədür xəlqün dilini,
Tətərvəş gözlərün çün türkmandur.

Qaşun yüz işvə, dilin fitnədən yay,
Qurulmuş, çəkilüp tirü kəmandur.

Nə deyüm, yox dəhanun vəsfi içün,
Vücudi çün ədəmnisbət nihandur.

Nəfəs sığmaz desəm vəsf edüb anı,
Yəqindir zənn ilə, sanmın gümandır.



Görənlər vəchüni eynül-yəqindən
Bilür, şəksüz, yüzün görmək əyandur.

Çatanda qaşu gözün bir yerə baş
Görən der: fitnəyi-dövri-zəmandur.

Neçün qiblə deməz yüzün görənlər?
Qaşun mehrabi çün ondan nişandur.

Təvəccöh şeş cəhət vəchündə özgə
Yəqin sidq əhlinə zənnü gümandur.

Gəl, ey əhli-nəzər, qanıma girmə,
Bilirsən şər' ilə çün qanə qandır.

Nəzər qıl Gülşəniyə Rövşənidən,
Görəsən ta iki tən bir rəvandur.

* * *

70. Küfri-zülfi yüzdə iman göstərür,
Küfrini imanə bürhan göstərür.

Kəşfi-qeyd edüb, şəhamətdən nəqin
Surətin mə'niyi-rəhman göstərür.

Gün yüzündən zərrənisbət ağzuni
Aşikar adimə pünhan göstərür.

Mütləqi vəchün müqəyyəd qılalı
Xəlqə nisbət eyni-əyan göstərür.

Əvvəl-axır görmək içün özünü
Batini zahir qılub, qəlbi şan göstərür.

Gəh sühuf, gəh lövhü gəh Ümmül-kitab
Oxunan vəchini Qur'an göstərür.

Yazılan səb'ül-məsani xəttini
Ayət-ayət sətri-Fürqan göstərür.

Cənnətü firdövsü ədni görmüşəm
Kim, yüzündən hurü qılman göstərür.

Ğeyrətindən qeyrə göstərməz yüzin,
Vəsl umana eyni-xirman göstərür.

Bənd edüb hüsn iqlimində könlümü,
Ğeybi-çahini zənd ilən göstərür.

Keçdi ömrü Gülşəninün vəsl umub,
İrmədən vəslinə hicran göstərür.

* * *

71. Eşq ilə diriləli bildim, axı, can nədir?
Həyyi-hərir ta deyəm can ilə canan nədir?

Eşq ilə dirilməyən ölü imiş bildim uş,
Ölüyə necə deyim əmr ilə fərman nədir?

Eşqlə könül vermiyən, tənini can qılmıyan
Desəm, eşitməz, inan, qətrəyi-rəhman nədir?!

Eşq yüzini görəli dedim ələtdə: "Bəli",
Bildim əbəd, əzəli, əhd ilə peyman nədir.

Eşqə görə ey Xəlil, nə deyim etgil dəlil,
Vəsfi-siffətdən cəlil, hüccətə bürhan nədir?

Eşqi-həvanə uyub sorma yetən arizə,
Bilmədin iblis anı, sən sana şeytan nədir?

Rövşəninün dərdini can verübən alalı
Bildim, axı, Gülşəni dərdinə, dərman nədir?



* * *

72. Bana cənnət yüzündür ədn ilən hur,
Nədür vəchündən ayru xüldi-məshur.

Yüzündür qibləyi-əhli-nəzər, çün
Qəra xalun həcərvəş rükni-mənzur.

Yüzündən zahir oldu Kə'bə xəlqə,
Anunçün zülfün ilən oldu məstur.

Mətayi cümlənün yer ilə gögdə
Bilindi vəchün imiş bəsti-məxmur.

Qaçan şəbbər olur mehründən əsrük
Gözün kimi həmişə məsti-məxmur?

Çəkəldən mu qələm lövh üzrə hərfi
Qaşun hərfi kimi kim gördi məstur?

Nə hicran oldu səndən bana ruzi
Vüsalun yerinə qurtarə məqdur.

Vüsalə doymaz isən, Gülşəni, çək,
Rəvan hicran ilə dəmanimə'zur.

* * *

73. Dəmbədəm çün gözlərimdən qanlu yaş qəltan düşər,
Qətrə-qətrə san sədəfdən dürr ilə mərcan düşər.

Qönçəvəş qanım yürəkdən açılan dəmdə, degil,
Baş urub göydən yüz üzrə necə sərgərdan düşər.

Gülməyincə bəllü olmaz gülsifət yüzdən dəhan,
Çün sədəfdən dolu onda dürri-can rəxşan düşər.

Gülşənara seyr edərkən, ey güləndamım, görən
Bənzədübən gül yüzünə özümü, xəndan düşər.

Salayım, dedim, canımdan ğeyrət edüp sevgümi,
Bən nihan etsəm, könüldən suz ilə giryan düşər.

Görəli doğru əlindən qəddüni nunü qələm
İstiqamətdən dönüb beş hərfi kəc gərdan düşər.

Əhd edüp peymanuni çün sındurur, ey rəqib,
Eyləsəm şəyyad anunla, əhdara peyman düşər.

Həsri-Misr örtü bürürən guya hüsnün gülüni,
Kim içüp abın həyatun, vərdinə reyhan düşər.

Cəzb edəli mehrün ilən həlqəyi-zülfün, vəli
Tup dutub bisərü pa, zülf ana çövkan düşər.

Mehr ilə görüb cəmalun yandım, ey mehri-vərdi-gül,
Çahi-Yusif kimi canə ğəbğəbün zindan düşər.

Rövşənidən Gülşəniyə əmr imiş sevgilü can,
Anun içün dildə mehri dəmbədəm fərman düşər.

* * *

74. Hin bir biəvəz hüsn ilə dildar,
Hin varmı ki, edəm can kimi yar.

Hin bir qəlbi ari, zər kimi saf,
Dağılsun nəqdi olan pakü dinar.

Hin bir doğru, sözlü, könli ari
Ki, inkar olmuya dildə iqrar.

Hin həq sözlü qurtulmuş həvadan
Ki, qılmıya həvəsdən fikrü köftar.

Hin əhdinə doğru, qövli-gerçək
Ki, iqrar edübən qılmaya inkar.



Hin ağzun kimi incusi sulu
Ki, pərvər qıla dolu dürri-şəhvar.

Hin məst olmuyan qəflət meyindən
Ki, deyəm görübəni ana hüşyar.

Hin sındırmiyanı əhd etsə peyman
Və naəhli ki, deyim bən vəfadar.

Hin bir sirrə məhrəm həmdəmi-raz
Ka, faş etməyə razun sahibi-əsrar.

Hin insafü mürüvvət bizdə var demin
Ki, zülmi-cövr olupdur xəlqə girdar.

Hin həq verübən almax cəhanda,
Çü batillə dolupdur şəhrü bazar.

Hin bir aşinalərdən kəsilüp
Həqq ilə yar olan, özinə əğyar.

Hin bir zahidü abidü riyasuz
Ki, virdi-girdi xəlqə ola səyyar.

Hin bir Gülşənivəş Rövşənidən
Süluk seyri bilmiş sahibi-ətvar.

* * *

75. Qamətün görən əlifdən ibtidai-şan edər,
Boynun basubən şarəti-bisməli-Qur'an edər.

Nay ilə qılub tilavət, tab ilə qılur sənə,
Görübəni cim cəmalun cayun ər-rəhman edər.

Nöqtəyi-xalun xəyali xal oluban gözünə
Dal zülfün bəndə salub qeyd ilə bican edər.

Zal ilə zillət verən nəfsinə zayi-Rəbb içün,
Rayi-izzət buluban sindən özün sultan edər.

Şini-kəsrət tərk edər ol, şin əql olduğuçün
Ta ki, sadi-vəhdət anı əhlinə bürhan edər.

Bəndəlikdən Həq rizasın buluban ol Murtəza,
Za ziyadan vəchin edən dəxi taban edər.

Ta qılub teyyib qoxusun ol behişti-dilbərin
Məddi-zilin za anun gündən dəxi rəxşan edər.

Eyni-eşq edər nübüvvət aləminə eynini,
Eyni çün anı vilayət xəlqinə əyan edər.

Fi vəfadə kamil olub tərk edənlər vəchini
Qüdrətün qafından, ey can, aləmə risman edər.

Kafi-küfri tərk edəndir əhli-dinü müttəqi,
Ol ki, lami-dildə sidqi-bigüman iman edər.

Mim məbdədən meadə irkürür əhlin təmam
Mərtəbə, mənzil, məqamdan sirrini irfan edər.

Nuni-nurullah tühurin göstərübən sirri- əlin
Dönübən pərgari-dövrə nöqtədən bürran edər.

Vavü hayə irən bilür nədür feyzü cud
Kim, əzəldən layəzali şan üçün dövran edər.

Ha muyindən vücudin görsədübən şan ilə
Qüdsinün çünlügüni sevübəni an edər.

Yey yetürür xətmə əhlin, Rövşənidən Gülşəni
Lam əlif kimi ki, sanmın ikidən bir an edər.



* * *

76. Dəmbədəm sevdası eşqün əqlümi başdan qapər,
Dönübən məcnunə ondan oluram bən bixəbər.

Dəlü kimi daşa dönər oğlan-usəx göricək
Valehü şeyda bəni, aşüftə, heyran, rəhgüzər.

Soraram sərgəştə, bəndən kimsənə gördüm deməz,
Cizginən dövrandan özgə gecə-gündüz sərbəsər.

Eşq ilə rüsva, məlamət olalı canım görən
Tə'n edüp der kim, məlamət görmədün bundan betər.

Dəli-uslu olduğumu bilməzəm, heyrət budur,
Dəlü kimi uslu halum necə fərq edüb seçər.

İtirən eşqün məqamın qapu-qapu gəzübən
Gün kimi yerün yüzünə baş qoyuban dərbədər.

Bir sor axı Rövşəniyə, Gülşəni, nə mə'nidən
Gəlmədün der, gəlür olsam, dönübən sürər, qovar.

* * *

77. Qafil olan bilmədi eşq ilə halum nədür?
Söyləyicək anlamaz, çünki məqalum nədür.

Eşq ilə heyrət bulan, istəyüb özün soran
Gözün açup həqq görən bildi sualum nədür.

Oyanubən sevgilü uyxusunu tərk edən,
Düş görübən eşq ilə bildi xəyalum nədür?

Varlığın edən ədəm, yoxluğa qoyub qədəm,
Eşq ilə bilür o dəm hicrü vüsalum nədür?

Nəfs ilə qılıb cihad, bulmağa həqdən murad
Eşq ilə, ey Keyqubad, bildi qəbalum nədür?

Nəfsini öldürənə, can yüzünü görənə
Eşq ilə soran bilür rəsmi-vez-zalum nədür?

Rövşənidən görəli eşq ilə əhvalumi
Deyəməzəm, Gülşəni, nəqsü zəvalum nədür?

* * *

78. Eşqə münkir, aqilə dəlü derəm, bixəbər,
Gövdənü qulü səfih, anə nə desəm, yarər.

Yeyüb-içüb sümərdür əksəri xəlqün tənin,
Çünki əzəl dedi həqq ana eşəkdən betər.

Danlamın eşək desəm münkiri-eşqə bəni,
Ta ki tuturux qıla ol təni tari-səqər.

Oxuyuban bilmədün, nardəvü qor olayın,
Kər degilsən eşit, "Həq" dedi nasü həcər.

Yeyübənü yatmağıl sığır kimi dəmbədəm,
Səndən əgər yoğisə çoği bəqərdən əsər.

Kəlb derəm göricək talibini dünyanun,
Çünki köpək kimi ol leş gözədübən gəzər.

Dünya içün hər yana yılma yekə it kimi,
Çünki dedi: "Cifədür dünyəyi"xeyrül-bəşər.

Utub şeyi, ügüdüb xoş, qəflət olup yemə,
Ta ki görən deməsün sığırsifət yer, gəzər.

Eşidübən sən gəlü kər kimi eşitmədün,
Vəhy ilə tasər fəvaxu dedügün məgər?

Dünya içün düşübən təhlükəyə yılmagil,
Cadinü dil kimi seyr edübən bəhrü bər.



Odü su toprax bilə ömrünü sərf edübən,
Cövhəri ömrün satub alma bəha simü zər.

Doğru ikən əgrümlüp dünyəyə meyl etməgil,
Ölübənü, ey fəna, əgri yolundan azar.

Xeyir ilə şərini dünya sayar, bil anı,
Xeyrüni şərdən tanı, etməyübən nəf' zərər.

Dön, yenə duruşmagil, yanar oda düşməgil,
Hirs oduna pişməgil, qılıb ol oddan həzər.

Hirs ilə çah əjdəha olur imiş, ey fəna,
Anə olan mübtəla başinədür şurü şər.

Qaruni-mal eyliyən bu dəmdəmi ol yalan
Yüz bin ana yüdülən həsr edübən kim sayar?

Hər nə ki Həqdən irağ qıla səni, de nədür?
Həqq diləsən, batili tərk edübən qıl güzar.

Rövşəni sevmədügi hər nə isə dünyədür,
Anun içün Gülşəni sevməyüb əldən qoyar.

* * *

79. Vay əgər bu hüsnə, könlüm sormağə gəlməsə yar,
Həsrət ilə canum alur həddən aşar intizar.

Diləröm dərman edəm dərdlümə den, nedüm,
İstəməz dərmanın anın bəndən ala dərdi, yar.

Diləsən həşrini taqun nəşr ilə görmək dönə
Atlanub seyran edərkən bir zaman ol şəhsuvar.

Bir demin yüz bin görübən bədəlini dilbərin
Valehü aşüftə, bixud, həsrət ilə məstvar.

Dilərəm görmək yüzünü bir pərinin, den nedim?
Görəməzəm vechin onun olucax bana düçar.

Niş-nuşü acı-datlu, mehrü lütfin bir görüp
Xövf edərəm dilbərümin etdügindən ixtiyar.

Eşq ilə bixud olanın heyrət ilə dəmbədəm
İxtiyarın tərk edəndir sevdügindən bəxtiyar.

Rövşəninün mehri ilə Gülşənidən zar eşit,
Ön-önə qoşub ötüşür əndəlib ilə həzar.

* * *

80. Hüsnün qiyamətində həşr içün səladur,
Bədəl olan cavandan nəşr ilə mübtəladur.

Çalındı suri eşqün gər kər degilsən, eşit,
Bu nəğməvü nəvadə eşq əhlinə nidadur.

Hər dəm nəvayi-üşşaq der təntəna-tənani,
Eşitməyən bu dəmdən eşqilə binəvadur.

Zahid quru həvəsdən yüzüni yerə sürmə
Xüşk edübən tənüni, çün tapduğun həvadur.

Abid necə qılursən vəsvas ilə nəmazi,
Bilməzmisən kim, ondan, qılduqların hübadur?

Sufi riyayilə çoq sallama başun, eşit:
Zirqün tuyuldi ondan seyd etdügün xətadur.

Zənnü gümanü şəkdən qılmağ əməl yəqinsiz
Ey münkir, eşidürsən mə'zur içün rəvadur.

Çün sayrü kurü əxsəq müztər kibi degilsən,
Pəs kurü kəri-cəhlin başunə nə bəladur?



İstə səvadi-ə'zəm bu Misri-came' içrə
Anunla qıl nəmazun k'ol qütbi-övliyadur.

Cüm'ə cəmaət andan fərz oldu əhli üçün
Dilin kim, ondan özgə məqbuli-kibriyadur.

Cüm'ə güni qopar xəlqə qiyamət eşit,
Bən deməzəm buni, çün qövli-Mustəfadur.

Yusifsifət bu Misrə kimdir imamini bil,
Mə'sum olan onuntək aləmdə müqtədadur.

Adinə nolduğuni kim bilür, eşidərəm,
Adinədür deyübən çün cüm'əyə nidadur.

Adinədir əlamət kim qopurə qiyamət,
Ba həqiri-xəlq işarət k'ol gündə macəradur.

Bul yövmi-din imamın, cüm'ə bilüb məqamın,
Kamillərin təmamın k'ol xəlqə rəhnümadur.

Cüm'ə güni yəqindir, kimani əhli-dindir,
Ol sirri-dini bilən həq ilə aşinadur.

Cüm'əylə fərzi-eyni həqqül-yəqinlə qılan
Xəlqə imamü mə'sum, hadivü pişvadur.

Hər bixəbər yəqinsiz cüm'ə günün nə bilsün,
Çün o güni bilənlər məcmuyi-ənbiyadur.

Cüm'ə güni təcəlli yövmil-bəqayimiş, bil,
Kəsrətdən itən içün vəhdət dəmi liqadur.

Kövni-Rövşənidən vechini cüm'ə görən
Bilür ki, Həqqə məzhər ayinəyi-bəqadur.

Çün cüm'ənün sifati gəlməz bəyanə, leykən
Qılsam, sifati anun cami-cəhannümadur.

Çün cüm'ə din günüdür ayrılma bir dəm ondan
K'ol gündən ayrılanlar həqdən yeqin cüdadur.

Cüm'ə sanub nəmazın, kəsrətlə çoq qılanun
Təsbihü virdü girdi ol qılmadan riyadur.

Çün cüm'ə həcci dedi, müşkillərin eşitdük,
Ol sərvəri-risalət kim adı Mustəfadur.

Cüm'ə güni təvaf et miskinlərin həccini,
Çün mürdədən düxulun ol təvafçün sənadur.

Adinə həcci-əkbər görən qılur nəmazun,
Görməyən ol səlati qılmadı, çün əmadur.

Cüm'ə cəmaət ilə qılan bilür imamın,
Görüb imami-cüm'ə ol cəm' içün səladur.

Həqdən "Ələst" eşidüb, dedin "Bəli" əzəldə
Ol əhdə qıl vəfayi kim çarəsi ədadur.

Oqu biəhdi, oxu o fi biəhdiyilə
Bil fərzi-eyni sanə k'ol əhdilə vəfadur.

Əhdini sındırandur xayin əmanətinə,
Üzari-bihəqiqət azğunsifət, dəğadur.

Hər münkiri-müanid mö'min sanur özüni,
Bilməz səidə münkir, münkirü-əşqiyadur.

İslamü şərhü təqva, zəhdü səlah ilə cəd,
Vird ilə girdi-abid xudkari-övliyadur.

Cüm'ə cəmaət ilən, ey Gülşəni, qılan, bil,
Gün kibi Rövşənidən xəlq içrə rəhnümadur.



* * *

81. De bana arif isən, Həqq ilə izhar nədür?
Batinin zahir edən şanini muxtar nədür?

Vəhdətin kəsrət edüb eşq ilə yüzin görən
Binəhayət, bana de, gördügi didar nədür?

Bir ikən iki nədən görünür eyni-əyan,
Ziddünə, ağü qəra yar isə, əğyar nədür?

Əvvəl-axır de bana zahirü batin kimi sən
Yüzni görmək içün bunca tələbkar nədür?

Soraram adəm isən surəti-rəhmanə gəz,
Ğeybə inkar edübən, şahidə inkar nədür?

Nə satılub-alınur açılalı iki dükkan
Nə məta üstünə yüz bunca xiridar nədür?

Bir şey içün açılub iki dükan bey'ü şira
Binəhayət olanun satüvü bazar nədür?

Yeddi gün cizginübən yer yüzünə leylü nəhar
Nə dilər seyr edübən gərdişi-təkrar nədür?

Acı-datlu nəyisə şəhd ilə şirin bana den,
Nuş ilə nişə görə xar ilə gülzar nədür?

Küfrü iman, nərədəndür mələkü məzhəbü giş,
Mö'minü kafir olan həm təbü zünnar nədür?

Aysifət gördün isə vəchün nuri-əbədi
Gün kibi ol əbədi nurə görə nar nədür?

Xeyrü şərirdən olur nəf'lə zər bir ikən
Xeyrə görə görünən şir ilən əşrar nədür?

Yerü gög əsli nədür, ərş ilə kürsi kimi den,
Ayü gün, yıldız ikən tabişi-ənvar nədür?

İnsü cin, divü pəri bir dəm ikən kün-fəkan
İki yüzdən görünən gərdişi-dövran nədür?

Musavü Tur nədür, həm şəcərü nur nədür,
Yədi-beyzavü əsa, mö'cüz ilən mar nədür?

Den nədür sirri- "ənəlhəq" bana sübhan ilə,
Həm ol ismi deyənə riştə ilən dar nədür?

Soyunub ari olan "fərdü" "mücərrəd" der ikən,
Xirqəvü tacə görə sarduği dəstar nədür?

Sorə gör müşkilini həll edənə talibin,
Qıla asan sana, ta müşkilü düşvar nədür?

Dönüb iblisə deməgil, ana xeyrün gəlüb,
Fürsətün fövt edübən qılduğun əsrar nədür?

Adəmə səcdə neçün qıldı məlayik, de bana,
Dutuban əmrini Həqqün, ana iqrar nədür?

Sevibən nəfsini tapan, özünə büt kibi deyən
Verübən nurun ana, alduğu şeyyi-nar nədür?

Nişə yer sakin olub gögdə bulmadi qərar
Den bana sakin olan hikməti-səyyar nədür?

Nöqtəyi-məhvəri nisbət dönübən çərxi-fələk,
Dəmbədəm dövrə görə gərdişi-sərkar nədür?

Nöh fələk taqini görüb bana den bildigünüz,
Bu imarət yaradan hikməti-me'mar nədür?

Kə'bəvü deyrindir məscidü meyxanəsifət,
Bir ikən həqqün evi iki olan dari nədür?



Bana den nam ilə nəngi nə bilür aşiqü məst,
Dəlirüb eşq ilə rüsva olana ar nədür?

Deməgüz məqbulə mədbər edübən fikrü qiyas,
Bilmədən məqbül içün rədd ilən idbar nədür?

Eşidüb yarın adın bilməzəm kimdir anı,
Anun içün soraram gördügümə: "Yar nədür?"

Eşq imiş bari-möhübbət ki, "əmanət" dedi Həqq,
Götürən Gülşəni nisbət bilür ol bar nədür!

* * *

82. Bana müşkül olan halsuz vücud ilə ədəmdəndür
Ki, cüz'-küll surətü mə'ni nə vəch ilə qədəmdəndür.

"Nəfəxtü fihi min ruhi" müsəvva cism olan bilür
Ki, ol *müqəddəs dəm vücudindən nə dəmdəndür?*

Bu odü yelü su, toprax degül təxmir olan tiynət,
Müqəddəs cisminə ünsür olan ruhani dəmdəndür.

Eşidübsən "min əl-hadən" həyatini çü əşyanun
Gər duyubsan mənin anun, degil, əsli nə yəmdəndür?

Qiyamət suri kibi çün dirildir ölüyü dəmdən,
Məsihadan eşidübən kim edür kim, bu dəmdəndür?

Əzəl camın içən bilür əbəd sərxoşluğu nədür,
O meydən olmuyan sərxoş sanur camini xümdəndür?

Degil, ey Gülşəni, halun nədəndür Rövşəni ilə,
Fərəhdən hüznini görən sanur həmm ilə ğəmdəndür?

* * *

83. Nerdən alur ney dəmi, dəm əzəl adəmdədür,
Adəm isən duy nədür dəm ki, bu dəm dəmdədür.

Ney sözü budur eşit, nalə qılan dəm nə der,
Nəfx olunan adəmə həy dəmi həmdəmdədür.

İstər isən həy dəmin, beydən eşit bir nəfəs,
*Sanma o dəm daimi İsavü Məryəmdədür.*

Elmi-lədundən səbəq oxuyuban dutmə dəq,
Vəhy ilə ilhami-həq adəm olan dəmdədür.

Ney dəminün dəmbədəm etdügi fəryadə bu
Həmnəfəsüm verdüyü həqq ilə çün dəmdədür.

Arturan özin bu dəm əksilüb olur ədəm,
Ömri anun dəmbədəm artmayubən kəmdədür.

Hökmi-Süleyman yüzün istəyənə bul derəm,
Barmağına taxmağa dil kimi xatəmdədür.

Könlüm içün gözlərüm qarə geyüb yas dutar,
Boyadubən kisvətün mərdümi matəmdədür.

Könli qararmış görə bir nəzər edüb degil,
Rövşən ola ta sizə həmm deməden ğəmdədür.

Bəhri-Ədəndir məgər çeşmələri çeşmimün
Kim, sədəfindən dolu görünür ol yəmdədür.

Həsrət əlindən müdam axıdıyor gözlərün
Yaş yerinə bax, əcəb, qani rəvan dəmdədür.

Ayinəyi-cəmnüma Gülşəni mir'atidür,
*Rövşənidən güzgini sanma həmin cəmdədir.*



* * *

84. Bənüm könlüm alan dilbər gəlür derlər, gəlür derlər,
Gözəllik mülkinə sərvər gəlür, derlər, gəlür derlər.

Bənüm canumə can olan, könül mülkünə xan olan,
Quluna şahi-can olan gəlür, derlər, gəlür derlər.

Yenə hüsn elinin şahi, gözəl iqliminin mahi,
Eşidüb dərdi-dil ahi gəlür, derlər, gəlür derlər.

Nedim hər kim anı sevər, ana can verməgi edər,
Anunçun yetənə sorar, gəlür, derlər, gəlür derlər.

Dilərəm yüzini görəm, görəndə ana can verəm,
Nedim hər kimə kim soram, gəlür derlər, gəlür derlər.

Yenə ol surəti-rəhman ki oldi nəfxədan insan,
Könüllər Misrinə sultan gəlür, derlər, gəlür derlər.

Görənlər Aydın elində ziyadən rövşən edəndə
Sana, ey Gülşəni, bunda gəlür, derlər, gəlür derlər.

* * *

85. Nedim könlüm alan dilbər gedər derlər, gedər derlər,
Bəni Məcnun tək ol Leyli edər derlər, edər derlər.

Qapub əqlümi başumdən, qomadı bilgu huşumdən
Soraram yad-bilişümdən gedər derlər, gedər derlər.

Nə sevdadır deyniz bana, eşidüb qalmanız yana
Könül bəndən qaçub, ana gedər derlər, gedər derlər.

Eşitdim eşq ilə sevda qılandır aşiqi-şeyda,
Düşüb dəlü kibi tağə gedər derlər, gedər derlər.

Nedim, ey uslular, degüz, dəlürmədən ğəmüm yegüz,
Çü başdan əqlümi yaz-güz gedər derlər, gedər derlər.

Görüb eşq ilə mədhuşi, bilün aşiq o bihuşi,
Çü edin əql ilə huşi gedər derlər, gedər derlər.

Eşitdim Gülşəni sani doğaldan Rövşəniyə gün
Ziyadən Aydın elinə gedər derlər, gedər derlər.

* * *

86. Ədəm yoqdur sübutinə şəyün gənci-ğəmi derlər,
Təəyyün bulmuyan zatə vücud ilə cəfa derlər.

Hüvəl zahir ziya nisbət mütəhhərə olub məzhər,
Nə qoydi zahir etmədən ki, bilmədən anı söylər.

Ədəmlə mümtəni' qoymaz zühuri-məzhəri gülün,
Çü olmaz ziddü nədandə ədəmlə mümtəni' neylər?

Təəyyünsiz vücudini ədəmdə sabit edəndən
Soruban gənci-xəfi sirrin faş etmədi bilənlər.

Əmadə yox cəli kimi xəfi şey çün təəyyündən,
Nə desün pəs təəyyünsiz sübuti tə'bir edənlər.

Ədəmdən daxi məxfidir vücudi sabit əşyanın,
Anunçun söyləyə bilməz nədir keyfini görənlər.

Ziyayi-Rövşəni zərrə qılalı Gülşəni vəchin,
Ədəm nisbət vücudini o zərrədən güman eylər.

* * *

87. Çoq istədim bənim kibi bulunmaz eşq ilə kirdar,
Edəm ta ki, məhəbbətdən bana həmdəm sifət qəmxar.

Sınadım yarınam deyən bana bar olduğun bir-bir,
Necə bir təcrübə edim qılub hər dəm bana təkrar?

Ğərəzdən yarunəm deyən olur düşmən bana axır,
Ədavətdən dilər qanım döküben içə ol xunxar.



Ğərəzdən həmdəmim olan bana nuşini niş edüb
Dilər sanca rəvanumi dönübən əf'iyə ol mar.

Nedüm yar istəyüb, çünkim bulunmaz biqərəz kimsə,
Çü olur yarunəm deyən ədavətdən bana əğyar.

Qərəzdən çoqları gördüm sə'id ikən şəqi oldu,
Edüb iqrarini həqqə, rəvan bütlan ilən inkar.

Ərəz ümmul-fəsad imiş görüb övladini bildim,
Edən mərdüm-fəsad əhli qılan dəm sirrini izhar.

Münafiq, münkirü mürtəd ğərəzdir çoqları edən
Ki, andan müşrikə dönüb olur çüz'-küll nəhsü murdar.

Ğərəzdən qəsvəti qəlbün dönər taşə ki, yumşənməz,
Edən dəm cəhl ilə andan həmaqət elminə əsrar.

Ğərəzdir nəf'ilə zərdən nə etsə aləmin xəlqi,
Odur çün xeyr ilə şərdən olan kirdar içün sərkar.

Ğərəzsüz Rövşəni nisbət bulunmaz Gülşəni, nedim?
Edəm ta biğərəz anı sana eşq ilə həmkirdar.

* * *

88. Könül kim sevgilü Həqqin əvidir,
Çü sevdi Həqq anı, sən də səvidir.

Məhəmməd qəlbini bil ərşi-ə'zəm
Ki, rəhmani sifətlə müstəvidir.

Şəriətlə əməl qılan təriqi
Həqiqət rəhbərinin birəvidir.

Şəriətdir sirati-istiqamət
Ko'nınla yola girən dil qəvidir.

Həqqə batil deyən münkir, münafiq
Səadətsüz şəqi, gümrəh ğəvidir.

Ay ilə günsifət birdən ikisüz
Şəriətlə həqiqət mültəvidir.

Şəriət tərkin uran mülhədə den
Dönüb şeytanə, məxluqun dividir.

Məhəbbət aləmi dildir, dili bil
Ki, köhnəlməz cəhanun ol nəvidir.

İki aləm dilə məzrə' olalı
İkilik xərməninün bir cəvidir.

Görən Şirinsifət can aləmini
Dil bilür olmagun Xosrəvidir.

Günəşnisbət ziyadandur cəhani
Ki, rövşən cüzvü küllün ol zəvidir.

Dil sənə cümlə fərqün qılub teyy
Çü fərq ol cəm' olanun pərtəvidir.

Nedim, ey Gülşəni, şəh Rövşənidən
Nə desəm, surət içrə mə'nəvidir.

* * *

89. Könül eşqün cəmalın görmək istər,
Nədir keyfiyyətini andan istər.

Dilər mir'ati-eşq olmax anunçun
Könül yüz jəng, pasın silmək istər.

Könül badi-həvadən eşqə uyub,
Qərarın biqərarın bilmək istər.



Nedim könül əlindən bilməz oldum,
Çü eşqə hər nəfəs can vermək istər.

Həvayilə həvəsdən gördügüni,
Nedim, könül əlindən, sevmək istər.

Rəqibi it kibi dilbər yanından
İraqdan, "çıq", – deyübən sürmək istər.

Nedim ey, Gülşəni bu zülmət içrə
Dəmadəm Rövşəniyi görmək istər.

* * *

90. Həqqün yoluna sidq ilə girən bişək fərid olur,
Qılan inkar şeyxinə mürid ikən mərid olur.

Dutuban əmrini şeyxün qılan xidmət nə buyursa,
O qulluxdan bulub şəhlıx Cüneyidü bərid olur.

Şəqavət tərkini urub səadət yoluna girən
Dönüb yolu daş bəliyyə məqamdə Bu Səid olur.

Həqqə inkar edən kimsə dönüb şeytanə surətdən,
İnanmayub Bəyazidə, derəm, şəksüz, Yəzid olur.

Sirati-müstəqim içrə hidayətdən yola girən
İmamət buluban həqdən xilafətçün rəşid olur.

Müvəyyəs yövminə şandan eşq ölüməz cədid olur,
Vücudini ədəm nisbət məcmu' məzhər əbid olur.

Bulan qurbini aqildən məhəbbət fərəhin eyni
O eyni fərz olan dəmdə müddətdən şəhid olur.

Ləcacətdən həqqə batil deyəndir hərzə qal ilə
Ki, şeytan nisbət ol müğri zəlalətdən ənid olur.

Məgər xənnasü rüsvayə veripdir könlüni münkir
Ki, onlardan anın kimdi azanlar çün şədid olur.

Örümcək kimi fikrindən düzər fasiq xiyalini
Ki, ol damə məkəs nisbət düşən kimsə qədid olur.

Məhəbbət babının hər kim dilər açılmasın Həqdən
Bəyani-Gülşəni nisbət o qapudən kəlid olur.

Girübən Aydın elinə ay ilə gün sifət görsəm,
Ziyadən Rövşəni vəchin bana novruzü eyd olur.

* * *

91. Məhəbbət mülkinə girən həqün beytin təvaf edər,
Çü təyyüb edübən könlin təharətdən mətaf edər.

Nədür qüdsü həram Kə'bə dili-mö'minan özgə kim
Ki, həqq anub kəlamından adın "kaf" ilə "qaf" edər.

Bəsayət hərfidir qəlbin olan qəlbindən əsmasi,
Müsəmma sirridir məxfi, rümuzi-kafü kaf edər.

Əmanət sirridir məxfi rümuzi-kafü nun başəd
Ki, əlif lam ilə mim andan kitabəti-səcaf edər.

Diləyən xəlvətin eşqün məhəbbətdən vücud ilə
Ədəm nisbət məqam içrə dilindən e'tikaf edər.

Ğəzayi-əkbər istəyən qərəzsüz vəchi Həqq içün
Dilər öldürə nəfsinün həvasın, çün təvaf edər.

Həvadır çünki şeytani həvəsdən nəfsi tağinün,
O yeldən nəfsi-əmmarə həqə batil xilaf edər.

Qılan təslim ilə səddin məhəbbət eşq ilə şərhə,
Bulub vüs'ətlə sədr andan müvəddət, çün şəğaf edər.



Müvəddət eşqilə bulan süluki seyrinin xətmi
Olub mütləq-təqəyyüddən rəvanini mə'af edər.

Nedim, ey Gülşəni, eşqün məhəbbətdən rümuzini,
Deyən dəm hər qəni münkir bənümlə ixtilaf edər.

* * *

92. Məhəbbətdən zühurun bulan qüdrətdən adəmdir,
Nəfəxtü fih min ruhi dəmi-hikmətdən Adəmdir.

Əzəlsüz biəbəd məzhər vücud ilə ədəm nisbət,
Müqəddəs anü şan ilə olan fitrətdən adəmdir.

Nə əvvəl var, nə xud axır məhəbbətdən zühur ilə,
Olan batil sifət zahir xəmu ruyyətdən adəmdir.

Əmanət sirri neydügin sorana eşq ilə bir dəm
Məhəbbətdən zühurini bulan qeyrətdən adəmdir.

Bir ikən ikiyə nisbət edən qeybin şühudini,
Sevübən sevdürən vəchin xəmu manəndi-adəmdir.

İki aləmdə bir yüzdən olan mir'ati cüz', küllün
Qılan dəm kəsrətin vəhdət, demək, surətdə adəmdir.

Təcəllin məzhərin içün tükənməz vəch ilə andan
Nəhayətsüz şeyün ilə olan rətbindən adəmdir.

Məlayikdən olan ə'ləm cüzü küll ismini bilür
Müsəmmadan bəyan edüb verən xeyrətdən adəmdir.

Cəhani-eşqi xəlvətgah şəhadətsüz görən bilür,
Məhəbbətdən sevüb vəchin edən xəlvətdən adəmdir.

Bulan fəqr ilə fəxrini ğinadən zarəsi nisbət
Təqəddüsdən bilinməyən xəfi qürbətdən adəmdir.

İradətdən sevilübən müvəddət məzhəri olan,
Şəf'ii-cüz', küllün Həqdən olan rəhmətdən adəmdir.

Nedim, ey Gülşəni, sirri-xəfidir Rövşəni vəchi,
Anunçun deməzəm görən yüzün qüdrətdən adəmdir.

* * *

93. Kim bilisər əql ilə, eşq ilə seyran nədir?
Birdən iki vəch ilə dövrə görə şan nədir?

Əvvəl ilə axırun zahir edən batinin
Nisbət ilə dəmbədəm şanə görə an nədir?

İki cəhan bir ikən kim bilisər bicəhət,
Hikməti-firqət olan aləmi-insan nədir?

Sevübəni sevdürər eşq özinə vəchini
Kim bilisər sevgüdən etdügi cövlan nədir?

Elmini eyn etməyən, eynini həqqül-yəqin
Bilmiyəsər şəksüzin elm ilə ürfan nədir?

Eşqü məhəbbət rəvan ay ilə günəş sifət
Mehr ilə dildən-dilə qılduği seyran nədir?

Sirri-nəfəxtu dəmin qeybə şəhadət verən
Kim bilisər olmadan can ilə canan nədir?

Hər ki şərabın zühur içmədi, bilməz desəm
Təhurlə sirri-kəlam, vəhy ilə Qur'an nədir?

Kim bilisər vermədən sevgilü vəchin həqqə
Eşqü məhəbbət dəmi, mürğinə ehsan nədir?

Nə deyübən anladım sidqi-cinan neydügin,
Ta bilələr qeyb içün sidq ilə iman nədir?

Rövşənidən Gülşəni cəm'ini qərq etməyən
Anlayamaz bin desəm cəm' ilə fürqan nədir?



* * *

94. Bənəm mütləq sifət qeyd ilə zahir,
Nə əvvəl var ana nisbət, nə axir.

Sevübən sevdürən vəchümi həqdir,
Məhəbbətdən olub hər şandə nazir.

Bənəm nəfsü kəlami seyr edən dəm
Həvadisdən edən qəlbini tahir.

Vücudimə ədəm olmadı tari
Ğərəz nisbət qılub pərvər cəvahir.

Məlahət iqlimində kani-məlhəm
Ki, andan zövq edər hər hüsnə fatir.

Bənəm qüdrətdən əvvəl məzhəri-eşq,
Müvəddət aləmi məhbubi-qadir.

Əzəlsüz biəbəd şan ilə anum
Olur dövrə görə vəchə məzahir.

İki aləmdə bənəm bir vəchə nisbət
Ki, gah məclayi-lütfət, gahi faxir.

Məhəbbətdən bənüm çün natiq oldu,
İradət deyübən lövlaki-bahir.

Bənümçün yaredıldı iki aləm
Ay ilə gün sifət dövr ilə dair.

Bənüm vəchüm görənlər gecə-gündüz
Məhəbbət eşqilə olalı sayir.

İradətdən məhəbbət göz açan dəm
Bana qıldı nəzər ol eyni-basir.

Bənüm vəchüm görüb çeşmi-bəsirət
Cəmalum tabişində oldu hayir.

Kimə sorub bilib tə'birin anın
Bulunmaz çün o elmə görə mahir.

Nə duşdi, Gülşəni, şəh Rövşənidən
Yuxudə gördügin hüsn ilə nadir.

* * *

95. Dəlü kimi aşiqin halinə hər kim gülər,
Uslu degil ol bilür kim, dəlüdən us dilər.

Haləti-eşqi görüb qal ilə tə'n eyləyən
Alim isə cahilün yolun urar bixəbər.

Haləti-eşqi qiyas edənə yoxdur səma',
Ol nəzər əhlidir "Həqq" dedügi kurü kər.

Münkirə sormun görüb həqq ilə batil nədir,
Fərq edüb ağü qara çün seçəməz bibəsər.

Kurə xərəc yox dedi əxsəğü sayru kimi,
Vəhyi-kəlam içrə həq sorman ana xeyrü şər.

Ağlamadın halına necə güləm görübən
Batilə uyub həqi hər kim əlindən qoyər.

Rövşənidən Gülşəni elmə görə ta desün
Cahilü nadanə kim eybini sanur hünər.

* * *

96. Mütləq degüz azad edən qeydi-cəhandə can nədir?
Kəsrət olandan keçəli "vəhdət" sözün – "canan" nədir?

Uslu olanlar dəlürməz, şahlığ qılanlar qulimez,
Həqqə mükərrəm ulumuz, sultanlara sultan nədir?

Hüccət sorana, ey xəlil, həqqün kəlamı pəs dəlil
La bə'r füqulu-l-cəlil bilinməyən bürhan nədir?



Eşqün şərabindən şəfa istəyənə dərdə dəva
Könül verüb gəl, bildügiz dərd əhlinə dərman nədir?

Qopdu qiyamət xəlq içün, sorubən həşüm eşidün,
Gəl, gör günahın dərt ilən, ol gündəki mizan nədir?

Çün həqq içün yoxdur məkan, həm gecə, həm gündüz zəman
Bəs den bana surü hesab, yarağ içün divan nədir?

Ey müşkil bana həll olmıyan budur, eşit,
Sor Rövşənidən əmr ilə canım deyən fərman nədir?

* * *

97. Dildir ərzüllahi-vase', dilə gir,
Şərh edübən sədri-dilün, dilə gir.

Qəlb edüb qəlbüni, qəlbi qəlb eylə
Dil dilin dilə, candan dilə gir.

Narını nur edübən nurini nar,
Püxtəlüğçün pərvəriş təbdilə gir.

Sədrüni şərh edübən teslim ilə,
Eşq ilə can yoluna dil dilə, gir.

Sirr ilə candan açub eyni-fəvad
Görməgə vechüni andan dilə gir.

İtirüb özün məhəbbətdən təmam
Hübbədən qəlb ilə qəlbün bula, gir.

Behcə mülkin teyy qılub talib rəvan
Mehcə içün dil dilindən bula, gir.

Tövrini teyy qılubən seyrü süluk,
Eyləsən cəm ilə fərqə k'olə gir.

Əvvəlini eşqə təslim edübən
Kəsrət içrə vəhdət andan ala, gir.

Seyr edib "lillahi əla mə'ləhu"[12] bilə
"Fi və ən billah vəchün"[13] salə gir.

Rövşənidən güzgü kimi könlüni
Seyqəl edüb dili candan silə gir.

Bəhrü məkandan vücudun dərini
Bulmaq içün ol dənizə dala gir.

Bərzəx olmə məcmə'i-bəhreyn içün
Varlığ ilə yoxluğunu sala gir.

Xızr ilə Musasifət seyr edübən
Zahirə batin halından qalə gir.

Məcmə'ül-bəhreyn dalubən çıxar
Dürrini əbnayiçün, irsalə gir.

Bəhri-qeyb içrə şəhadət dürrini
Pərvərişdən dalub alub k'olə gir.

İki bəhrün arasında bir dəxi
Görsədənsən özüni tərk eylə gir.

Tey qılubən kəsrət olanun təmam
Vəhdət ilə sərxənidən yola gir.

Bənlik ilə demə dil yolunu,
İstər isən bənlik andan, ala gir.

Seyr ilə nəqsün kəmalə yetirüb
Düninə təkmil içün ikmalə gir.

Dur icmal ilə təfsilə biriş,
Dürr ilə məqbul olan icmalə gir.



Məhv edüb isbat ilə səndən vücud,
Nəqş ilə nəqqaş nisbət halə gir.

Həzf edübən hərfi-illət olanun,
Nəsxüni məhv edə gör e'lalə gir.

Tərk edib ifrat ilə təfritüni,
İki yoldan övsəti-təqdilə gir.

Bilübən nədir sələvatü bəsti
Cəm'i-cəm ilə nəmazun qıla gir.

Cəm'i-cəm ilə bir edüb fərqini,
Fərzi-eynün eyn edüb iclalə gir.

Qıl şəhadət səbrinə dildən təriq,
Bu şəhadətdən ana ğeyb ilə gir.

"La" məqami diləsən qılməx məqam
Eynüni görməyibən eyb ilə gir.

Mə'niyi-iqan budur, anla kəlam,
Ol məqamun qeyni, qeynün ola gir.

Boşəlubən ay kimi nurdan təmam,
Gün kimi suyi-ziyadən dolə gir.

Bil nədir bivəmə'ni seyrin o dəm,
Hal ilə qaldan köçüb əhvalə gir.

Gecə-gündüz yoxdur anda həm məqam,
"La" məqamdan fikr ilə amalə gir.

Əbdi-mütləq ol, salub qeydi təmam,
Pəs übudətdən o dəm isalə gir.

Cüzvü külldən nən var isə azü çox
Tərk edib təfsilini icmalə gir.

Qomə qalə öz vücudundən əsər,
Xirqən edübən ədəmdən ana gir.

Tərk ilə təcridə iriş, fərd olub,
Andan urub taci başə, dalə gir.

Nüqtəyi-tövhid edübən dönməsin
Ta cünun ol dəmdə daldan zalə gir.

Ölübən diril, dirilə ölmədin,
Bu qəbadən çıxub, andan şalə gir.

Ay ilə günəşsifət Aydın elin
Rövşən edən tab ilə timsalə gir.

Rövşənidən Gülşəni pərvər bulub,
Aləmi suzi-ziyadən bula gir.

* * *

98. Bana sənsiz cəhan, ey can, gərəkməz,
Gecə-gündüz gəzən dövran gərəkməz.

Yüzündən özgə mehrü mahə nisbət
Gözüm nuruyilə gəran gərəkməz.

Başum tup edəli çövkani-zülfün
Çalan meydanda sərgərdan gərəkməz.

Bana cənnət yetər yüzünü görmək,
Məzaqi-hur ilə qılman gərəkməz.

Ləbündən kövsər içən dirilib der:
– Xızır kimi bana heyran gərəkməz.

Sənün şövqündən özgə zövqi-şirin
Tənümdə can isə, bir an gərəkməz.



Ğəmündür ləzzətü eyşüm məzaqi,
Könül andan dərəm şadan gərəkməz.

Könül fikri kimi başda xəyalun
Yetər bana, sərü saman gərəkməz.

Eşitdüm Rövşəniçün Gülşəni der:
– Bana sənsiz cəhan, ey can, gərəkməz!

* * *

99. Bana canü cəhan sənsiz gərəkməz,
Behişti-cavidan sənsiz gərəkməz.

İki aləmdə sənsən istədügim,
Anunçün inü an sənsiz gərəkməz.

Nəyə baxsam yüzün görmək dilərəm,
Nihanü həm əyan sənsiz gərəkməz.

Nədür vəchündən özgə zahir, ey məh,
K'onı deyim rəvan sənsiz gərəkməz.

Tənümdə cani-şirin təlx olan dəm
Dərəm zövqi-rəvan sənsiz gərəkməz.

Eşitdim Gülşəni der Rövşəniyə:
– Bana dildən bəyan sənsiz gərəkməz.

* * *

100. Bana sənsiz cəhan, ey can, gərəkməz,
Tənümdə səndən özgə çan gərəkməz.

Dəvasuz dərd imiş eşqüni bildüm,
Dəva istəməzəm, dərman gərəkməz.

Dəlil istəyənə eşqünə hüccət
Verüb canum, derəm, bürhan gərəkməz.

Könül Misrində Yusifdən əzizim,
Çü sənsiz özgələr sultan gərəkməz.

Başın tup eyləyən eşqün yolunda
Ayaxdan özgə, der, çövqan gərəkməz.

Sənün eşqündən özgə mülki-dildə
Canumdan sevgilü mehman gərəkməz.

Dəmadəm Gülşəni der Rövşəniyə:
– Bana can sənsiz, ey canan, gərəkməz.

* * *

101. Bana dərdün gərək, dərman gərəkməz,
Tənümdə səndən özgə can gərəkməz.

Könül Misrində Yusifdən əzizim,
Sənün sevgün gərək, sultan gərəkməz.

Səni bilmək yetər aləmdə bana,
Cahanda sənsüzin irfan gərəkməz.

Gözümün qanlu yaşi həsrətündən
Axan hüccət yetər, bürhan gərəkməz.

Rəqibi sür yanundan, ey pərixu,
Mələk yanında çün şeytan gərəkməz.

Görən mehr ilə, ey məh, nərgisün der:
– Gözüm ana nədən heyran gərəkməz?

Könüldə Rövşəni derdin özünə,
Sana, ey Gülşəni, dərman gərəkməz?



* * *

102. Sataşdım eşqə nagəhdən səbrsiz,
Zaman ilə məkandan rəhgüzərsiz.

Şəhadətdən odur ğayib, bilinməz,
Çü var-yoxdan oldur mö'təbərsiz.

Bəni tanırmısan, der, görübənü
Bu göz ilə nəzərdən, ey bəsərsiz?

Dedim: – Guya mələksən, ya pərizad?
Dedi kim, adəmi-eşqəm, bəşərsiz.

Dedim: Adəm bəşərsiz necə olur?
Dedi: – Görməzmisən keyfüm nəzərsüz?

Səmi-Cəbrayıl sanma vəhyə görüb,
Təməssül-surətindən, ey xəbərsiz.

Yedi qat yeri gögü teyy qıluram,
Süluki-seyrüm oluban səğərsiz.

Hənuz adım yoğ ikən bəhrü bərdə
Bən idim Adəmi-can xüşkü tərsiz.

Bənəm namusi-əkbər, adəmi-eşq,
Ənasirdən müqərrər bəhrü bərsiz.

Dedim: – Ünsürsüz adəm necə olur?
Dedi kim, nur ilə nardən şərərsiz.

Dedim kim, varmı anun xeyrü şəri?
Dedi kim, xeyr olur aləmdə şərsiz?

Dedim kim, Rövşənidən özgə nafe'
Nə var, ey Gülşəni, xəlqə zərərsiz?

* * *

103. Gülüstan xar olupdur bana sənsiz,
Genişlik dar olupdur bana sənsiz.

Çıxub sevdası eşqünün başuma,
Xəyalun yar olupdur bana sənsiz.

Fəraqun zikri söylənmək dilümdən,
İnildü zar olupdur bana sənsiz,

Cəhanda bir nəfəs, ey dilbəri-şux,
Dirilmək ar olupdur bana sənsiz.

Fəraqun zikridür ağudan acı
Ki, zəhrimar olupdur bana sənsiz.

Yanaram həsrətündən gecə-gündüz
Çü hicran nar olupdur bana sənsiz,

Dəmadəm Gülşəni der Rövşəniyə:
– Rəqibim yar olupdur bana sənsiz.

* * *

104. Mütləq biziz azad edən qeydi-cəhandan canımuz,
Çün qurtarur andan bizi könüldəki irfanımuz.

Hüccət dilərsən, ey xəlil, təcrid ana bəsdür dəlil,
Təcrid ilə biqalü qil sorma nədir bürhanımuz.

Verüb bəha can almağı, görübənü qoy sormağı,
Yusif kimi qul olmağı Misri-dilə sultanımuz.

Bəhri-rəvanun qətrəsin gözdən axan dəmdə degün,
Rövşən sədəf pərvərdəsi, qəltan dürrü mərcanımuz.

Yedi dəniz bir qətrədir könül dənizinə dalın,
Ol qətrədür yüz aləmi qərqedici tufanımuz.



Ağü qəradan kün-fəkan, bir mövc imiş iki cəhan,
Bəhri-ədəmdən, ey cəvan, kim bilisər imanımuz.

Yeddi fələk bir zərb ilə meydana girüb çalalı,
Ol tupə bilindi nədür qüdrət verən çövqanımuz.

Eşq özüdür gəlüb gedən, dövrə girüp seyran edən,
Anı görən bilür nədür, ey Gülşəni, dövranımuz.

* * *

105. Eşq halini sorma bana, çün demək olmaz,
Ol hali rəvan qalə gəlüb söyləmək olmaz.

Şövq ilə dadan ləzzəti-eşqi qılubəa zövq,
Tuzsuz kimi çün dadan anı binəmək olmaz.

Qurbağə kimi qalə qalan vaizə derəm:
Hal ilə nişə bəhrə girübən səmək olmaz.

Naqabil olur nəqsə verən qabil özünü
Anunçün anı əhli-kamal eyləmək olmaz.

Eşq olur imiş talibinə ruh qidası,
Diri yeməgidir ölüyə ol, yemək olmaz.

Təmkin diləyən sabit olur eşq yolunda,
Təlvinə tə'cil edübən irəcək olmaz.

Yel kimi yelüb gəzmə derəm talibi-eşqə,
Sabitqədəm ol, talibi anun yelək olmaz.

Tərk eylə həvadən həvəsə meylü olanı,
Eşq əhlinə çün meylü həvadan dilək olmaz.

Bütdür diləgi eşq ərinün şəthü kəramət,
Simurği-həvadan dilək içün sinək olmaz.

Talaşubənü yırtma çəküb xəlq yəxasın,
Çün zöhd ilə Əbdullah olan nəfsi-səg olmaz.

İnsan oluban bil nədür adəmdə həqiqət,
Heyvan sifət anı bilən adəm eşək olmaz.

Çox yeyübənü yatmağıl, öküz degilsən,
Çün adəm olan nəfsi-bəqərdən inək olmaz.

Qol qalduruban urma yetən boynuna yumrux,
Xeyr əhli əli çünki bəşərdən kütək olmaz.

Ün çəkübən sögmə, urub xişm ilə xəlqə,
Bildünsə bunu kim, adəm oğlu köpək olmaz.

Yılma tənün qapusunə nəfsünə uyub,
Çün qane olan nəfsə uyub yilpəyək olmaz.

Təfsiri-həqiqət demə təbdil görübən,
Hər rəng ilə ipligi boyasan ipək olmaz.

Sığır kimi susma yetənün köksinə itüb,
Gər bilmədün isə adəmizad susək olmaz.

Hiylə qılubən tülkü kimi aldama xəlqi,
Çün kərkəsi-nəfsün anun ilə tülək olmaz.

Daşlayubənü təpmə eşək xuyidir eşit,
Olmayan eşək nəfs ucundan təpək olmaz.

Toldurma hübubat ilə qarnuni dünü gün
Adəm bədəni məzbələ içün təpək olmaz.

Tənpərvər olan talibə derəm eşidü gör
Kim, canə qida aclığı bil ət, çörək olmaz.

Zikri çox edib, az yeyübən, az uyu, sufi,
Divün bilürəm çünki bularsuz mələk olmaz.



Yerdən gögə yol istər isən ağlama, dur uş
Ruhani qida yeməyən əhli-fələk olmaz.

Gül sanma tikəndir canuna xəlqi-zəmimə,
Canə bitici ancılayın xər-xəsək olmaz.

Yumşəx de sözi söyləyicək qaxıma xəlqə,
Çün də'vət edən xəlq-həqə tündrək olmaz.

Münkir canını alur imiş səhmi-iradət,
Anun kimi ol divə qəzadən nəvək olmaz.

Təqlid edübən tutiyə hər quş dilə gəlür,
Qəlbiçün anun kimi cəhandə məhək olmaz.

Vəhdət diləsən kəsrəti tərk edübən bil
Kol aləmə girən kişidəki dilək olmaz.

Dutğıl ətəgin Rövşəninin, Gülşəni, candan,
Dil kisvətinə ta deməyəsən ətək olmaz.

* * *

106. Nədür eşqün təriqi bilmək olmaz
Ki, əql ilə o yola girmək olmaz.

Əcəb budur ki, dil pasın yüzündən
Bu cani verməyincə silmək olmaz.

Dilin dilindədür eşqin təriqi,
O yola girmədin dil dilmək olmaz.

Demək aşiq olanda qalə bənlik,
Anunçün sirri-eşqə irmək olmaz.

Əcəb sirdir, əmanət cövhəri-eşq
Bəha can verməyənə vermək olmaz.

Diridür, eşq ərini ölü sanmın,
Çü ondan dirilənə ölmək olmaz.

Gərəkdir talibə səbrü təhəmmül
K'ol yola girənə uyumaq olmaz.

Dilərsən bulmağı təlvində təmkin,
Anunçun hər yanaya yilmək olmaz.

Görəndə aşiqi-məcnuni aqil
Dəlü kimi o halə gəlmək olmaz.

Verüp əqlini eşqə aşiqi-məst,
Özünə neyləsün, çün gəlmək olmaz.

Bu yolda münkir olmayan kişiyi,
Sögüp çıx deyübənü sürmək olmaz.

Necə sevsün könül münkir olanı?
Həqün sevmədügin çün sevmək olmaz.

Əcəb, bu Gülşəni eşqün der isən,
Günəş nisbət baxuban görmək olmaz.

* * *

107. Sənsiz bana bu təndə, ey can, rəvan gərəkməz,
Mehründən özgə dildə sevgilü can gərəkməz.

Yüzün gününə zülfün kölgə sifət düşdüm,
Ay nisbət ol bulutdan hüsnün nihan gərəkməz.

Gül kimi gülşən içrə al yanağun
Bülbül ünin eşidüb, demə, fəğan gərəkməz.

Vəchündən özgə aşiq bilməz nədür behişti,
Cənnət yüzündən özgə ana cinan gərəkməz.



Bitürəli nişanım, ol binişanı buldum
Bu dərdlə kim, onda bəndən nişan gərəkməz.

Zənn edərəm dəhanun gün yüzdə zərrə nisbət
Bildim yəqindir anı şəkkü güman gərəkməz.

Bir baxmağa yüzünə bin nəqdi-can verürəm,
Görsət rəvan, al ıssı nihan gərəkməz.

Gözün kimi kamandar görəli gözləmiş ox,
Qaşın yayından özgə tirü kəman gərəkməz.

Dilün məqali, ey can, faş etdi sirri-pünhan,
Duyuldu gəncü məxfi, irax bəyan gərəkməz.

Mehr ilə Gülşənivəş görən yüzüni, ey can,
Kim der ki, Rövşənidən vəchün əyan gərəkməz.

* * *

108. Nedəm eşq odi candan taşra düşməz,
Rəvandan özgə ol od nəsnə yaxmaz.

Könül şəm'ə dönübən yanduğundan
Gözünün yaşi oddan özgə axmaz.

Könül faş etməz öz sirrini saxlar,
Gözümdən yaş kim edür anı çıxmaz.

Nedəm qeyrət qılubən ğeyrə dilbər,
Özündən özgənün yüzinə baxmaz.

Özün peyvəndini ğeyrin dilindən
Dökübən canü dildən ğeyrə taxmaz.

Dönüb əf'i ilanə sancar imiş,
Həva aşiq canını sanma savxmaz.

Könül gəncinə gəncin qoməsincə
Qılubən bəllü söz ayəsi yaxmaz.

Cəhanə doldu zikri Gülşəninün
Özi Misrün içindən taşra çıxmaz.

* * *

109. Yüzün görən əgər cayini verməz,
Kəmali-vəchünün qədrini bilməz.

Könül gözin açup görən cəmalın,
Olup heyran sifət özinə gəlməz.

İçənlər şövq ilə zövqin şərabın,
Olub sərxoş rəvan, hərgiz əyilməz.

Gözüm kimi cəmalun həsrətindən
Gecələr ağlayub, gündüz güləməz.

Çəkənlər həsrət ilə intizarun,
Dönüb yas əhlinə matəmsiz olmaz.

Vərəli Gülşəni eşqünə könlün
Nedəm, ey Rövşəni, dönübən almaz.

* * *

110. Eşq ilə Məcnun halın aqil olan dinləməz,
Dinləyübən neyləsün, çünki halın anləməz.

Eşq ilə divanənün, özünə biganənün,
Əqlə olan aşina halını yamanlamaz.

Aşiqi-rüsva görüp, haləti nədür sorup,
Arifi-dana görüp lütf ilə qəhr eyləməz.

Heyrəti-eşqə düşən, şurişi başdan aşan,
Halətini, ey Həsən, arif olan dinləməz.



Vaizi-sərd ün çəküb zərq ilə, bilün, bu gün
İnlədübən qopuzun, kim dedi uzunlamaz?

Arifə qal eyləyən xurus kimi ün çəküb
Başini vermək içün vexti ilə banlamaz.

Rövşəniyə tə'n edən, münkiri görüb deyün:
– Rövşəninin zəxmini yemə deyən inləməz.

* * *

111. Başumdə eşq ilə əqlüm gərəkməz,
Ana bürhan içün nəqlüm gərəkməz.

Dəlil istəməzəm sevdayi-eşqə,
Çü əqlü hüccətü dəqlüm gərəkməz.

Yetər tihində eşqün mənnü səlva,
Bana fumü bəslü bəqlum gərəkməz.

Yüzər çün rövnəqini eşqin, əqlün
Deyüb bana: – "Bu rövnəqlüm gərəkməz".

Verübən Gülşəni dünya təlaqin
Edər, çün Zal imiş, həqlüm gərəkməz.

* * *

112. Cənnət imiş arizin, həm gülü gülzarimüz,
Ol gülə bülbül kimi suziş ilə zarimüz.

Görmədi açılduğın gülşəni-aləm dəxi
Sən güli-xəndan sifət bir güli bixarumuz.

Canu qoyar dil kimi almayubən sevgüdən
Bir nəzər edüp rəvan işvəlü dildarımuz.

Mehr ilə pərvanə tək şəm'ə düşüb yanmayan
Bilmədi candan nədür yandıruci narimuz.

Nəqdi-rəvandan keçən ıssı ziyanı nədür,
Kim ki qılur eşq ilə sevgilü bazarımuz.

Bilməzüz, ey müddəi, əql ilə ari nədür,
Tərki-xirəd qılubən eşq olalı varımuz.

Rövşənidən mehrüni görəli, ey Gülşəni,
Yar oluban qalmadı eşq ilə əğyarımuz.

* * *

113. Eşq ilə halum nədim zikr ilə qalə sığmaz,
Nə deyübən əglərəm anı məqalə sığmaz.

Əql ilə istəyənə haləti-eşqi derəm,
Dərkin onun sınadum fikri-vüsalə sığmaz.

Eşqü məhəbbət hali sadəvü neyrəng ikən
Bənlik içün rəng olan səbğ ilə alə sığmaz.

Eşq-məhəbbət olduğuni biləmi
Bildüm olub, mahiyat fəslü visalə sığmaz.

Hər nə desən eşq içün keyf ilə bikeyf ikən,
Çünki yox ana nazir, şibhü misalə sığmaz.

Mərtəbə, mənzil, məqam ana görə yox, vəli
Övsə'i-aləm ikən dərki-xiyalə sığmaz.

Ərzi-ilah sirrinə eşq ilə girən bilür,
Vüs'əti ol aləmün nəqzi-kəmalə sığmaz.

Kim bilisər əql ilə eşqü möhübbət nədür,
Çünki olardan bəyan dərk ilə balə sığmaz.

Eşq ilə iki cəhan birlik ilə teyy qılan
Der ki, cəlalum bu dəm vəsfi-cəmalə sığmaz.



Rövşəninün Gülşəni əbcədi-eşqin nedəm,
Elmi-hüzuri-sifət bey ilə dalə sığmaz.

Gülşəninün gün sifət başdağı tacın görən
Der ki, bunun ərusi nüqtəyi-zalə sığmaz.

* * *

114. Həqq ilədür daima zikrü münacatımuz,
Batilə sərf etməyüb ömr ilə ovqatımuz.

Eşq ilədür dayima zikri-həqq olan bizə
Zövqü hüzurü səfa şövq ilə halatımuz.

Münkir olan kər sifət zikrimüz eşidəməz,
Gərçi cəhan qulaği doldi məqalatımuz.

Ğülğülü bəngü səma' eşidinüz cəm' ilə,
Təfriqəsüz vəcd ilə zövq olan əsvatımuz.

Söhbətümüz cəm' ilə fərqə nəzərdar olan,
Hal ilə biçün məqal nütqi-ibaratımuz.

Mərtəbə, mənzil, məqam eşq ilə halət olur,
Batinü zahir sifət sirr ilən ayatımuz.

Eşq ilə məcbur ikən yox bizə təklifi-əql,
Xalis ikən həqq ilə cəbr ilə ta'atımuz.

Məzhəbü millət bizə olalı təslimi-həq
Ondan olur səlm ilə dizü dəyanatımuz.

Tərk edüb əgri rəviş doğru yola girməyən
Bilmədi həqdən nədür rahi-hidayatımuz.

Qürbü nəvafil dəmi fərzə nəzər eyn ikən
Həqdən olur bir sözün xəlqə inayatımuz.

Əvvəlü axır bizə zahirü batin sifət
Yox deyəvüz eşq ilə bədü nəhayatumuz.

Birdən iki vəch ilə dövri-məhəbbət bizüz,
Eşq ilə çün ikidür, bəd' ilə qayatumuz.

Küllə lisandur bəyan eşq ilə rəmz daima
Mə'rifəti çün olan nütqü ravayatumuz.

İki cəhandan dilək yox bizim üçün tələb,
Birlik olalı bizə bir ilə hacatumuz.

Eşqə könül verəli gərçi bəla çəkirüz,
Şükr olub ana nəzər dildə şikayatumuz.

Kim bilisər eşq ilə can kimi şirin nədür,
Ləzzət ilə tatmıyan zövqi-həlavatumuz.

Elm ilə qılan əməl xalisü müxlis bilür
K'ol əməl ilə olur elmü kəramatumuz.

Rövşənidən Gülşəni halətidür sirr alan
Rəmzü imandan sərih nəqlü kinayatumuz.

* * *

115. Nədür eşqi soruban bilmək olmaz,
O halın qalini ögrənmək olmaz.

Ziya dəm olubən dirilməyənə
Bu eşqin əbcədin bildürmək olmaz.

Oxur nəhvini anun məhv olan, leyk
Bud ilə sərfin anun gəlmək olmaz.

Əcəb heyrət budur eşidüb əglən
Ki eşqün hərfi candır görmək olmaz.



Sınadım könlüni eşqə verənlər
Yüzün ağlar ikən güldürmək olmaz.

Könül güzgüsüni əqlün pasından
Arıtmadın rəvan sildürmək olmaz.

Özündən keçmiyənə sirri-eşqi
Nə desün Gülşəni, çün demək olmaz.

* * *

116. Ey gözəllər sərvəri sultanımız,
Hüsnün içün zahir oldu şanımız.

Vəchün üçün yazıldı kainat,
Hüccəti-"lövlak" ana, bürhanımız.

Surətin səb'ül-məsanidir təmam
Ayət-ayət oxunan Qur'anımız.

Ruyi-muyun dərdimizdir sübhü şam,
Küfrü din ibqan ilə imanımız.

Ləblərindən dirilür bulan həyat,
Kövsəründür çeşməyi-heyvanımız.

Tən deməz candan görən cismün içün
Ey əzəl nəğhi əbəd cananımız.

Vəhdətün tövhidinə inkar edən
Hər kimsəyə ol durur şeytanımız.

Mə'nidən adəm kimi insan demin
Surət içrə görübən heyvanımız.

Görəli bayram kimi yüzün derəm
Can olur ol eyd üçün qurbanımız.

Nə ayağunə qılmağa gözdən nisar
Qanlu şərər dürr ilə mərcanımız.

Qoyalı eşqün təriqinə qədəm
Göz yaşı ab oldu dərdün sanumuz.

Zariylən həddən aşduğun eşit,
Gülşəni, ol yar içün əfğanımız.

* * *

117. Nədür keyfiyyəti eşqin bilmək olmaz,
Çü keyf ilə yüzüni görmək olmaz.

Görən bikeyf ikən keyfi eşqün
Nədür keyfin anun, söyləmək olmaz.

Yoğ ikən var olan bilür nədür eşq,
Nedəm kim yoği var eyləmək olmaz.

Dilün dil diləsün eşqün təriqin,
O yola dilmədin dil girmək olmaz.

Ölə gör eşq ilə ölmezdən öndin,
Demə, ölmədən öndin ölmək olmaz.

*Gərək eşqin yolundan xeyrü təmkin*
Ki, ol yol talibinə irmək olmaz.

Nedim, ey Gülşəni, Aydın elinə
Ziyayi-Rövşənisiz girmək olmaz.

* * *

118. Nədür eşqi bilübən sev demək olmaz,
Anunçün kimsə anı bilmək olmaz.

Nə deyüm hali-eşqi sorana deyin,
Çü qal ilə anı bildürmək olmaz.



Günəşdən daxi zahir eşq, leykən
Baxuban bu göz ilə görmək olmaz.

Dilərsən eşq ilə dirlik, ölə gör,
Diriykən demə kim, ölmək olmaz.

Ölüdür eşq ilə dirilməyənlər,
Ölüyikən diri dirilmək olmaz.

Kəsib nəfsün həvadan, öldürə gör,
Çü ondan kəsmədin öldürmək olmaz.

Həvəsdən pas dutər güzgü kimi dil,
Həvayilə anunçün silmək olmaz.

Binə it kimi eşəkdən-eşəgə,
Derəm talib olana binmək olmaz.

Yeməkdən yütür, olur nəfsi sərkeş,
Anunçün ram edübən binmək olmaz.

Həqqin qapusuna doğru gələni
Sən əgrisən, deyübən, sürmək olmaz.

Görəndə münkiri münkir deyübən
Var, ey it, get deyübən sürmək olmaz.

Gərək sabitqədəm eşqün yolunda
Səbat edə, o yolda uymak olmaz.

Kim edər Rövşənidən Gülşəniyə
Verilən canı, candan sevmək olmaz?

* * *

119. Ey yüzi Qur'an ilə fürqanumuz,
Xalü xədün küfr ilə imanumuz.

Kə'bə kimi qarə geyən kisvətün,
Vəchün imiş qibləyə bürhanumuz.

Pərdə güvahmış zülfünə nispət olan
Xavər idi vəchə görə şanumuz.

Pərdə götür, ta görəlüm yüzünü,
Zahir olan surəti-rəhmanumuz.

Qul olalı bən də sana bildim uş:
– Eşqün imiş canımü sultanumuz.

Gülşəni-hüsnün görəli bilmişəm,
Vəchün imiş gülü gülüstanumuz.

Ərş olalı seyrün içün fərşvəş,
Qəddün olur ayəti-sübhanumuz.

Kə'bə kimi qiblə görən yüzünü
Bildi nədir eşq ilə ərkanumuz.

Münkir imiş batilə həqdür deyüb,
Başçəkici kibr ilə şeytanumuz.

Gülşənivəş eşqə verən canını
Rövşənidir dedügi cananumuz.

* * *

120. Bisəlah olan bil fəllah olmaz,
Çün məllah olan bisəlah olmaz.

İç meyi-safi eşq ilə, sufi,
Zöhd edüp, demə, mey mübah olmaz.



Tök həva camin, püxtəvü xamın,
İçməyən anı məsti-rah olmaz.

Ləblərün camin etmiyən kasin
Cami-Cəm kibi eyni-rah olmaz.

Diləsən nəcah qılmaği səbbah,
Mürği-canə çün tibah olmaz.

Dəmbədəm, talib, eşqün et ğalib,
Ansuzin sanə çün nəcah olmaz.

Öldürüp nəfsün bil nədür purin,
Tiğ edüb seydün bisilah olmaz.

Tərk edüp təlvin, bula gör təmkin
Əhli-eşq içün çün yərah olmaz.

Olmagil asi, yazuğ əyasin
Verübən talib bicinah olmaz.

İstə bul, zahid, cövr ilə sərdən,
Cənnətün eyşi bibəlah olmaz.

Cəd imiş həzli eşqün, ey talib,
Həzli tərk eylə, çün məzah olmaz.

Qət' edüp yolun fərsəxü milin
Sorməgüz eşqün k'ol məsah olmaz.
Eşit, ey talib, diləgün ğalıb
Etmə, eşq ilə iftirah olmaz.

Bikr ikən eşqün əhlinə derəm:
– Vermədin canı xud nigah olmaz.

Eşq ilə könlüni rövşən etməyən
Sədri-nur ilə inşirah olmaz.

Deməgüz ol eşq içün axır
Ki, intəha ana iftitah olmaz.

Gülşəni deməz varmasa eşqə,
Çün məsa onda həm səbah olmaz.

* * *

121. Yüzini görməyən, ey məh, nədən bayram edər, bilməz,
Nə yüzdən vəchünün eydin özinə kam edər, bilməz.

Sana qurban olan bilür nədür bayramını eşqün,
O bayram çün xəvasündü,r əgərçi am edər, bilməz.

Möhübbətdən görən vəchün yüzün bayramını bilür,
O yüzdən görməyən eydi, səbahın şam edər, bilməz.

Yanub mehr ilə eşqündən özünü qılmayan püxtə
Həvayilə həvəsdən ol vücudin xam edər, bilməz.

İçəli cisim kibi cami ləbündən xümrini eşqün
Verəm soranə zövq andan, həvasi-cam edər, bilməz.

Eşitdim, Gülşəni, son dəm nə dedi Rövşəni sana:
– Məzaqi-eşq içün hər kim həva əncam edər, bilməz.

* * *

122. Məhəbbət zövqünün camın ləbaləb içməyən bilməz,
Anun sərxoşluğu zövqün başından keçməyən bilməz.

Cəhani-eşq imiş Qafi bu ənqayi-vücudun, çün
O Qaf içün ədəm mülkin buraxub qaçmıyan bilməz.

Nədür Simurği-Qaf olan desəm, Ənqasifət, nedəm,
Açub himmət qanadını könüldən uçmayan bilməz.



Məhəbbət tüxmi bər verür, əkilsə ərzinə eşqün,
Nədür eşqi-həva fərqi könüldən seçməyən bilməz.

Həvayilə həvəs sanma məhəbbət eşqin, ey talib,
Nədür eşqü-həvəs fərqi könüldən seçməyən bilməz.

Cəhan mülkində eşq ilə qonub köçməgi tərk eylə,
Bu mülkün qədrini dildən qonuban keçməyən bilməz.

Ziyayi-Rövşənidəndür cəhan aydınlığı xəlqə,
Könüldən Gülşəni nisbət ana göz açmayan bilməz.

* * *

123. Gər dövri-səma' münkiri zövq edənə inanmaz,
Ləzzətlənən ol haldən qal eyləsə bilinməz.

Halinə zövq edən dəm talibləri səma'vun
Əzğ an edüb özündən fikr ilə ol duyulmaz.

Susuz sifət təhqiq etməz qiyasi görüb,
Vəcdü səma'vü həqqə bütlani çün görünməz.

Zövq etməyən səma'ın vəcdini halətini
İnkar edər məzaqın, çü qal ilə bilinməz.

Eşq ilə sərxoş olub aşiq səma' edən dəm
Bixudlığ ilə nətsün çün özünə gəlinməz.

Münkir səma'i-eşqə ləhvü lə'b deməgil,
Çün əhli ol səma'ın oynar kimi salınmaz.

Müfti həlali-fe'lə deməz həram bilsə,
Küfr olur anı demək, qılub sükut deyənməz.

Hər kim ki həqqi bilür batil deməz səma'ə,
Cəhl edüb ana elmin inkar ilə olunmaz.

Aqil dəlüyə dönüb bilməzlik ilə halə,
Qal ilə yaxşıyə ol yamanlığını sanmaz.

Gün kimi Rövşənidən doğub səma'ın ayə,
Nabi anın könüldən batubənü dolanmaz.

Ey Gülşəni, səma'ə münkir nə dersə desün,
Eşq ilə edən anın zövqün o dadıb sanmaz.

* * *

124. Ey qəflətün meyindən sərxoş sifət xəbərsiz,
Zövq eyləyən o meydən olmadı dərdi-sərsiz.

Ömrüni zaye' edüb, keçürmə qəflət ilə,
Olmaz çü qəflət ilə olan kişi xəbərsiz.

Binüb həva atını çapma həvəsi-qəvin,
Çün ol atə binənlər olmadı şurü şərsiz.

Yedi tamun odundan tutuşturan həvadur,
Yandırma ol həvadan canın oda səqərsiz.

Guya həvayə uyan eşidübən görəməz,
Anın içün bulunmaz aləmdə kurü kərsiz.

Hüqdü xudavü düni büğz ilə pərvər edən
Veribənü ol otdan almaz nəfəs şərərsiz.

Aldatma şirinübən zövqi-həvayə, ey dil,
Çün sınadım, bulunmaz ol zövqi-nəfs zərərsiz.

Anub keçən günümi qəflətlə gülmə, ağla,
Ta yüzünə baqanlar görmiyə xüşki tərsiz.

Ey Gülşəni, günəşdən zahir ziyayi-vəchün,
Görsədübən nedüm çün görməz anı bəsərsiz.



* * *

125. Soranda gərçi xürü həqirü gədalarız,
Mülki-fərağət içrə vəli padişalarız.

Biz şahi-həft kişvərə qul olmazız, vəli
Ərbabi-mə'rifət eşigində gədalarız.

Mərdi-zənə zali-dünyayi naməhrəm anladıq,
Çeşmi-qəbulə yarəməyüb parsalarız.

Gahi səlahi-əhli xərabatiyüz, gəhi,
Şükri-xudayə, hər nəyisək biriyaləriz.

Gənci-fənadə bir pulə malik digilləriz
Gənci-qənaət ilə vəli purğinaləriz.

Yüzünə can fəda qılmışuz belə,
Şol məyyidlə Gülşəniyü aşinaləriz.

* * *

126. Ey qəflətün meyindən sərxoş sifət xəbərsiz,
Anmə kimi qılubdur qəflət səni bəsərsiz.

Aç gözünü könüldən, qılğıl nəzər özünə,
Ta biləsən nə yüzdən deyüm sana nəzərsiz.

Uyar gözü yuxudan ayırma ğəflət ilə,
Verən dil ol yuxuya olmadı kurü kərsiz.

Ğəflət bimi qəza yox, şeytanə uya neçün,
K'ondan qəza-qədərdən olmayisər qədərsiz.

"Qul lən yusibna"[14]yi oxuyuban duya gör
Ki, sünnəti-ilahi olmadı nəfxü sərsiz.

Həqqül-qələm eşidüb, bil kim, mübəddəl olmaz,
Hökmi-qədər qəzadən bir dəmdə xeyrü şərsiz.

Çün vardır ixtiyarun, cəbr etmə məzhəbüni,
İnkar edüb kəlamə kafərsifət, xəbərsiz.

Cəhl ilə elmi inkaredicü cəbrini dün
Nəf' edüb əmrü nəhy, cənnət dilər səqərsiz.

Məhv etmədən sübutun Cəbrayilə nəhv dilər,
Muxtari-mütləq olmax biqeydi-dil xəbərsiz.

Ey Gülşəni, nə yüzdən cəbriligün bilinməz,
K'ol xeyri-Rövşənidən bikeyf olur bəsərsiz.

* * *

127. Nedim münkir bənüm halum bilməz,
Kəsüb dilini halın, qalsuz olmaz.

Dönübən xürusə bivəqt, ya bəkil,
Başini kəsmədin, yaylı kəsilməz.

Həqq ilə etmədin batil cidalin
Qəbaq nisbət başı darə asılmaz.

Ədavət qılmadan həqq ilə münkir,
Nədir düşmanlığı anun bilinməz.

Həsəddən münkirün tə'n ilə zəxmi
Dilümdən mərhəm edübən önülməz.

Gözüm yaşı dükəndi ağlamaqdan,
Nedim münkir qara qana bulanmaz.

Dönüb sirkə küpünə zahidi-xüşk,
Olub tərcalətümdən yüzi gülməz.



Səma'i-eşqə münkir olmayınca,
Bu susən mə'dəni-şeytan bilinməz.

Deməki, münkir, beşini yencü bunu
Bilən nisbət başı üsnə burulmaz.

Nedim münkir olan vəcdü səma'ə
Ədavət etmədin dirilə bilməz.

Gecə-gündüz həsədtən can çəkincə
Ədavət etmədin dirilə bilməz.

Cəsədtən bixəbər sərxoşə dönüb
Rəvani münkirün bir dəm ayılmaz.

Sor axı, Gülşəni, şəh Rövşənidən
Neçün həqq ilə hər batil yenilməz?

* * *

128. Nedim şeytansuz adəm çünki olmaz,
Çox istədim ədəm nisbət bulunmaz.

Ədəmdən ol vücudə belə gəlür,
Çü aləm ansuzun heydən görülməz.

Doğar həmzad nisbət adəm ilə
O törəmsüz cəhanə kimsə gəlməz.

Şəyatini olan ins ilə cinnün
Nədür, ademdən özgə kimsə bilməz.

Nə şeytanə çıxan ademlə sözün
Olan lə'nət dəmi nedim bilinməz.

Anın züriyyəti "xənnasü vəsvas",
Urayub nəsli aradan tükənməz.

Nədir iblis ilə şeytan fərqi
Ki, ğeyb andan şəhadətsüz olunmaz.

Nə deyüb anladım, iblis fərqin
Nədür şeytan ilə, sirrdir denilməz.

Deyən ağuyətin cəm' ilə fərqə
Odur şeytan ki, özün suçlu bilməz.

Edən tərk ixtiyarın cəbr nisbət
Həqün əmrin dutub nəhyini silmaz.

Nə dəmdir Gülşəni deyən zülmət
Ki, iqrarın verüb, inkarın almaz.

* * *

129. Nədir şeytani-adəm, kimsə bilməz,
Doğan həmzadi həmdəm kimsə bilməz.

Doğrumu, kim bilür şeytansuz adəm
Olursə, ibni-Məryəm, kimsə bilməz.

Ədəmdən belə gəlübən vücudə
Xiyalü həm tovəm kimsə bilməz.

Yedürən adəmə cənnətdə buğda
Nədir xasi o dəm, kimsənə bilməz.

Nə şeytandır uran adəm yolunu,
Oluban anə mənzil kimsə bilməz.

Ləmi-ağuyyətin deyən ilahə
Olan dəm cəbrə müdğəm kimsə bilməz.

Desəm iblis ilə şeytan fərqin
Füzundan olmadan kəm, kimsə bilməz.



Nə əgridirsə, nə doğru, cəmü fərqin
Olub dərd ilə xəm-çəm kimsə bilməz.

Nə qətrədir, nə yəm, iblisü şeytan,
Olub tufani-şəbnəm kimsə bilməz.

Dənizdir guyiya iblisü şeytan,
O bəhrə mövc olan dəm kimsə bilməz.

Nedim şeytan ilə iblis fərqin
Desəm, tiryaq ilə səm kimsə bilməz.

Nədir dərdinə şeytanın dəvası
Ki ondan lə'nə hər kim kimsə bilməz.

Nədən, ey Gülşəni, sirr faş edərsən,
Ana layiq çü məhrəm kimsə bilməz.

* * *

130. Nedim insan yüzin heyvan görəməz,
Anı surət sanan mə'ni dönəməz.

Görən neçün cəmalun dil gözilə
Dilindən faş edüb sirrin deyəməz.

Məhəbbətdən nədir sevgilü adəm,
Görüb heyvan ol insanı biləməz.

İradətdən sevilən adəmi-eşq
Müvəddətdən təcəllisüz olamaz.

Məhəbbət adəmi lövlaki sirrdən
Xəfidir, istəsin anı bulamaz.

Şəhadətdən ol adəmdən olan qeyb
Ki, ansuz zahirə batin gələməz.

Məhəbbət malikiydi yövmi-dinin,
Qiyamət ansuzin sorğu soramaz.

Nə sevdadır qiyamətdən başında
Xiyalın Gülşəninin ki, salamaz.

Dirilən Rövşəni Gülşəniyi-dil,
Ərzi-canın verüb gerü alamaz.

* * *

131. Nedim, sirrdir xəfi, adəm bilinməz,
Nəfəxəti-sirri-Adəm bilinməz.

Nədir qüdrətdən adəm hikmət həqqi,
Vücud ilə ədəm həmdəm bilinməz.

Nə desəm faş edüb sirrin vücudin,
Ədəm nisbət olub nedim, bilinməz.

Əzəlsüz biayə adəm dəm idi,
Nə sirrdəndir, vəli ol dəm bilinməz.

Nə əvvəl var, nə axır ol dəm içün
İkisindən dəmi-iqdam bilinməz.

Zaman yox ol dəmə nisbət, məkan həm,
Anunçun ol zəmanə dəm bilinməz.

Sor axı, Gülşəni, şəh Rövşənidən:
– İki dəmsüz nişə bir dəm bilinməz.

* * *

132. Ey bixəbər, bu dəmdən dirilə gör ədəmsüz,
Ta biləsün həddüni neydügini qədəmsiz.

Sirri-nəfəxt ruhi bu dəmdədir, dəmi duy,
Kim bilisər nədir dəm, dirilmədən bu dəmsüz.



Rühül-qüdüs dəmindən diriyə sor nədir dəm,
Kim gəlmədi zühurə ol ruhi-nəfxi-dəmsüz.

Əqdəmi-həyy nəfəxtü sirrdir həyati-məxfi,
Bilibən o dəmdir sirrdən xəfi o dəmsüz.

Adəmdəki əmanət dəmdir, dəmi biləməz,
Dəm olmıyan nədəndir ol sirr sirri-dəmsüz.

Fürsət varkən əldə bilgil dəmin nədəndir,
Çün fövti-fürsət edən olmaz dəmi nə dəmsüz.

Dəmdən ayax qoyuban seyr etməyən dəm ilə
Bilməz dəmin nədəndir seyrini ol qədəmsüz.

Dəmdir qiyaməti-eşq həşri-məhəbbət içün
Kim bilisər o həşrün nəşrin, sur dəmsüz.

Ey Gülşəni, nə dəmdir naqusi-eşqi-nəfxiy
Kim Rövşəni dəmində çalınmaz ol də dəmsüz.

* * *

133. Ey bixəbər, bu dəmdən həyy olmuyan dirilməz,
Diri sanub ürünən ölülügi bilinməz.

Abi-həyat eşitdün, bu dəmdə dərdümi duy,
Bu dəm şərabın içən Xızrə dönübən ölməz.

Sirri-səfahimi duy dəmdir şərabi-rəbbin
K'ol dəmlə zahir olan teybi-rəvansuz olmaz.

Dəmdir nəfəxti-fih həyydən həyati hər şey,
Dirilməyən o dəmdə laşisifət bilinməz.

Dəmi-sirdir əmanət insan olanda məxfi,
K'ol gizlü gənci-həqdən nədür deyüb sorulmaz.

Dəmdən dirilən Adəm bulur həyati-cavid
K'ol mahiyyəti-dəmsüz istərsə, kimsə bulmaz.

Qüdrətlə hikməti-həqq sirri nəfəxtü dəmdir
K'ol dəm məhəbbət ilə qüdrətsüzin görülməz.

Dəmdir həyati-eşqün mehri məhəbbət ilə,
Verilmədən ana can dirligi çün alınmaz.

El Gülşəni, nə dəmdən buldun həyati-baqi
K'ol cavidani-dirlik təqrir ilə bilinməz.

Ey Gülşəni, həyatun eşq ilə Rövşənidən
Yüz der isəm, nə dəmdür, təqrir ilə bilinməz.

* * *

134. Deme münkir olub zikr əhlinə bəs,
Başun kəsilməsün dersən, dilün kəs.

Özüni mö'min ikən kafir edüb,
Həqün zikrinə demə batil, ey xəs.

Görüp gülün yüzüni bülbül ötsə,
Nədən tə'n eylər ana zağü kərkəs.

Həva qovub gəzənə hərzə yerə
Degüz badə uyub, ancax yelüb əs.

Pəlas edici, ey heyvan libasun,
Mükərrəm adəm olup gey sufü ətlas.

Yünüp eşq ilə xak edüb özüni
Bilür neyçün yenər dövr ilə quqnəs.

Özündən tahir olmayan təmami
Demə Həqün kəlamını, edəməs.



Görüp hər nakəsi kəs demə, zinhar,
Çü nakəs olmaz imiş sınadım kəs.

Gözün aç gün kimi dövranə bax, gör,
Sənünçün çevrinür çərxi-müqəvvəs.

Deməgüz Gülşəni zikrini bilə,
Könül kim olmaya tahir müqəddəs.

* * *

135. Eşq ərinin xirqəsi olmaz imiş çul, pəlas,
Yolunu urmaz imiş hər nə geyərsə libas.

Sufi-səfasuz geyüp etmə qiyas özünə,
Xirqəyi-təlqid ola səffət içün iqtibas.

Keçi, qoyun kimi çul geyənə təlbis ilə
Xirqəyi-iblis olur zərqə görə iltibas.

Nəfsini öldürmədin, xirqəvü tacın qəra,
Nişə geyər dutuban diri ikən ona yas.

Sufi olup səffətin xirqəsini geyə gör,
Sidq edüp ixlas ilə xirqənə dildən əsəs.

Sufilərün xirqəsin zərqü riyadən geyən
Qəlb olubn duyulur qəblimə zərdən nəhas.

Könlüni əritmədin Kə'bəsifət geyməgil
Kisvətini pirinün donunə edüb qiyas.

Xirqəyi pirdən geyən teyyibü tahir gərək,
Güzgü kimi könlünə qoymayuban jəngü pas.

Nəfsi Süleyman edən qayir imiş mö'minin,
Xirqəyi-təslim imiş olubanü şərrü nas.

Samirinisbət olup əcli-həvayə tapan
Görübənü den ana virdin edə lami-sas.

Zahirü məhsusini batinə kisvət edən
Bildi nə yüzdən olur xirqəyi-batin həvəs.

Rövşənidən Gülşəni xirqəsidür Məhmudun
Kim, anı xas oluban eşq ilə geydi əyas.

* * *

136. Yanxuban könlümi eşqün binədən qodi ayas,
Olmasun deyü bilən mə'ni evinə al yas.

Könlümün beytül-ətiqə döndügi ol yapudur,
Əql ilə yapılan əvi qılmaguz ana qiyas.

Eşq ilə yapılan əvdür qibləsi aşiqlərün,
Qibləyə yüz döndürən dəm anı edər iqtibas.

Eşq ilə yapıldığıçün qiblədür beytül-ətiq,
Kə'bəyi-əvvəl o yernə qiblə qıldı rəbbi-pas.

Rövşəni qoyar eşqüllah ilə çün könli bünyadını,
Gülşəni, me'marsən həm andan etgil iltimas.

* * *

137. Ey gülüstani-aşiqan, vəslün bana gülzar imiş,
Nəqşi-fəraqün canə çün saçıldı, bildim xar imiş.

Sevgün imiş təndə rəvan, ey canumə canan olan,
Eşqündən özgə yar olan çün [ki] bana əğyar imiş.

Dirilərəm, bir nəfəs səndən cüda düşsəm, eşit,
Sənsiz dirilmək çün bana can verrnədən düşvar imiş.

Hüsnün görən Musa sifət vəchün təcəllisin dilər,
Bilindi məqsudi anun səndən həmin didar imiş.



Eşqünə verən özüni, qılmaz xirəddən sözüni,
Bilməz itirüb özüni, bulanda xud bizar imiş.

Sal namü tənü namusi, biar oluban aşiq ol,
Eşq əhlinə namusü nam əqlinə görə ar imiş.

Mənsur "ənəlhəqq" deyübən sirr pərdəsin faş eylədi,
Ol pərdəyi yırtan yeri Həqq ğeyrətindən dar imiş.

Sorman neçün öldürdilər Mənsuri darə çəkübən,
Çün münkirün daim işi inkar ilə idbar imiş.

"Qalü bəla"də əhd ilə iqrar edüb dedüm: "Bəli!"
Ol əhd oluban der bana iman həman iqrar imiş.

Vəhdət gözilə yüzüni görməyənə müşrik derəm,
Kəsrət yüzün birdən görən eyni-ülul-əbsar imiş.

Zahid həvasın sanub təsbih ilə zikr eyləsə,
Dildən pütə tapduğunə tanuği ol zünnar imiş.

Eşqündən özgə yox imiş, nə xud qəm ilə təşvişim,
Könül verübən almışam candan rəvan dildar imiş.

Yüzündən özgə arifə cənnət gərəkməz, ey pəri,
Çün andan özgə ədn ana pəs xari-bimiqdar imiş.

Günəş kimi aydın yüzün doğalidən bilindi uş,
Ey məh ki, vəchün tabişi ol nuri saçan nar imiş.

Allah nurunun mə'nisin zahir qılanda surətün,
Ol şani xəlqə görsədən Həqqdən yəqin dildar imiş.

Gülşən yanağun şö'ləsi dağ urdu qızğun canıma,
Yandı rəvanum eşidüb mehr ilə işüm zar imiş.

Açılalı hüsnün güli bilindi, ey gülzari-can,
Bin Gülşəni kimi ana bülbüli-həmzar var imiş.

* * *

138. Eşq əhlinə cənnət kimi yüzün gülü gülzar imiş,
Aşiq olanun cənnəti mə'şuqdən didar imiş.

Ey gülüstani-aşiqan, sənsiz gülüstani-ədəm
Aşiq qatında bildüm uş, bəs xarü bimiqdar imiş.

Acı fəraqün şərbətin nuş edərəm datlu, vəli
Səbr eyləmək hicran ilə can çəkmədən düşvar imiş.

Müştaqə bir dəm sənsüzin dirlik olmadı, ey sənəm,
Hicr ilə candan aşiqün anun içün bizar imiş.

Bir dəm yüzün görmək içün iki cahanı tərk edər,
Didarına aşiq olan məqsud ana çün yar imiş.

Canü cəhandan keçməyən eşq ilə bil biganədür,
Zira özünə yar olan eşq əhlinə əğyar imiş.

Ruzi-əzəldə eşqünə əhd edübən dedüm: "Bəli"
İmanü din bu dəm bana ol əhd ilə iqrar imiş.

Mənsuri-eşq olub necə derəm "ənəl-eşq"[15]i, eşit,
Gərçi kim anı deyənün eşqünə yeri dar imiş.

Münkir inanmaz vəchünə, qıldı məlayik səcdəsin,
Şeytansifətçün həqq ilə batil işi inkar imiş.

Həqdən səni ayru deyən tövhidini bilməz nədür,
Ol kor içün münkir kimi, kim der "ülul-əbsar"[16] imiş.

Əhvəl kimi biri iki gərdigiçün müşrik olur,
Münkir kimi həqq bilməyən çün rəhbəri-füccar imiş.

Hər abidin kim qibləsi yüzün degildir, ey sənəm,
Tərsa kimi bütə tapar, belindəki zünnar imiş.



Qiblə yüzündür arifə hər vəch ilə Kə'bə sifət
Qüdsi-həramdan gördügi çünki rüxi-dildar imiş.

Hüsnün gülüstanun görən bülbül bilür zövqün anun
K'ondan nəsibi münkirün nuş ilə nişi-xar imiş.

Zahid neçün inkar edər həq surətindən göz yumub,
Ta kim bilindi məclisi-iqrar ana inkar imiş.

Naseh, görüp rüsva məni eşq ilə mən' etmə derəm,
Çün rindü bədnamə sözün incitməvü azar imiş.

Eşq anlamıyan namusun, demə ki, ari var anun,
Ar etməyənlər eşqi çün namus ilə biar imiş.

Hər kim ki toğru yolunu eşq ilə aparmaz isə,
Şeytan kimi əgri gedüp yoluni ol azar imiş.

Bikar olan bilür nədür aşiq olan kirdarini,
Eşq əhlinə xəlqün işi çün süxənü bikar imiş.

Yusif kimi hüsnün məzad edər görən bir-birinə,
İki cəhanun xəlqinə eşqün nə xoş bazar imiş.

Turü təcəlla sirrini vəchün görən bilür nədür
K'ol Rövşənidən Gülşəni gördügi nurü nar imiş.

* * *

139. Görən gün yüzə zülfün sayə düşmüş,
Bulut kölgəsi sanur ayə düşmüş.

Gözün açalıdan görmədi dövran,
Yüzün tək ayü gün həmsayə düşmüş.

Günəşnisbət yüzündən rövşən, ey məh,
Qara xalın içün ay dayə düşmüş.

Çəküp qaşun yayın kirpik oxundan
Canum ox gözədür, dil yayə düşmüş.

Pərişandur könül zülfün görəldən
Onunçün baş qoyuban payə düşmüş.

Gözün can aluban könlümi qoydu
Ki, ol türki-Xəta yəğmayə düşmüş.

Görəldən toğru qəddün sərvi-azad
Uzanub boy çəkər balayə düşmüş.

Ləbündən cam içən dirilüb ölməz,
Anunçün Xızrə ondan mayə düşmüş.

Utuzmaz nəğdüni eşqünə verən
Ki, sevgün əlinə sərmayə düşmüş.

Qılan sirrini eşqün aşikarə
Görən Mənsur tək qovğayə düşmüş?

"Ənəlhəqq" zikridir sadiq olanun
Yalançılar ilən illayə düşmüş.

Açarmı ağzını dürr olmayınca
Sədəfdən qətrə kim dəryayə düşmüş.

Əcəb yaqut imiş dilün müqərrəh
Ki, nütqi lə'li-ruhəfzayə düşmüş.

Görən Məcnun sifət, ey Leyli, halum
Ğəmündən der əcəb sevdayə düşmüş.

Verəldən Gülşəni eşqünə canın
Rəvani "Cənnətül-Məva"yə düşmüş.



* * *

140. Yüzünə surəti-rəhman dedilər, gerçəkmiş,
Qaşuna ayəti-fürqan dedilər, gerçəkmiş.

Göz açup müshəfi-hüsnün görəli pirü cəvan
Oxuyub, vəchünə Qur'an dedilər, gerçəkmiş.

Qapalı könlüni xəlqün, qılubən ömrüni az,
Gözünə fitneyi-fəttan dedilər, gerçəkmiş.

İçübən ləblərün abi-həyatın der isən,
Ləbünə çeşmeyi-heyvan dedilər, gerçəkmiş.

Görübən yüzüni Həqdən qaçub inkar edənə
Sögübən div ilə şeytan dedilər, gerçəkmiş.

Sənə qamətdir olan xəlqə qiyamət ki, rəvan
Görübən qamətün, "ey can", dedilər, gerçəkmiş.

Bitəli gülşəni-hüsnündə bənəfşə kimi xət,
Xətünə vərd ilə reyhan dedilər, gerçəkmiş.

Görübən eyni məlahətlə rəvan qəddün içün
Bu məlahətdar olan an dedilər, gerçəkmiş.

Girəli Yusifi-Misri kimi hüsn iqliminə,
Səni ol mülkə çü sultan dedilər, gerçəkmiş.

Qılubən vəhləyi-zil ağzun üçün əhli-yəqin
O gümandan neçə bürhan dedilər, gerçəkmiş.

Qılalı gəncini hüsnün qəmu vəch ilə əyan,
Ana yıxux dili-viran dedilər, gerçəkmiş.

Dilədim dərdümə dərman bulam, ey dil diləgi,
Genə dərdün ana dərman dedilər, gerçəkmiş.

Düşəli qeydinə zülfün, dilərəm həllin anın,
Cəşni ol müşkülə asan dedilər, gerçəkmiş.

Görə [li] vəchini bildim nə imiş cənnətü hur,
Yüzünə rövzeyi-rizvan dedilər, gerçəkmiş.

Dirilib eşq ilə ölməz canını sana verən,
Canumə sevgüni canan dedilər, gerçəkmiş.

Görəli yüzüni bildim, itürübən özünü
Ki, sənün vəslünə hicran dedülər, gerçəkmiş.

Gözünün tifli kimi Rövşənidən Gülşənini
Görənə dideyi-nisan dedilər, gerçəkmiş.

* * *

141. Çatalı göz ilə qaşun, ey sənəm, bir yerə baş,
Fitnəsin eyni-tatarun sirr ikən eylədi faş.

Görsədüb dövri-qəmərdə gün kibi yüzün züha
Ğeyrətindən ay yüzini durmayub qılur xəraş.

Ölübən eşq ilə dirlik neydügini biləni
Ömrüm ondan dilərəm ki, eşqə görə ola baş.

Görmədüm türki-mütərrün qatıcı çeşmün kibi
Kim sələhpuş ola daim etmədin qəsdi-savaş.

Zahidi-hüşkə derəm kim ağlamaxdan bitməz iş,
Tər oluban quru yerə necə tökər pəslü yaş.

Mehr ilə könlümi dilbər alıbanü ta dilər,
Can dəxi dilərsə, derəm ana, ey cəddim, araş.

Sarmaşub zülfünə, ey dil, qeydə saldun canımı,
Bənd isə bəsdir bana ol mubəmu ancaq dolaş.



Diləsən vəslinə irmək, hicrət et bəndən rəvan,
Üzülüp özündən ol dəm mehr ilə eşqə ulaş.

Ey könül, aldanma lütfün görübən əhli-dilün
Nəzmi-ğəbz etsə Həlimi sanma gəl anı yavaş.

Gülşəniyi bənzədənlər Rövşəni zəxmin yedi,
Gər bana inanmaz isən incidüb anı ziyaş.

* * *

142. Eşq imiş əql əhli içün bəlayilə həm məlas,
Oldur edən aqili çün hər təkəllüfdən xilas.

Eşq ilə Məcnun olanlar xəmr içüb qan ilə,
Səd urub kimsə diləməz qətl içün ondan qisas.

Görübən əql ilə ammun gecə-gündüz təşvişin,
Eşqə verər könülni ol qorxudan cümlə xəvas.

Aç gözün ağü qəradan, bax cəhanun xəlqinə,
Eşq ilə əql əhli kimi seçilür amm ilə xas.

Eşqi bil əlmas nisbət cövhərün qiymətlüsin,
Nispət etmə əqli ona, bil məadindən xilas.

Eşq əlindədir nə varsa əvvəl-axır, xürdü küll,
Görsədəməz çünki ansuz nə ki vəch ilə min as.

Gülşənidən qaçər bax münkiri-şeytansifət
Çün Ömərdür şeyxi anun, sanma ola əmrü has.

* * *

143. Bən bu mülkə gəlmədən cövhər idim bierəz
Bilməzəm ol cövhərə noldu ərəzdən ğərəz.

Necə ərəzsiz olur deyənə cövhər, derəm
Kim, ərəz ol cövhərə nədür olan münqərəz.

Qəlbini saf etməyən bilmədi cövhər nədür,
Çünki qərəzdən törür cövhəri-qəlyə, mərəz.

Kim ki bu gün cövhərin biərəz etməz, bilün,
Vərhəm olub qəm ilə danla bulisər mərəz.

Rövşənidən görənə Gülşəninün vəchini
Sor ki, bilür nədür ol cövhər olan biərəz.

* * *

144. Aluban mehr ilə könlüm o şəhi-xuban əvəz,
Nə verisər bilməzəm can alub, canan əvəz.

Qılalı Misri-dilümdə Yusifi hüsnün məzad,
Canü dil verüp bəha, çün almışam sultan əvəz.

Dərdinə verüp könül, dərman dilərəm canımə
Dərd olur yenə dəvasından ana dərman əvəz.

Aluban ömrümi eşqün pür edəli, ey cavan,
Hər nəfəs bir ümmi-tazə verür dövran əvəz.

Nəqdi-ömrüm sərf edəli eşqinin yolunda uş,
Vəch edüp bir yüzlürəm nəqd anunçün k'an əvəz.

Gözlərüm qanlu yaşın etsə payunə nisar,
Xaki-payündən bulur ol dürr ilə mərcan əvəz.

Başumi tup eyləyüp meydani-eşqə girəli
Verübən ol tupi, aldım sirflə çövkan əvəz.

Cəhl imiş canü könüldən verilməklik eşqinə,
Canü dil ana verübən almışam irfan əvəz.

Həsrətündən tökə gözüm gözmə seyli-rəvan,
Qətrəyi-bər tökübən yüz bulur tufan əvəz.



Xərci-eşq et nəqdi-ömrün ki, ol durur hüsni-fərz,
Yerinə dün on deyübdür ruhlə rəhman əvəz.

Görübən eydi-cəmalun canını qurban edən
Bulur ol qurbandan, ey can, vəsl ilə qurban əvəz.

Tərki-surət qıl, dilərsən surətün mə'na ola,
Cani tərk edən bulur çün surəti-canan əvəz.

Rövşəni halinə bəsdir, Gülşəni, hali-dilin,
Diləməz halın bilənlər qal içün bürhan əvəz.

* * *

145. Qoyamaz müshəf yüzinə katibi mişkin nüqət,
Nöqtəyi-xalun kimi yüz məşq edər isə nüqat.

Qıl qələmdən kim çəkirsə qaşlarun xətti kibi,
Mubəmu nəqqaşi-Çinin gər çəkə, qılur ğələt.

Yazmadı hərfi-cəmalun nun dəvatından qələm,
Gələ bu təbi-hikmət anı qüdrəti qılmadı qət.

Lövhi-məhfuzun təmami yeddi müshəfdən olan
Yazılan səb'ül məsani vəchünün xətti fəqət.

Yüz sühuf bir hərfrəsdən oxusam, dana fəqih,
Danmadır elmi-ləduni, anlamazsa hər səqət.

Katibi-qüdrət çəkəldən qaşlarınun hərfini
Qıl qələmdən ancılayın yazamaz leyk kimsə xətt.

Qıldan incə mu qələmdən xud qaşun manəndini
Bin çəküp nəqqaşi Çinun, bulmadı bir məhətt.

Dedi me'racə varanda rəbbimi gördüm nəbi,
Rubəru biçün yüzini əmrdə bənzər qətt.

Bənzədür məsnu'i-sane' mənşinə nəqqaş, leyk
Çin budur, yüzini görən der ana nəqşi-şətt.

Bulamaz nəqqaşi-Çinün qıl qələmdən ustad,
Qılların nəqş çəkici can verübən qıl qələt.

Müshəfi-hüsnün oxur Gülşəni ümmül-kitab,
Zahid anunçün inanmaz batini kimi bətt.

* * *

146. Ol səbukruhə degüz kim, eyləmə həmdəm ğəliz,
Həm ağırcanluyi qılma kəndünə həmdəm ğəliz.

Təlx edər işvəni candan, ey pəri, şirin ikən,
Turş edəndə yüzüni ğəmdən olub vərhəm ğəliz.

Haləti-eşqüni görüb çünki kəsməz qalini,
Diləgüm budur o dəmdə: – Lal ola əbkəm ğəliz.

Necə görüb deyəyim qulü səfih ol əhmeqə
Kim, ola eşqünə münkir, əql ilə sərsəm ğəliz.

Görübən yüzüni canın verməyəndir, ey pəri,
Sor ta andan olan adəm-heyvan sifət adəm ğəliz.

Verməgüz əhməq cəvabın ixtiyarət edüb sükut,
Örtürür sözini çün kim qılmayubən kim ğəliz.

Görübən eşqinlə halum əhli-qal olan kimi
Nişə qılur növhəvü zar ilə matəm ğəliz.

Dönübən eşqün ilanə dəmbədəm, xəncərini
Diləsəm tiryaqin anun, ya ki qılursam ğəliz.

Rövşənidür Gülşəninün zəxminə dadü-dəva,
Tazələr dildən yarasın hər nə qılsa am ğəliz.



* * *

147. Qal ilə halum desəm, inləyüb etmək niza
Necə diriləm degüz eyləsə dilbər vida'.

Atlanub ol dilrüba yola girəndə nedim?
Çəkübənü canimi könlüm edər intiza'.

Bir nəfəs ansuz diri qılmazam, sınadım,
Çün tənimə can kimi ondan imiş intiba'.

Nola kurü kər görübən eşitməyüm,
Yüz çevirib "əlvida" dedügi dəm ol şüca'.

Biləməzəm dil sifət dilbərə həmdəm nedim?
Can kimi yox yenə cün layiq anunçün məta'.

Bir demək olsa, rəvan yüz verürəm dilbərə,
Gər dilesə dəmbədəm etməgə anı biza'.

Rövşənidən Gülşəni Ay ilə Günəş kimi
Dövrə görə görsədür nuri-ziyadən şüa'.

* * *

148. Qaçəli eşqün xəyali başumə buldum fərağ,
Əql əlindən dəlü kimi seçməyübən solü sağ.

Diləröm şövq ilə eşqün zövqini deyəm nədür,
Candan açılmış anınçun bulmazam, nedəm, qulağ.

Eşq ilə mə'şuq sirri qal edüb halum, dərəm,
Çün könüldən dinləyənə ol kəlam olur bəlağ.

Diləsən candan dirilmək diri ikən ələ gör
Sınadım ol dirlik içün ondan özgə yox yərağ.

Sorana eşqün təriqin tacini irağ yaxur,
Derəm, ey əbləh, o yolda kim seçər yaxın, irağ?

Ayağun baş etməyüncə qoyma eşqün yolinə,
Ol yol içün çün gərəkdür günsifət başdan ayağ.

Rövşənidən özgə kimdir Gülşəninün gördügi
Aydın elində ziyadən gün kimi rövşən çirağ.

* * *

149. Məktəbi-hüsnündən oxur doğru qəddüni əlif,
Tifl dedim, kimi görən, rövşənidir, ey lətif.

Gün kimi hüsnün nəzirün kim görər, ey məhliqa,
Görmədi mislin anun xunü qəbz ilə şərif.

Gülşəni-hüsnün kimi tazə gülüstan nerdə var
Kim, xəzan olub bəhari gəlmiyə ana hərif?

Açılalı al yanağun ğönçədən, ey gülüzar,
Görübən bülbül tək anı, zariyə oldum əlif.

Mehr ilə yüzüni görən dağlanubən lalə tək
Nişə yanmasun həmişə, eşq ilə olub hərif.

Görəli ney kimi qəddə bağlamışdır can kim
Bildim ol zibayi-aləm kimdürür-xubi-zərif.

Ol səbukruhi görəldən bilməzəm siqlət nədir,
Eşq ilə səngin olan çün könlümə oldu xəfif.

Bir nəzər yüzüni görən iki aləmdən keçər,
Oluban məqrun onunla bilmişəm nədir nəsif.

Mubəmu sövdayi-könlüm sarmaşani zülfünə
Milləti-eşq içrə oldur biləne dini-mənif.



Kim görür gəncineyi-hüsnün kimi bir gövhəri
Kim yədi-beyzasifət ol görsədə vəchi-tərif.

Ol səbukruhə giran can nispətini bilməzəm
Kim, qılur həmdəm əzinə ol lətifini kəşif.

And içüp eşqünlə könlüm əhdini sındırmadı,
Nerdə var müştaqi-möhkəm bir anun kimi xəlif?

Zahidün aldatma zərq ilə riyadən qılına
Sanər imanın içində almağ içün bir zəif.

Açırüp nəfsüni, sufi, qılmagil dərdün betər,
Ta rümuzatdan qılasan kəsbüni-xülqi-ənif.

Nişə abid tə'nə qılur rindi-eşqə bilməzəm,
Olmayu bin dəryadən pak dil ondan əfif.

Rövşəni kimi qəvinin eşqidür, ey Gülşəni,
Hər nəfəs ömrün kəmi qılan, səni təndən zəif.

* * *

150. Həqayiq mə'dəninin kanıdır eşq,
Ğərəssüz cövhərün dükkanıdır eşq.

Məhəbbət dənizin mövcə gətürən,
Təcəlli feyzinin ümmanıdır eşq.

Nədür cüz-küll vücudunun həyatı,
Derəm sorana: canlar canıdır eşq.

Məlahət aləmi hüsn iqliminün
Cahanda dövr ilə sultandur eşq.

Görən mehr ilə bir dilbər cəmalun,
Bilür kim ol cəmalun anıdır eşq.

Nəzər əhli olan gün kimi görür
Təcəllidən vücudun sanıdır eşq.

Nə deyüm vəsf edübən eşqi, çünkim
Olan əbkəm lisan irfanıdır eşq.

Şəhadət aləmində qeybi-mənzur
Kim etsə, sidq ilə imanıdır eşq.

Necə ğərq etməsün cüz-külli, çünkim
Məhəbbət feyzinin tufanıdır eşq.

Görən eynül-yəqindən həqqi, şəksüz,
Bilir əhli-yəqin bürhanıdır eşq.

Bilindi Gülşəninün Rövşənilə
Əzəldən əhd ilə peymanıdır eşq.

* * *

151. Dəmbədəm divanə könlüm qılubən sevdayi-eşq,
Dağə düşər dəlü kimi oluban şeydayi-eşq.

Faruğ olub xeyrü şərdən eşqə dapşurən özin
Nə bilür pərvanədür ol rindi bipərvayi-eşq.

Düşəli sevdayi-eşqə duymaz oldum halimi,
Bilmə özün, ey könül, kim olasan danayi-eşq.

Salubən namusü ari olmayan bədnamə bax,
Arü qeyrətdən olandır əql ilən rüsvayi-eşq.

Dərdi-bidərman imiş dərdinə dərman aşiqin,
Bəs dəvasın ondan istər mübtəlayi-vayi-eşq.

Fürsətün fövt etmə, ey dil, əldə ikən ixtiyar,
Demə danla kim bu gündür, istəgil fərdayi-eşq.



Ay ilən günəşdən aydındır görən eşqin yüzin,
Gün kimi rövşən göz açub görəndür simayi-eşq.

Sevübəni bəndəsini qulluğ edən eşq imiş
Bəndəlikdən tac uruban başına Darayi-eşq.

Bəndə demən qurbanü eşqə qul olanlara,
Aləmün şahidür olan bəndəyi-mövlayi-eşq.

Dərdi-dildür gözlərimün axıdan qanlu yaşın,
Ağladan tiflini eynün k'ola çün bəlayi-eşq.

Bağa girüp seyr edərkən, ey könül, ol sərv qədd
Görübən canun verə gör k'olasan lalayi-eşq.

Göz yumub iki cahandan birlik ilə keçə gör,
Gər dilərsən, Gülşəni, sən olasan binayi-eşq.

* * *

152. Nə sevdadur başumdə ğülğüli-eşq,
Xəyaldan eşidilən qülğüli-eşq.

Çalınur dəmbədəm talİblər içün
Möhübbət nəğməsindən cülcüli-eşq.

Hərarət verübən dildə bürüdət
Qomaz qala müdam san filfili-eşq.

Büraqi-himməti dildən möhübbət
Olan bilür nədür ol Düldüli-eşq.

Möhübbət cəzbəsini tövqin edən
Bilür boynunda nədür ğülğüli-eşq.

İçəli zövq ilə eşqün şərabın
Başumdən getməz oldu ol müli-eşq.

Möhübbət vəchini görəli bənsüz
Bana həm olmadı ol müşkili-eşq.

Nə məzhərdür bilinməz məzhər ilən,
Kimə sorun biləm ol mürsəli-eşq.

Nədür vəchündən özgə anü şandan,
Məzahirdən görünən cüzi-külli-eşq.

Bənəfşə, nəstərən, nəsrinü reyhan
Məhəbbətdən qorxudur sünbüli-eşq.

Olan təxmiri-qüdrət hikmət ilə
Bilür ondan nədür abü gili-eşq.

Açılup tazə, solmaz ədn içində
Qılup baqi məhəbbətdən güli-eşq.

Görəldən, Rövşəni, gülzarın eşqin,
Olubam Gülşənivəş bülbüli-eşq.

* * *

153. Nədür qüdrətdən özgə adəmi-eşq,
Nəfəxtü dəm olan həmdəmi-eşq.

Müqəddəs nəfx ilə dirilənə sor,
Nə dəmdən dirilüpdür ol dəmi-eşq.

Məsihasa doğan bilür nə dəmdən
Möhübbətdən doğurur Məryəmi eşq.

Cüneydü Şiblivü Turinə nisbət
Olun mə'nidən adəm Ədhəmi-eşq.

Məhəbbətdən bulan təxmiri qüdrət,
Olur sirri-xəfidən müdğəmi-eşq.



"Nəfəxtü fihi min ruh"dən əvvəl
Olur lövlaknisbət əqdəmi-eşq.

Sevübən saluban məhbubi həqqün
Olur izzət dəmində əkrəmi-eşq.

Fərəhdür, şadü xürrəm sanma ğəmgin,
Məhəbbətdən kim olsa dərhəmi-eşq.

Təhəmmün səbrü taqətdür yaralu
Könül xəlqinə candan mərhəmi-eşq.

Möhübbətdən oxuyan məhvi-nəhvin
Olur elmi-ledundən aləmi-eşq.

Saxın, ey Gülşəni, faş etmə sirrün,
Oluban Rövşəni san əbkəmi-eşq.

* * *

154. Əql ilə əglənməz nedim kinayəti-eşq,
Anunçün bilməz daima rəvayəti-eşq.

Tərki-həva həvəsdür fərman bu dəmdə, eşit
Kim, biləsən nə yüzdən olur inayəti-eşq.

"Sirri-nəfəx'tü fihi" bu dəmdədür, dəm dedi
Kim biləsən nədəndür biçün dirayəti-eşq.

Qüdrət dəmindən oldu fitrət möhübbət içün
K'ondan bilindi yoxdur məbdaylə ğayəti-eşq.

Nunü qələmdən oqudum dəmdən rəqəm qılmasuz,
Hərfi-məhəbbət ilə oldu kinayəti-eşq.

Kim bilisər müfəssəl mücməlsifət rəqəmdən
Sətri məhəbbət ilə neydügin ayəti-eşq.

Əvvəl məhəbbət ilə axır sifət yoğ ikən
Bir ilə nəydi olan birə bidayəti-eşq.

Dövri-möhübbət ilə bilindi əvvəl-axır,
Olmaz ki, xətm edübən deyəm nəhayəti-eşq.

Ey Gülşəni, nə yoldan oldu müvəddət ilə
Şəh Rövşəni izindən sana hidayəti-eşq.

* * *

155. Bəni hər dəmdə nedim öldürür eşq,
Qəra yerə dirilmə girdürür eşq.

Qılub rüsvavü məlamət, rindü bədnam,
Cəhan xəlqini bana güldürür eşq.

Nedim Məcnun kibi xəlqi cəhanun
Biri sevmədügini sevdürür eşq.

Girüb bazari-hüsnə sevdüginə
Bəha can ver, – deyübən öldürür eşq.

Olub məsti-xəyalun, unuduram
Özüm, xaçan önümə düşürür eşq.

Nə sevdadır başumda püxtəvü xam
Ki, mehr ilə dəmadəm pişürür eşq.

Qiyamətdir məgər bu sərv qamət
Ki, həşrin xəlqün ana düşürür eşq.

Cəhan ğovğasını aşiq başına
Arı kimi yığuban düşürür eşq.

Demin rüsvavü rində saxla halun,
Qaçan gizləyüb anı yaşurur eşq.



Gözüm dəryasının rövşən suyunu
Bulandırub rəvandan daşurur eşq.

Bana der Gülşəni kim Rövşəninün
Xiyalından bilümi şaşurur eşq.

* * *

156. Bilməzəm kim nə beladır başumə sevdayi-eşq
K'arturub, əksilməz başımdan dəmbədəm ğovğayi-eşq.

Çıxalı sevdası eşqün başimə zikrim budur
Ün çəküp zarılığ ilən: "Vay eşq", "ey vay eşq".

Görmədüm məhbubdən bixud valehü aşüftəhal
Olduğun buncılayın bir vadiyi-şeydayi-eşq.

İstəyüb dərdinə dərman kim bilür eşqün desün
Çünki ol dərdə dəva bulunmaz illa vayi-eşq.

Çəkmədi eşqün bəlasın, mübtəla olub demin,
Olə hər nadani-bixəs arifü danayi-eşq.

Rövşəninün eşqi ilə, Gülşəni, degil bana:
Kim olupdur sənciləyin bir dəxi rüsvayi-eşq.

* * *

157. Eyni-eşqəm, şini-şövqəm, qafi-zövq,
Yox bana nisbət, bənimçün təhtü fövq.

Varlığ ilə yoxluğum eşq olalı
Birdən oldur yüzin içün bəndə çoq.

Şahi-eşqə qul ola taxmışam
Bəndəlikdən boynuma eşq ilə tövq.

Eşq ilə *tey qılmışam əqlün ilən*
Qılmayubən banə nisbət seyrü sövq.

Eşq ilə seyr edəlidən bilmişəm,
Edəməz əqlün cəhani bəni övq.

Sevgüdən Salihsifət eşq olmuyan
Nisbət edər naqətüllah unuq.

Rövşənidən Gülşənidür zövqi-eşq
Ləzzət oldur talib içün zövqü şövq.

* * *

158. Məhəbbət şahının mövlasıdır eşq,
Həqiqət mülkünün ə'lasıdır eşq.

Ay ilə gün kimi nuri-ziyadan
Münəvvər aləmin tuğrasıdır eşq.

Nə əvvəl var, nə axır mülki-Həqqə,
O mülki-qüdrətün binasıdır eşq.

Müqəddəs beyti-mə'murun əzəldən
Əbədsüz bicəhət binasıdır eşq.

"Nəfəxət fih min ruhi" dəminün
Məhəbbətdən rəvan infasidir eşq.

İki aləm vücudinə bərabər, and,
Hüviyyət şaninün binümasidir eşq.

Əmanət gəncinin sirri-xəfidən
Dili-insan olan ətasıdır eşq.

Məhəbbətdən vücudi-qüdrət içün
Məvəddət nəqtünün lövlasıdır eşq.



Sühufi ümmül-kitab, nunü qələmlə
Rəqəm olanlarun qırtasıdır eşq.

Deyən "künti-nəbiyyün" içün vücudin
Kəlami-nəqdinin əbnasidir eşq.

Nə deyim Gülşəninin Rövşənidən
Nə yüzdən şəhsifət mövlasıdır eşq.

* * *

159. Məhəbbət məzbəridir adəmi-eşq,
Müqəddəs töfhədən olan dəmi-eşq.

Nəfəxət fih min ruhi dəmindən
Həyati-cavidandır həmdəmi-eşq.

Məhəbbət aləmində qüdrət ilə
Məvəddətdən olandır iqdami-eşq.

Məhəbbət bəhrinin bir qətrəsidir,
Yedi dərya məhəbbətdir yəni eşq.

Cəhani ğərq edən seylabi-tufan
Yağan yağmur sifətdir şəbnəmi-eşq.

Məhəbbət nütfəsindən doğana sor
Nə abdan zövc olandır Məryəmi-eşq.

Məhəbbət aləminün əvvəli yox
Ki ondan axır ola xatəmi eşq.

Süleymanə məhəbbətdən verildi
Hökümətçün cəhandə "xatəmi-eşq".

Məhəbbətdən müəllim sevgilidür,
Olan "lövlakə" nisbət Əkrəmi-eşq.

Məhəbbətdən Əlidir tə'limi-əsma
Ki, andan Adəm oldu i'ləmi-eşq.

Məhəbbətdən hüzuri elmi-rəhman,
Ki'nunlə ə'ləm oldu bil həmi-eşq.

Məhəbbətdən məzidü bikeyf nisbət,
Olan bir yüzdə iki müdğəmi-eşq.

Məhəbbətdən olur rənginü sadə
Bəsit ikən mürəkkəb dərhəmi-eşq.

Məvəddətdən ğənidir cudə məzhər
Ki, olur Gülşəni san xatəmi-eşq.

Ay ilə gün kimi Aydın elindən
Doğandır Rövşəni san tovəmi-eşq.

* * *

160. Əzəlsüz biəbəddir adəmi-eşq
Məhəbbətdən məzhər olan dəmi-eşq.

"Nəfəxtü fih min ruhi" dəmindən
Həyati-cavidandır həmdəmi-eşq.

Məhəbbət anun içün dedi: "Lövlak"
Məzahirdən odur çün Əkrəmi-eşq.

Nədir biəvvəl-axir andan özgə
Dəmi-qüdrət nəfəxt iqdami-eşq.

Oxuyan surəyi-Rəhmani bilür
Nədir tə'limi-Qur'an, aləmi-eşq.

Məhəbbət məzhər nədən Adəm oldu,
Cüneydü Şibli nisbət Ədhəmi-eşq.



Müqəddəs Adəmədir nəfxi-nətf
Məsihasa doğuran Məryəmi-eşq.

Fərəhdir sanma ğəmgin görə yanur
Öləndə hüznə məzhər dirhəmi-eşq.

Məhəbbətdən rəvan vəhabinisbət
Olandır cudə məzhər xatəmi-eşq.

Məhəbbətdən doğandır Gülşəni san
Olan şəh Rövşənilə tovəmi-eşq.

* * *

161. Məhəbbətdən nə sirridir kim bilür eşq
Ki, qeyb içün şəhadətdən bulur eşq.

Məvəddətdən bir ikən iki yüzdən
Sevib sevdürməgə özün gəlür eşq.

Məhəbbətdən vücudin cüzvü külsə
Şühudin şan edüb, cilvə qılur eşq.

Məhəbbət aləmində itənə sor
Nə yüzdən sevgilü vəchin bulur eşq.

Nedim yandırmadın andan rəvanım,
Bəni dildən oduna çün salur eşq.

Biləməzəm məhəbbətdən vücudin
Nə sirr içün xəfinisbət olur eşq.

Sor axı, Gülşəni, şəh Rövşənidən
Məhəbbətdən nə verübən alur eşq?

* * *

162. Nə məzhərdür müqəddəs ünsürün pak
Ki,acizdir onun dərkindən idrak.

Məhəbbət məzhəridir şani-vəchün,
Anunçun dedi Həq həqqünə "lövlak".

Bilindi "küntü kənzün" sirri səndən,
Hənuz Adəm yoğ ikən ab ilə xak.

Münəvvər ayağundan rövşən etdi
Yüzini sürəli payuna əflak.

Sənün kimi qədəm kim basdı ərşə,
Danadan seyr edüb ədnaya çalak.

Sənün eşqündən ötər bülbüli-məst,
Açılub gül qılanda qönçəsin çak.

Sənün mədhündədür çün cümlə əşya,
Səməndən eşidür mədhüni səmak.

Sana düşmənlik edənün dolaşur,
Boğazuna əməl çün mari-Zöhhak.

Şəfi'i hər günahkarun çü sənsən
*Nişə pəs Gülşəni olmaya bibak?!*

* * *

163. Yol arayım deyənə yedi əlamət gərək,
Əvvəli sidqü tələb, əhdə vəfa eyləmək.

İkisini sorana, eşqi derəm bilənə,
Talib olub gələnə cidd ilə qalsa gərək.

Üçü anun mə'rifət, talibə biçün sifət,
Bir görənə şeş cəhət, yeddü gögü nöh fələk.



Dördi möhübbət, həyat olmasıydı biməmat,
Faş edübən sirri-zat, xəlqə sifatın demək.

Beşi baqi fil-fəna, derəm uş anlayana,
Eşq ilə dinləyənə, çünki gərək söyləmək.

Altısı ölməx, bu xəlqə qoymax qədəm,
Heyrətə irüb bu dəm itrüb özün istəmək.

Yeddisi fərqü fəna, əcz ilə qılmax səna,
Rövşənidən, Gülşəni, bu yedi halun gərək.

* * *

164. Aşiqə dərdü bəla, izzətü zillət gərək,
Qəhr ilə mə'şuqdən lütf umana lət gərək.

Sorana sən, ey fəna, eşqə bəla de, bəla,
Oldun isə mübtəla dərdə, nə gürbət gərək.

Eşqi bil, ey mərdi-din, ağır əmanət yükin
Anı götürən əmin, sərxəfi-qüdrət gərək.

Eşq ilə dərdü bəla çəkmək anı mübtəla
Zövq ilə şövq, vey səfa mehrü möhübbət gərək.

Küfr ilə imanü din eşqədir əhli-yəqin
Məzhəbi-həqdən mübin, çün ana millət gərək.

Sufi isən eşq ilə safiliq istə, dilə,
Ta biləsən bibəha sufiyə səffət gərək.

Tərk ilə təcrid olan, fərd ilə təğrir olan
Sufiyə, ey xud filan, fəqr ilə ksvət gərək.

Rövşənidən Gülşəni görəli eşqün yüzin
Der ki, bana, ey Xəlil, sevgilü hüllət gərək.

* * *

165. Qiyamətdür məgər kim suri-eşqün
Çalınur dəmbədəm naquri eşqün.

Qulağ ur, gər degilsən suri-eşqə,
Çü ondan kər dürür münkiri eşqün.

Eşidürəm qiyamət qamətini
Deyəndə əs-səla məşhuri eşqün.

Xəta demək səvab olur nə qılsa,
Mühali-əql ilə məşhuri-eşqün.

Dönüb məcnunə mə'qudü rifali
Nə qılsa bixəbər məğruri eşqün.

Neçə aqilləri Məcnun edibdür
Cahanda şövqü zövqü şuri eşqün.

Neçə Xosrovsifət Şirin ucundan
Olupdur dərd ilə məşhuri eşqün.

Yalınuz Qeysü Leyli sanmıyasuz
Cəhan içrə olan Mənsuri eşqün.

Günəş kimi dutər yerin yüzini
O gecə kim ola mənzuri eşqün.

Çıxan şeytan kimi mərdud olisər,
Yaxın-irax çü olmaz dövri eşqün.

Həmrəc yoxdur, eşit həqqün kəlamın
Olanə əql ilə mə'zuri eşqün.

Görən Aydın elində Rövşənini
Nə yüzdəndür bilür ol nuri eşqün.

Görənlər Gülşəni vəchini bilür
Nə yüzdən dək olurmuş Turi eşqün.



* * *

166. Bənəm Simurğ ilə ənqasi eşqün,
Bilinməz Qaf ilə məvasi eşqün.

Məhəbbət aləmi qüdrət vücudum,
Ədəm sölə sifət illasi eşqün.

Əzəlsüz biəbəd nitqi-məhəbbət
Kəlam oldi bəyan "lövla"si eşqün.

İki aləm bənimçün yarədildi,
Bir ikən "zir" ilə "bala"si eşqin.

Bana nisbət bilinməz məhvü isbat,
Çü "illa"dən olubam "la"si eşqün.

Məhəbbətdən vücudum məhv edəli
Sübut etdi bəni imasi eşqün.

Məvəddətdən bilindi Qüdsü Kə'bə,
Təcəlli aləmi minasi eşqün.

Məhəbbətdən qoyuldu ərzi-dildə
Təvafi-ruh içün asasi eşqün.

Deyəməzəm məhəbbətdən cəhani
Nədir ədnayilə i'lasi eşqün.

Məhəbbət xızri olmayan biləməz
Nədir neçün sifət İlyasi eşqün?

Kim oldi Rövşənidən Gülşəniveş
Şəhinə qul ikən mövlasi eşqün?

* * *

167. Məhəbbət sirrinə məzhər olandır adəmi eşqün,
Nəfəxəti-fihdən Adəmi-müqəddəs həmdəmi eşqün.

Məvəddətdən zühur ilə bilinməz fitrət olandır
Xəfi sirdən nihan içün dəm ilə məhrəmi eşqün.

Məsihadəm olan bilür məhəbbətdən nədir nütfə
Ki, andan hamilə olur müqəddəs Məryəmi eşqün.

Əmanət sirridir məxfi məhəbbət məzhəri bikeyf
Ki qüdrətdir o məzhərdən olan hikmət dəmi eşqün.

İradət nitqinə "lövlak" olan bilür məhəbbətdən
Nə vəch ilə sevmələndir mükərrəm əkrəmi eşqün.

Bulan tə'limi-əsmayi müsəmmayi-məhəbbətdən
O elm ilə bilür kimdir müəllim, ə'ləmi eşqün.

Məvəddətdən zühur ilə nədür birdən iki tanı
Ay ilə gün sifət rövşən ziyadən bəd'əmi eşqün.

Cüneydü Şiblivü Nuri məhəbbətdən fitrəti cüz-küll
Olandır feyzi-cud ilə ğənadən xatəmi eşqün.

Məhəbbətdən zühur ilə bulan təcridü təfriqdən
Olur İbrahimə nisbət cəhanda adəmi eşqün.

Məhəbbətdən zühur ilə derəm, ey Gülşəni, sana
Cəhanda Rövşəni nisbət olubsan həmdəmi eşqün.

* * *

168. Ol məhəbbət aləminə şahi-dilxahi görün,
Mehr ilə mehdən münəvvər qüdrətullahi görün.

Hüsn elinə Yusifi Misri kimi sultan olan,
Xublarun iqliminə hökmedici şahi görün.



Türkü-tatarə dönüb qarət qılan könülləri
Qəmzədən şivə çərilü ol gözəl mahi görün.

Səltənət təxtinə kürsi ərşi Bilqeys ilə
Fərşü ərş ilə bərabər ali dərgahi görün.

Çünki qəlbi-mö'min imiş həq evi, şəksiz, yəqin,
Mö'min olub bəs könüldən fitrətüllahi görün.

Sirri-eşqi can içində saxlayım dedüm nedim,
Faş edübən anı rövşən pərdədür ahi görün.

Gözlərüm səgrür fərəhdən, məgər ol şəhbazi-hüsn
Atlanub seyran edisər arayub rahi görün.

Yusifi hüsni imiş əndam ilə çahə salan
Candan ol sultani-hüsnə qəbqəbü çahi görün.

Zülfü ruxsarın görənlər gecə-gündüz buni der:
"Sübh ilə bir yerdə cəm' olan səhərgahi görün".

Öldürüb divi-həvayi əqli-Asəf qılu göz
Eşq ilə olub Süleyman, həşmətü cami görün.

Rövşəni eşqinə könül verəlidən Gülşəni
Fərq edəməz məstə dönüb, kuh ilə gahi görün.

* * *

169. Bənəm hər vəch ilə kirdari eşqün,
Olaldan cəbr ilə muxtari eşqün.

Məhəbbət nütqümə lövlakə nisbət
İradətdən xəfi sərdari eşqün.

"Nəfxətü" sirriyəm, gənci-məhəbbət
Sevübən sevülən dildari eşqün.

Məhəbbət hamili məhmiliyəm həm
Mükərrəm qürb ilə əbrari eşqün.

Nədür zahir olan batin sifətdən,
Bilinməz bənsizin ətvari eşqün.

Möhübbətdən vücudum sirridür faş,
Məvəddət məzhəri, əsrari eşqün.

Yoğ ikən iki aləm bən diləndüm
Məhəbbətdən olan sərkari eşqün.

Məvəddətdən təvaf içün yapubdur
Dilümün Kə'bəsin me'mari eşqün.

Nedim əğyar olani biləməzəm,
Görəldən cüzvü kflldür yari eşqün.

Nəyə baxsam, məhəbbətdən gözümə
Görünür bicəhət didari eşqün.

Bənəm birdən iki şaninə nisbət,
Ziyadən nar ilə ənvari eşqün.

Sor axı, Gülşəni, şəh Rövşənidən
Nədənsən bəndəvəş sərdari eşqün.

Dönüp yüz bülbülinə bin həzaran
Olubam Rövşənisüz zari-eşqün.

Nedəm, ey Gülşəni, çün Rövşənisiz
Görünməz gözümə gülzari eşqün.



* * *

170. Bənəm dərd əhlinə dərmani eşqün,
Dəvasuz dərd içün loğmani eşqün.

Mərizül-qəlb olana səhhət içün
Şəfa şərbət olan fərmani eşqün.

Məhəbbətdən dilüm kibi bilünməz,
Danışdum mövc ilə ümmani eşqün.

Bənəm Nuhi zəmanun nəvhə ilə
Edən qərqi-cəhan, tufani eşqün.

Demə bir aləmə yüz bin cahani,
Gəlübəni gedir dövrani eşqün.

Möhübbətdən bənəm bir anə nisbət
Olan yüz bin cahandan şani eşqün.

Bənümçün açılur beyü şəradən
Möhübbət eşqilə dükkani eşqün.

Mənəm gənci-xəfi mülki-məhəbbət
Ki, oldur, sevgidən irfani eşqün.

Məhəbbətdən nədür bənsiz bilinməz,
Tükənməz binəhayət kani eşqün.

Mənəm məzhərsifət cəm'ilə fərqə
Məvəddət mehrilə fürqani eşqün.

Hürufü sövti sına sanmıyasuz,
Kəlamü nəfsdən fürqani eşqün.

Sor axı Gülşəni, şəh Rövşənidən
Nədür sənsiz desün dövrani eşqün.

* * *

171. Məhəbbət gülşəni içrə həzaran bülbüli eşqün
Ötər əfğan qılub dildən açılalı güli eşqün.

Cəhan qulağilə dolı səma'ü zövqü halətlə
Fəqanü nalədən cüz'-küll sayıncə ğülğüli eşqün.

Dirilə ölmiyən bilməz həyati cavidan ilə
Neşün dirilübən ölməz ölənlər bidilin eşqün.

Sübutin məhv edən bilür ədəm nisbət vücud ilə
Nədür həll olmayan, neçün bəyandan müşküli eşqün.

Məhəbbət cənginün sazın eşitməz kər sifət münkir,
Anunçun biləməz dəfvəş çalınsa çülçüli eşqün.

Məhəbbət xəmrini içən əyilməz sərxoşa dönüb,
Anunçun məst ikən bilməz nədür başda müli eşqün.

Nəfəxtü fih min ruhi dəmində ruhi insanın
O nəfx ilə həyat içün əsər biçün yeli eşqün.

Qılan təxmiri qüdrətdən müqəddəs tiyini hikmət
O dəm bilür nə hikmətdür müsəvvadən küli eşqün.

Məhəbbətdən vücud ilə qəzayi-əkbər etməyən
Biləməz ol qəza içün nədəndür Düldüli-eşqün?

Məhəbbət qeydinə salan dilin mütləq giriftari
Bilür ol qeydi bənd ilə nədəndür sünbüli eşqün?

Soraram Rövşəni deməz məhəbbət nitqinə nisbət
Nə dildən, Gülşəni, deyim ələstiylə bəli eşqün.



* * *

172. Ey bixəbər, ədəmdən degil, nədür vücudun?
Tavir kibi uyxudan biləm nədür şühudun.

Sabit görüb vücudun eyni-ədəmdə degil,
Nə vəch ilə qılur seyr nabudə görə budun.

Eynül-yəqindən açub gözünü, yum gümandan,
Hər vəch ilə dilərsən görmək yüzin vədudun.

İki cəhandan öndən vardı vücudun, amma
Bilməzsən əvvəl-axır ondan nədür vürudun?

Ol vücudun içün cud etdi qüdrətin həqq,
Mövcudə anun içün nişan oldu vücudun.

Eynün şəhadətini görsə dili-cəmalun,
Gün kibi zahir oldu tə'siri narü nurun.

İki cəhanda bazar quruldi hüsnün içün
Kol bim ilə şəradən bilindi xüsrü-sudun.

Ey Gülşəni, sudan pak, ari tənün görürəm,
Tövbə suyilə çünkim cismüni ari yudun.

* * *

173. Gizli degil görənə hümməti dərvişlərin,
Həqdən imiş çün olan qüdrəti dərvişlərin.

Kim deyisər qəhr ilə baqduğidən bir degüz
Həqdənmiş cövr o dəm heyrəti dərvişlərin.

İki cəhan sevgüsin salmıyubən könülə
Həqq ilədir daimi ülfəti dərvişlərin.

Mülki-cəhani xərab edər imiş incünüb
Qəhr edicək malikin hümməti dərvişlərin.

Misri-qılıncın betər kəsər imiş çalıcaq
Düşməninün boynuni iynəti dərvişlərin.

Uş bu cəhan xəlqini qəhr edübən qırmadı,
Qılmasa səbəq ğəzəb rəhməti dərvişlərin.

Mö'min olanda nişan şəfqət imiş, anladım,
Andan imiş xəlq ilə rafəti dərvişlərin.

Yetmiş iki millətə bir imiş, iki degül,
Gördüm axı eşq ilə milləti dərvişlərin.

Nəfxəyi-suri əzəl olduğunu duy nədir
Zində qılan dəm görüb nəfxəti dərvişlərin.

Sidrə ilən Tubayı eşidübən gördüm uş
Cənnət içində rəvan qaməti dərvişlərin.

Ay ilə günəş kimi rövşən edər aləmi
Rövşənidən vəch ilə təl'əti dərvişlərin.

Xirqə ilən tacını deyəməzəm, fərz olur
Sünnəti-əhbab ikən bid'əti dərvişlərin.

Dildə ədavət yə'qin qoymaz imiş büğzi-kin
Söhbət ilən, ey əmin, xilqəti dərvişlərin.

Əhli-həqə üns edüb, sevdir özünü ona,
Çünki həq ilə olur söhbəti dərvişlərin.

Qeyrət edüb qeyrə çün əhli-qəbab etdi həqq
Kim bilisər pəs nədir qürbəti dərvişlərin.

Çünki sevər həqq qulun, ayru degil bəndədən,
Andan imiş şahidə hörməti dərvişlərin.

Mə'ni gərək dərvişə, tac ilə xirqə nədir?
Mə'ni dürür çün olan kisvəti dərvişlərin.



Gün başına beş görəm bəngi-səlah eşidən
Eyni-fəlahə nida növbəti dərvişlərin.

Cəm' oluban bir yerə şövq ilə olur hüzur,
Zövqi-səfa diləsə ümməti dərvişlərin.

Demə xəta yaqılub eyb ilə görsən rəva
Çünki səvabə keçər həfvəti dərvişlərin.

Bildim axı, cəhd edüb bih edəli həqq ilə
Cənnəti-didar imiş qiyməti dərvişlərin.

Əxzi-əziz şadiyə dövlət ilən bil nədir
Qüdrəti-həqdən olan bit'yəti dərvişlərin?

Torpağa neçün sürür yüzlərini, sormazam,
Qiblədən ə'layikən həzrəti dərvişlərin.

Qulluğula bulalı səltənəti-daimi
Artuban əksilmədi dövləti dərvişlərin.

Məbdəyi-səri-vücud, bismiləyi-feyzi-cüd
Əvvəl-əzəl cümlədən xilqəti dərvişlərin.

Rövşənidən feyz imiş Gülşəninin gördügi
Gün kimi xurdən ziya xəlvəti dərvişlərin.

* * *

174. Anlayamaz kimsənə halini dərvişlərin,
Rəmz ilə desəm rəvan qalini dərvişlərin.

Loqmasına əl urub yemə rəvan, zəhr olur
Şirinübən zövq içün balini dərvişlərin.

Cidd edübən cəhd ilə yemiyisər kimsənə
Elm ilə qazandığı malini dərvişlərin.

Aldanubən, ey cəvan, alma dərəm, meyl edüb
Boşuyuban sərdüni zalini dərvişlərin.

Bin yıl imiş ömrün bir dəmi dildar ilə
Bildim o yüzdən nədir salini dərvişlərin.

Surəyi-rəhman gəlür mə'ni yüzündən əgər
Yandı vərəq sanasaq falini dərvişlərin.

İki cəhan şüğliğün diləsənüz daima
Qulu olun cəhd edüb balini dərvişlərin.

Samut olub dilsuzə dönmə gərəkdir rəvan
Söylər ikən görsənüz lalini dərvişlərin.

Sərvəri-əhli-səfa fəxri-cəhan Mustəfa
İzzət ilən bir dedi alini dərvişlərin.

İki cəhan kisvətin tərk edəli Gülşəni
Bildi nədir tərk ilə şalini dərvişlərin.

Ürvəvi-saçın neçün nöqtəyi təqrir edər
Gülşənidən sor desün dalini dərvişlərinin.

* * *

175. Təvafi-beyti-həqq edən bilür bayramini həccün,
Təqərrübdən mətaf ilə nədir əncamini həccün.

Ay ilə gün sifət sanmın ədəd tən sayılan gündür
Olan yövmi-ilah ilə təvaf imamini həccün.

Məhəbbətdən mütaf edən əzəlsiz biəbəd beyti
Bilür ol Kə'bədə nədür təvafdən kamini həccün.

Biləməzəm nə sevdadan xiyalın təvf edən kimsə
Qılur bayram o təvf ilə bina o hamini həccün.



Nedim sərdi deyəməzəm ilahın beyti-mə'murin,
Çü faş olmaz bəyan ilə desəm e'lamini həccün.

Məhəbbətdən təvaf edən məqsədi-beyti-mə'muri
Bilür ol Kə'bəyə nisbət qədəm iqdamini həccün.

"Əlif"dən "lam"ü "mim" ilə təvafi-beyti-həqq edən
Bilür ol təvaflə nədir əliflə lamini həccün.

Nedim yövmi-ilah ilə təvaf etməyən anlamaz,
Desəm yüz vəch ilə nədir bəyandan amini həccün.

Həvaylə riyadən təvaf edəni Kə'bədə görüb
Tanı kimdir o vəch ilə olan bədnamini həccün.

Nedim kami-mühübbdir təvafi-Kə'bədən məqsud
Ki, ansuz təvaf edən sanur xudayini həccün.

Dirilə ölmiyən bilməz kəfən nisbət nədür geyər,
Təvafə nisbət edən dəm rəvan ehramini həccün.

Biləməz ölmiyən eydül-əhvün təvvaf edən dəmdə,
Nədir eybi şəhadətdən xəfi əncamini həccün.

Səvafü mərdinin sə'yin nə kəsb içün işarətdir,
Ki andan kasibi xeyrin bilür ən'amini həccün.

Həqə təslim edən vəchün məhəbbətdən təvaf içrə
Nə növdəndir qələm içrə bilür ərqamini həccün.

Başun sevdasini dildən xəyal etmə təvaf içrə
Mətafun etməyib ondan xəfi əhvalini həccün.

Dilərsən mə'rifət bulmaq təvafi-Kə'bə edən dəm
Qomə qala əsər səndən deməkçün namini həccün.

Biləməz girməyən beyti-xəlilüllahi-Kə'bədən
Məqam içrə nə yüzdəndir iman islamini həccün.

Xəyaldan yuxisi içrə səyuxlar kimi təvf edən
Müənbər kimi sevdadən purər əhlamini həccün.

Nə deyüb anladım həqqə təvafdan püxtənün halın
Çü püxtə olmayan bilməz nədəndir xalinin həccün.

Nedim, ey Gülşəni, deməz bana şah Rövşəni sorsam
Nə yüzdən eydü əkbərdir biləm bayramını həccün.

* * *

176. Eşq əhlidir həmişə varanlar bəla yolun,
Bidərd olan nə anlar yəsari-xuda yolun.

Rahi-xudadə bari-bəlayə təhəmmül et,
Böylə dedi eşitdük ərənlər riza yolun.

Hər salikün ki zari-rəhi möhnət içrə
Mümkün degil ki, vari belə ol fəna yolun.

Ey saqi, əzəl içəlüm cami-"ləmyəzəl",
Dövri-diraz anlamışuz parsa yolun.

Hadi olursa kuyi-dilə eşqi-hüdhüdi,
Simurği-Qafə ilətəli əlhəqq hüda yolun.

Qıldı fədai canını həqq yoluna, vəli
Can qıldın fəda, bulmazsan Xuda yolun.

* * *

177. Münkir olub əql ilə qal etməgil,
Haləti-eşqi görüp fikri-mühal etməgil.

Zikr edübən haluni, dilə gəlüb qalini,
Bilməyüb əhvalini eşqə sual etməgil.



Eşq özüdür söyləyən yuxuda isən oyan,
Düşdə dəgül çün deyən anı xəyal etməgil.

Elmə duruş, bilə gör bilmədügün sorə gör,
Eşq ilə nöqsanuni əqlə güman etməgil.

Ey qaradan ağ yazan, elm ilə əməl qazan,
Cəhlə verübən düzən xəlqə vəbal etməgil.

Oxuduğun dutmıyub, doğru yola getməyüb,
Nəfsüni tərk etməyüb ağzunu zal etməgil.

Elm ilə tanı həqi, sana derəm, ey fəna,
Tərk edübən mabəqi cəhlüni hal etməgil.

Tanuya gör nəfsüni, ta bilesin rəbbüni,
Bilməyü-məhbubini hicri-vüsal etməgil.

Eşq ilə bulan rəvan, pir isə olur cavan,
Ansız olub natəvan Rüstəmi Zal etməgil.

Rövşənidən geymədin Gülşəninün kisvətün
İki cəhan tərkini tacuna dal etməgil.

* * *

178. Bilməyən dəm qədrini adəm dəgül,
Dəm bu dəmdür, çün keçən dəm dəm degül.

İstə bul bir adəmi kim, dəm bilə,
Bilməyən dəm adəmə həmdəm degül.

Dəm gözət xoş vəqt olub, həmdəm dilə,
Qəm yeyən dəmdən dəmə məhrəm degül.

Vermə ömrün badə məğrur oluban,
Bad ilən ömrün keçürmək dəm degül.

Demə həmdəm bulumazam istəyüb,
Keç dəmündən, istə bul kim kəm degül.

Həmdəm etməz əhli-ürfan özinə
Dəmdə əhdi hər kimin möhkəm degül.

Ənbiyavü övliyadur əhli-dəm,
Olmayan əhil dəmün ədhəm degül.

Hər ki, bilməz dəm nədür dəmdən, demə,
Ol axır müntəha xatəm degül.

Kim ki dəm dəryasına qərq olmadı,
Qətrə bilün anı, nəmdən yəm degül.

Bəndəlikdən dəmdə şahlıq qılmayan,
Bəndəsi ol şah olanun xəm degül.

Sahibi-feyz olmayan dəmdən-dəmə
Ruh içində cud ilə xatəm degül.

Əhli-hal olan bilür dəm neydügin
Anın içün qal ilən dərhəm degül.

Dəmdədür zövqü nişatü şövqü hal,
Bilməyən dəm zövq ilə xürrəm degül.

Dəmdədür dövran guya aləm aləmün
Andan özgə dövri bil aləm degül.

Əhli-dəmdür ölüyi dirildici
Demə anunçun İsa dəm degül.

Rövşənidən Gülşənidə istə dəm
Kim, ona münkir dəmi həmdəm degül.



* * *

179. Hər nəfəs bir elmə məzhər olmayan adəm degül,
“Nəfxəyi min ruh” nədən elm ilə həmdəm degül?

“Əlləm əl-əsma” dəmindən adəmi biçün sifət
Cüzvü külldən kim der anı elm ilə ə’ləm degül.

Nəfxəyi-ruh əl-qüdüsdən elm ilə tə’lim içün
Doğmuyan biçün sifət dəm İsəyi-Məryəm degül.

Hər kimün kim dərki Həqdən olmadı elmi-həyat
Ölüni dirildici dəmdən Məsihadəm degül.

Qüdrətünün elminə fitrət olmuyan hikmət dəmi
Müzhüri-məzhər sifət ol qüdrətə məzhər degül.

Bilməyən nitqi-möhübbət neydügin lövlək ilə
Adəmin sirrini həqdən bilməgə mərhəm degül.

Olmayan məhbubi həqqün bilməz adəm sirrini
Səvübən tanrumə nisbət adəmi-əkrəm degül.

İki aləm tərkinün təcridini təfrid ilə
Qılmayan tey zöhdə nisbət Şiblivü Ədhəm degül.

Elmini eyn etməyən həqqül-yəqindən şəksüzin
Dərk ilə bilüb yəqindən elmlə münəzzəm degül.

Rövşənidən Gülşəninin elmini mə’lum edən
Deməz iqrarından anı elm ilə aləm degül.

* * *

180. Görməyən vəchün həqdən sevgilü insan degül,
Ol məhəbbət surətindən məzhəri-rəhman degül.

Mehr ilə vəchün görənə rövşən, ey məhru, əyan,
Ay ilə gündən kim edər tabişi-rəxşan degül.

Görmə vəchün görinür yerinə qılsam nəzər,
Gün kimi hüsnündən özgə eynümə əyan degül.

Görməz vəchündən özgə sevgilü insan yüzin,
Vəchüni görən anunçun didəyi-heyvan degül.

Görəməz vəchüni, billah, eyni-insan olmuyan,
Gərçi gözdən gün kimi, ey məh, yüzün pünhan degül.

Sirrüni faş eyləyən naəslinə danayisə,
Daniş ilə adın anub kim dedi nadan degül?

Mə'rifətsiz adam imiş eşqüni kətm etməyən,
Qal edən çün hali-eşqi-aləmi-ürfan degül.

Görübən hüsnü cəmalun Yusifi Misri kimi
Kim der, ey dilbər, səni kim xub ilə sultan degül.

Can verüb eşqüni bildim bidəva dərdi-dilün
Bir mərəz nisbət ki, tibdən qabili-dərman degül.

Göz açan dildən bilür mehrün nədür, ey mahru,
Anun içün bilmək anı görmədən asan degül.

Eşq ilə dirilməyənə öz həvasından keçüb,
Tən degüz caninə anun, can isə canan degül.

Görməyən vəchün mələk tək səcdə qılmayan rəvan
Kim der, ey dilbər, o cinnün adını şeytan degül.

Qoymayan meydani-eşqə başini, candan keçüb,
Tub edüb çalmağa başın layiqi-heyvan degül.

Öldürüb Zali-həvayi, kəsməyən nəfsün başın,
Cəng içində pəhlüvanü Rüstəmi-dastan degül.

İrdi gəl meydani-eşqə, girübən yüz döndərən,
Övrət anı biliniz kim qabili-meydan degül.



Dünyanın bağı-İrəm tək sənsiz, ey dilbər, bana,
Mö'minün sicni kimi, xud kim dedi zindan degül!

Eydi-əkbərdir cəmalun, qaşlarun iki hilal,
İki bayram olduğuna kim dedi bürhan degül?

Zülfünün küfrünü görən bilür imanı nədür,
Kim der ol yüzdən görən vəchüni iman degül.

Nərgisi-məstün görəndən sərxoş olanlar müdam
Rövşənidən Gülşəni tək kim dedi heyran degül.

* * *

181. Eşqün cəfası çünki vəfadur, cəfa degil,
Ana cəfa deyən bilün əhli-vəfa degil.

Qəhrindən incinən biləməz lütfi-dilbəri
Eşq əhlinə derəm anı seçmək rəva degil.

Mə'şuqun cəfası vəfadur çü aşiqə
Yüz döndərən cəfayə sahibi-səfa degil.

Öldürməyən həvasını eşq ilə dəmbədəm
Heydər kimi cihad ilə ol Murtəza degil.

Tərki-həvayi-nəfsi bilün eşq ilə qəza
Kolmadı cihadi-Əkbərü Əsğər qəza degil.

Can verməyən ğəzadə Hüseyni-Əli kimi
Olub şəhid qazivü şət, bəla degil.

Zahid əgərçi tərki-həva qılisər demin,
Zərq ilə çünki tərki anun biriya degil.

Musa sifət kəlamini Həqq ilə söyləyən
Deməz ki, eşqi ol yedi-beyza əsa degil.

Eşqün "bəla" imiş adı çün mübtəlasinə,
Kimdir kim, ol bəlayi-dilə mübtəla degil

Həqdən bəlayi-eşqi nəva bilən özünə
Deməz bəlayə səbr etdün k'ol əta degil.

Bilməz nəvayi-eşqi nə derəm həvayi-qövn,
Andan həvayi-eşq içün ol binəva degil.

Görməz kəlami-hüsnüni münkir gözi, demə
Kol nəfs ilə baxan gözi eyni-əma degil.

Çəkmə əbəs əmək verübən əhməqə ögüt
Kol dərdə am qılan özi əsli-dəva degil.

Eşqün qəni qılur xəmudən binəvasini
Andan fəqirə kim dedi əhli-ğina degil.

Biganə olmayan özünə eşq ilə bilün,
Biganə dərdü əninə ol, aşina degil.

Kan etməyən vücudini eşq ilə, Gülşəni,
Munisi vücudi-xəlqə yarar kimiya degil.

* * *

182. Yetürmə vəhdətün cəm'in bu kəsrət içrə, ey ğafil,
Çü kəsrətlən qılan olmaz o vəhdət cəm'inə vasil.

Keçən haluni anmağıl, gerü gəlüb ələ girməz,
Gözətmə gələcək halun olub hal əhli, ey qafil.

Həva fe'lini tərk edüb, könül ver eşqə, ey talib,
Həvəsdən dil verən ana olur məf'ul hər fa'il.

Gəlüb nöqsan ilə getmə, kama irəmədin bundan,
Bilüb təkmili, ey talib, kamal əhlinə ol kamil.



Biləməz qal ilə qalan nədür hal əhlinün qali,
Ləduni-elmi nə bilsün xəyal ilə qalan cahil.

Nəzərdən söyləyən elmün yalan söylər qulaq urman,
Yalançı fəlsəf olanda bədihi elmini naqil.

Keçürmə ömrünü zaye verübən badədən badə,
İçüb cami-həvadən mey neçün sərxoşsan, ey ğafil?

Əzazildən betər nəfsə neçün uyuban azarsan?
Məgər şeytandur əslün kim, olursan fər' inə mayil.

Nə buldun gecə-gündüz də yeyübən-yatmadan bana?
Keçürüp ömrüni zaye həqə nisbətsən, ey batil.

Üruc edüb mələk kimi neçün göglərə ağlamazsan?
Ki ol ülvə görə daim dilərsən əfsəli-safil.

Yucadur mənzilin gögdən neçün qıldın məqamın yer?
Dönüb əksinə gedərsən oluban dəmbədəm nazil.

Səni nəfsündür ayıran yəqin bil həqdən, ey talib,
Ayırmadın səni irən ki, vəslün ola ol fazil.

Yalançı dünyaya neçün olub məğrur aldandun
Ki yığub yemədən getdün qazandığun qılub fazil?

Dirığa, ömrünü zay qılursan dəmbədəm, ey dil,
Deyübən pəndim eşidüb ola naqabili qail.

Eşidübən inandunuz qıluban təcrübə bildüm,
Demən iqbalə dil verür olan idbarinə mayil.

Məqami-əhli-ürfani biləndür arifi dövrün
Ki cənnətlə cəhənnəmdən nə xaricdür, nə xud daxil.

Nolaydı cin kimi münkir yer altında vətən qılsa,
Olub məsturi-div kimi qara yer üzünə hayil.

Verüb bu məzra içində nə əkdünsə biçəcəksən,
Bütü xümdən ki, sən əktün, qalacaxsan çü bihasil.

Dirilə Gülşəni nisbət ölüb dirilməyən kimsə,
Yemədi ömrünün barın, nə bilsün nədir ol hasil?

* * *

183. Bəni aləmdə bədnam eyləyən dil,
Cəhan rüsvalığın nam eyləyən dil.

Qılıban kami-eşqi sevgilü kam,
Bəni ol kamə nakam eyləyən dil.

Yudub qan sevdügindən həsrət ilə
Cigərdən qanım aşam eyləyən dil.

Sevüb Məcnun kimi Leyli didarın
Məhəbbətdən bəni ram eyləyən dil.

Düşürüb mürği-canım qeydi-eşqə
Məhəbbət danəsin dam eyləyən dil.

İçüb eşqün şərabından müdami
Bana ol cür'ədən cam eyləyən dil.

Verüb can ilə başum sevdüginə
Rəvanum nəqdin ən'am eyləyən dil.

Bəni təlvininə təmkini içün
Gəhi nüxtə, gəhi xam eyləyən dil.

Sevəldən Gülşənivəş Rövşənini
Ana can verməsə, əncam eyləyən dil.



* * *

184. Tərk eylə, münkir, küfrini, imanə gəl, imanə gəl,
Eşq əhlinə xidmət qılan sultanə gəl, sultanə gəl.

İnkar imiş yolun uran, səndən sana şeytan olan,
Şeytanuni tərk eylədün, rəhmanə gəl, rəhmanə gəl.

Əhli-dilün halın görüb kəs dilüni, qal etməgil,
Hüccət dilərsən hal içün, burhanə gəl, bürhanə gəl.

Eşq ərinün candur təni, can olmayan bilməz canı,
İstər isən bulmax anı, cananə gəl, cananə gəl.

Eşqün qənisindən eşit, fəqr ilə nə dərəm bu dəm,
Fəxr edübənü talibə, ehsanə gəl, ehsanə gəl.

Məcnun oluban eşq ilə görmək dilərsən Leyliyi,
Əqlün salub, eşq əhlinə divanə gəl, divanə gəl.

Eşqün yoluna girməgə ayax yerinə baş gərək,
Zal olmayub Rüstəm sifət mərdanə gəl, mərdanə gəl.

Eşqün bəyani hərf ilə tərkibə sığmaz nə deyim?
Ondan kəlami nəfs içün ürfanə gəl, ürfanə gəl.

Eşqün cəmalın görübən bayram edər çün eşqəri,
Ol eyd içün can verübən qurbanə gəl, qurbanə gəl.

Çün eşq imiş dövrə girüb dövran edən, ey Gülşəni,
Rövşən günəşnisbət olub dövranə gəl, dövranə gəl.

* * *

185. Nədür qalsuz dili hal əhlinün bil
Ki, rəmzi-imadur andan həlli-müşkil.

Çü olmaz hərf, sövtü qalə nisbət
Zəbani-hal içün idrakə şamil.

Nə desəm anlamaz eşq ilə halum,
Verən qalə könül əql ilə şağil.

Möhübbətdən məzac olur təxəllüm,
Nə bilsün ol dilün nitqini cahil.

Məvəddət nitqidür eşqün bəyani
Ki, halumdan olur qal ilə naqil.

Həqiqətdür bəyanum nitqü haldan,
Məcaz eşitmə ondan qövli-batil.

Nöşün münkir olursan hali-eşqə
Xirəd qalindən, ey məğruri-batil.

Əməl qıl elm ilə seç hali qaldan,
Himarə dönmə olub elmi-hamil.

Nöşün şərri-dəvab edərsən özün
Əsəm, əbkəm sifət cəhl ilə aqil?

Verüp nəqsə dilüni diləməzsən
Kəmali-halət ilə olma kamil.

Könül, idbarə vərəni sınadum,
Edüb idbari tərk, olmadı məqbul.

Xəlilasa gərəkdür talibi-həq
Ki, tərk keçə hər nəyisə afil.

Qoma, ey Gülşəni, olub qələndər
Vücudundan qıla qal ilə bir qil.

Soraram Rövşənidən bana deməz
Nədür səndən anunçun dilrüba dil.



* * *

186. Məhəbbətdən nə sirrün adıdür dil
Ki, cəm' ilə odur hər fərqə qabil.

Əhəddən vahidün fərq ilə cəm'i
Derəm dildür-iki vəchə müqabil.

Nə sirrdür dil ki, faş olmaz bəyanda
Cüzü kül olsa ondan vəsfə qabil.

Bəsit ilə mürəkkəb sirri dildir,
Ki faş etməz bəyanın bin rəsayil.

Dilün sirri nədür-bürhan məhəbbət,
Ki, eşq olur ana hüccət dəlayil.

Tükənməz elmə dildir məzhər olan
Nəhayətsiz bəyan ilə məsayil.

Dil anlar, dil dilini dildən istər,
Nə der dil bilməsin, ey mərdi-sayil.

Desəm neydügini sirri-dilün faş,
Dil olmayan nedəm bilməz nədür dil.

Nədür faş olmayan sirri-məhəbbət
Ki, dildən olanın hali-müşəkkil.

İradət sirri-dildür eşqə nisbət
Möhübbətdən olan lövlak məsayil.

Əmanət sirri-dildir adəmi-eşq
Olan birdən iki vəch ilə amil.

Nə qüdrətdür bilinməz sirri-dilün
Ki, onsuz yox deyən məqsudi-atil.

İradət sirri-dildir fitrət içün
Deyən bikeyf dəmdən anı cail.

Xilafət sirri-dildir fitrətullah,
Məhəbbət məzhəri insani-kamil.

Oxunan elmi-dildir, cüz'-küll əsma
Müstəmedən bəyan içün təmasil.

Könül me'racinə yox kim deyələr
Məqami-mərtəbə mənzil mərahil.

Nədür sirri-məhəbbət dildən özgə
Ki, anı bilməyən oldu əzazil.

Sorarəm dil nədür şəh Rövşənidən
Dil oldur, Gülşəni, dildən dili dil.

Məhəbbətdən səvüb dildən bəyanum
Kimi heykəl edər, kimi həmayil.

* * *

187. Məhəbbətdən cəhandur aləmi-dil,
Zəmansız laməkandur aləmi-dil.

Nə qüdrətdür cəhan dili bilinməz
Ki, hikmətdən rəvandur aləmi-dil.

Tükənməz devrinə yoxdur nəhayət,
Cəhani-cavidandur aləmi-dil.

Nə qüdrətdür bilinməz birdən iki
Ki, ondan ani-şandur aləmi-dil.

İki vəch ilə bir yüzdən görünür,
Cəhani kün-fəkandur aləmi-dil.



Bəsit ilə mürəkkəbdən müqəddəs
Olan biçün cəhandur aləmi-dil.

Nəfəxtü sirridür faş edəməzəm,
Cəhani bibəyandur aləmi-dil.

Mühiti bərrü bəhrü rətbü yabis,
Əyan ilə nihandur aləmi-dil.

Məhəbbətdən girən firdovsi-eşqə
Bilür ondan cəhandur aləmi-dil.

Qılan təslim vəchin həqqə bilür
Nə vəch ilə iqandur aləmi dil.

Nəfəxt fih min ruhi dəmidən
Cəhani cani-candur aləmi-dil.

Görənlər Rövşənidən Aydın elin
Bilür aydan əyandur aləmi-dil.

Eşitdüm Gülşənidən sidqə nisbət
Yə'qini bigümandur aləmi-dil.

* * *

188. Ey bixəbər, bu gündən danla yarağını qıl,
Diri ikən ölənə danla bu gün olur bil.

Qal ilə qilə uyub tərk etmə əhli-halı,
Naqabil andan olur aləmdə çünki qabil.

Nə əgübən gedərsən bu məzrə'i-cəhanda
K'onda varub biçərsən nəf' ilə zəri-hasil.

Xeyr ilə şər qazancın mizani-əql ilə xəlq
Ağırlayanı andan fərq edübənü bilgil.

Bu gün verüb hesabun danlaya qoma der, çün
Mürsəllərün ulusu eşidüb olma ğafil.

Diriykən öləne qopar dedi qiyamət
Ol sərvəri-risalət elmi-lədunlə amil.

Dirilə ölübən de peyğəmbərün sözüni,
Siddiqi-əkbər andan elm ilə oldu fazil.

Diriylə qəbrə girüb verür sailün cəvabın
Ta biləsən nədür sirr ol sormadan, ey aqil.

Hər kim ki, bildi nəfsin, rəbbini bilən oldu,
Əllamə anı bilün elmü əməldə kamil.

Hər kim ki, bildi nəfsi elm içrə nasih oldu,
Yüz bin kitab oxuyub çün bilməz anı cahil.

Baiz qılur hekayət eşitdügini xəlqə
Bilməz nədür vəli hal olanda qali-naqil.

Günhini elmi-qalun hal əhlinə sor anla
K'ol kəşf ilə yaqından zənsüz oxur rəsayil.

Eşək kibi götürən əsfari-elmi bilməz,
Çünki əməlsüz ol xər olubdur anı hamil.

Elm ilə cahil işin işləyənə bunu den
Yoxdur cəhanda bu dəm sənün kibi əzazil.

Talib yoluna münkir şeytan kibi urur çün
Lə'nət qılub o cinnə, yarəb, sən cəza qıl.

Elmi-lədunı qoyub cəhl ilə fəlsəf olan
Məcnunmidir, sorarəm ol fəlsəfi, ya aqil.

Zənn ilə şək verübsə der fəlsəfi-bədihi,
Təsdiq edüb təsəvvür o mühməli-əsafil.



Mühməli-qəziyyədən istər nəticə fəlsəf,
Kəbirü səğirisindən dolu görün məhafil.

Kəsməz qılıncı alub əlinə fəlsəfi-dün
Qılur inadi Həqqə batillə ol mücadil.

Sufiyə fülsufi-dün tə'n edər ümmi deyüb
Bilməz çü elmin anun oxursa dərsi yüz yıl.

Şər'ilə toğru qoyan həqq yoluna ayağın
Bilür nədür o həqqə batil olan müqabil.

Sə'yi əməl qılubən xəlt etmə cəhli-elmi
Ta olmasa səlahun sə'yi fəsadə şamil.

Sərxoş isən həvadən bihuş ikən xəbərsüz,
Qılub əməl duruşma eyləmədən, ey şağıl.

Elm ilə qıl əməl, gər cüt olmaməx dilərsən
Çün cahili izədür şeytan görəndə fail.

Tərki-riya qılıban dutdu yüzini Həqqə
Ta şirki ol riyanun qılmaya həqqi batil.

"Kibr" ilə "ücb"ü "bən"lik adamı kafər edər,
Gəlib həva ki, ondan nəfsün ilə cəza qıl.

Ey Gülşəni, dilünün zikrini son nəfəsdə
İman ilə dilərsən Rövşəniyə dua qıl.

* * *

189. Eşidün edim sizə nədür həll olmayan müşkil,
Ki söylər anun adini bilənlər, bilməyənlər dil.

Dili ət ilə qan sanman, nədür pəs deyübən sorman,
Bilürəm desə inanman, anun neydügin əhli-küll.

Nə bilsün ani bilməyən, dilini şərhə qılmayan,
Diri gəzərkən ölməyən bilməz dili-dili bil.

Eşidüb danlaman sözüm, yəqindən eyn ikən gözüm,
Görərəm bən sözin bir olanda bana bin yıl.

Dilərsən sən səni görmək vücudun neydügin bilmək,
Ədəm pasın vücudundan rəvan eyləyübəni sil.

Necə bitürə bənlügün qılan gözündə sənlügün,
Nəzər qıl bin gözə ondan, necə gör eyləmiş bir qil.

Dilərsən dil yüzin görmək göz açub Rövşəniyə bax,
Biləsən ta ziya nisbət o gündən Gülşənidür zil.

* * *

190. Dust elinə gedərəm, gəlməmisən, ey könül,
Başdan ayax yoluna qoymamısan, ey könül.

Dustim bəni unuddi, bəndən yana gəl dedi,
Yoldaş oluban belə getməmisən, ey könül.

Yuxuda isən oyan, ikimizi unudan
Dust özidir, *külli-din görməmisən, ey könül.*

Duş görübən dustimi can ilə peyvəstimi
Tə'bir edən həstimi yürməmisən, ey könül.

İrəx-yəxin yoğ ikən, sana yəxin dustinə
Qürb ilə bə'dün nədür sormamısan, ey könül.

Can ilə dildən qədəm qoyubəni uş bu dəm
Dusti səvüp həmdəmüm olmamısan, ey könül.

Ay ilə gündən səxi səvgili dustin yüzin
Göricəküz canuni verməmisən, ey könül.

Rövşənidən göricək Gülşəniyi eşq ilə
Dustun odur səvgüli bilməmisən, ey könül.



* * *

191. Dust elinə gedərəm, gəlməmisən, ey könül,
Ol yola girüb, canun verməmisən, ey könül.

Gəl gedəlüm ol elə seyr ilə qoldan-qola,
Başdan ayağun yola qomamısan, ey könül.

Dur önə düş gedəlüm, be'yü şira edəlüm,
Yoq verübən varluğun almamısan, ey könül.

Dust elinə varubən şahi yüzin görübən
Qulluğuni qılubən görməmisən, ey könül.

Dust elinün də'vətin, sevgülü can ne'mətin,
Zövq edübən şövq ilə yeməmisən, ey könül.

Dust gülini görməyən, canın ana verməyən,
Ağlayuban halına gülməmisən, ey könül.

Rövşənidən bildüm uş Aydın elin görəli
Dust elidir, Gülşəni, bilməmisən, ey könül.

* * *

192. İstər isən canlar canı, gəl, şeyxə gedəlüm, könül,
Can qılmaq içün bu təni, gəl, şeyxə gedəlüm, könül.

Can vermədən ölmək gərək, qəsəm nədür bilmək gərək,
Andan sana demək gərək, gəl şeyxə gedəlüm, könül.

Şeyxin yüzin görən sevər, can verməgə ana irər,
Uyar isən gözün uyar, gəl şeyxə gedəlüm, könül.

Göz nurini rövşən qılan şeyxin cəmalıdır inan,
Görmək içün eynül-əyan, gəl şeyxə gedəlüm, könül.

Görməz bu göz Həqin yüzin, candan göz açub qıl Yekin
Dilər isən eynül-yəqin, gəl şeyxə gedəlüm, könül.

Surət degül şeyxin yüzi, mə'nidən aç ana gözü,
Həq görməgə andan yüzi, gəl şeyxə gedəlüm, könül.

Dilər isən "Rəbb bilmə"sin, sənsüz cəmalun görməsin,
Etsən nəyisə bulmasın, gəl şeyxə gedəlüm, könül.

Nəfsin bilən Rəbbin bilür, ölən dirilə, ölüdür,
Dirilər istəgin bulur, gəl şeyxə gedəlüm, könül.

Ölü qülubə can olan, ərən dəmindəndir inan,
Andan diridir çün deyən, gəl şeyxə gedəlüm, könül.

Ölüb dirilməgi sanı, dirlik nədir ondan tanı,
Anun içün der Gülşəni: gəl şeyxə gedəlüm, könül.

* * *

193. Eşqdən gəlür sana nida, gəl, dusta gedəlüm, könül,
Eşqə qılub canın fəda, gəl, dusta gedəlüm, könül.

Həmdəm olub candan belə, seyr edəlüm eldən-elə,
Ayaq qoyub başdan yola, gəl dusta gedəlüm, könül.

Eşqin cazibəsi bizi, cəzb edibən ikimizi
Bilməyüb gecə-gündüzi, gəl, dusta gedəlüm, könül.

Mənzil, məqami dəhr ilə tey qılalum seyran ilə
Anlanmadan bir şal ilə, gəl dusta gedəlüm, könül.

Aydın elini soralum, dustun didarın görəlüm,
Göz nurin rövşən qılalım, gəl, dusta gedəlüm, könül.

Dustin yüzin görən olmaz, dirlik bulub ölüm görməz,
Kafərdir ol kim, inanmaz, gəl, dusta gedəlüm, könül.

Eşq özidir dustim deyən, görklü yüzin görüb sevən,
Eynül-yəqin görüb inan, gəl, dusta gedəlüm, könül.



Dust yüzi gündən yəxtlu, görən anı nə bəxtlü!
Odur çü bizə sevgilü, gəl, dusta gedəlüm, könül.

Gəl deyübən ikimüzi, unuddi pur çin dust özi,
Oyan yuxudan aç gözi, gəl, dusta gedəlüm, könül.

Gərçi ki, yox ana məqam, eşidərəm leyk, ey hümam,
Gündür bizə darüs-səlam, gəl, dusta gedəlüm, könül.

Eşq özüdürür öndəyən, əglənmədən gəlüb deyən,
Bizdən görüb özün sevən, gəl, dusta gedəlüm, könül.

Rövşənidən dustun yüzin görmək içün açan gözün,
Gülşənidən eşit sözün, gəl, dusta gedəlüm, könül.

* * *

194. Gəl gedəlüm şövq ilə dust elinə, ey könül,
Başdan ayax qoyuban görklü yüzin, ey könül.

Can vermədən nedəlüm şəh quluna, ey könül?
Duste linə varalum görklü yüzin, ey könül.

Ay ilə Günəş sifət görməgə dust yüzini
Cizginəlüm eşq ilə sağ-soluna, ey könül.

İtirübən sənlügin, tərk edirüb bənlügin,
İstər isən eşq ilə düş yoluna, ey könül.

Tərk edə dünya işin, fikr edübən təşvişin,
Şiritübən sunmagil əl balinə, ey könül.

Əql oyalar çün səni, eşqə düşürgil anı,
Oyalatub qılmagil hal qalinə, ey könül.

Dust eli gülzarinə gəl gülü bixar ilə
Durma rəvan sunub əl bir gülünə, ey könül.

Eşidürəm, Gülşəni, derdi bunu dönmüşəm
Rövşənidən bir gülün bülbülünə, ey könül.

* * *

195. Var ikən fürsət əlündə etmə fövt anı, könül,
Rəbbini nəfsinlə görüb eşq ilə tanı, könül.

Demə danla çün bu gündür istədügün danlada,
Çünki ol yövmün bu gündə bilüni tanı, könül.

Dirilə ölübənü bilgil qiyamət neydügin,
Çün ana daniş olandır elmi-rəbbani, könül.

Bilə gör tə'limi-elmi elmül-əsmayilə,
Çün müstəmadən odur tə'limi-rəhmani, könül

Oquyub səb'ül-məsani eşq ilə fürqan içün
Bil nədür ol fərqə nisbət cəm'i Qur'anı, könül.

Çün müqəddəsdir bəyandan sərxəfi-nəfsü-kəlam,
Faş edəməz kimsə ondan sirri-sübhani, könül.

Zənnü şəkkü rəybə nisbət qılma təsdiq özünə
Çün yəqin andan edənün yoqdur imanı, könül.

İki aləm gəncinin bir kənzə nisbət məzhəri,
Nerdə var sənciləyin, de, mə'dənin kanı, könül?

Gün kibi yoqdur nəzirün kisvətün bula rəvan
Yoq şəbihün, gər var isə, de bana, xanı, könül?

Bilməzəm sirdən xəfi dildən dilün eşqi ilə
De bana, bilim rəvandan səndəki canı könül.

Düşmüşəm dərdinə eşqün mübtəla, degil, nedəm?
Nədür ol dərdün bənümçün səndə dərmanı, könül?

Müşkili-bihəll bilinməz səndən özgə, yox derəm,
Çün bulunmaz istədim çoq sanə ürfani, könül.



Yox zəman ilə məkandan sana görə bir vətən,
Ta sana nisbət edələr ondan utanı, könül.

Yox cəhanuna nəhayət birdən iki dövr ilə,
Görməzəm vəchündən özgə andan əyani, könül.

Nişə qorsan həqq evinə girə batil fikrini,
Çün mülki-kərəm ol evə k'ola şeytani, könül.

Cəhd edüb qayət edə gör ruhini nəfsünə ta
Ola ol məğlubi-ruhun cani-ruhani, könül.

Ay ilə günəşdən aydın aləmə girən bilür,
Nə ziyadəndür münəvvər səndəki ani, könül.

İki aləmdə olan bey'ü şira bazar içün
Səndən özgə kimdür açan sevgülə dükkani, könül.

Girməyən mehrinə eşqün hüsn ilə Yusif sifət
Bilməzəm ondan nədir soranda sultani, könül.

Rövşənidən hüccət imiş Gülşəninün dirligi,
Aydın eli tabişindən sanə yer hani, könül?

* * *

196. Ey könül, səndən soraram müşkülüm, həll eyləgil,
Nerədəydin bundan öndin, aləmüm nəydi, degil.

Bu cəhan mə'dum ikən çün var idi səndən vücud,
Ol vücudun aləminin nerdəligin söyləgil.

Qalmadı səbrü təhəmmül bəndə, ey dil, ol rəvan
Aləminə varmayınca anlayub dinlənməgil.

Bu cəhan mə'dum ikən de varmıdı mülki-vücud?
*Ol vətəndən banə, ey dil, önə düş yol başlagil.*

Eşidüb hübbi-vətən imandan olduğun derəm,
Ol vətəndən banə, ey dil, doğru yolum düşləgil.

Dilərəm mülki-vücud içün ədəm nəqşin siləm,
Sil ədəm mülkin desəm, ey dil, sana gömrətməgil.

Ey könül, mütləq vücudi qeyd edər rəngi-ədəm,
Sadədən rəngin olanın nəqşinə aldanmagil.

Girübən ağü qəradən aləmə seyran içün
Gecə-gündüz dövrə uyub, ey könül, inlənməgil.

Ey könül, yövmi-vücudin görmədən leylən ədəm
Ağ-qəradən bu cəhanun zövqinə imrənməgil.

Gənc ikən eyni-əmmarə, ey məhəbbət aləmi,
Varmadı ərzü səma bünyad olan bu abü gil.

Ey könül, çün görmədi eyni-ədəm səndən vücud,
Əvvəl-axır ona görə söyləyəndə yox degil.

Diləsən bilmək nədir, ey Gülşəni, səndən vücud,
Rövşənidən Aydın elin arıyıban istəgil.

* * *

197. Nəfxətdən diri bilür nədir dil
Ki, həlsüz oldur olan dərki müşkil.

Diləsən dili bilmək şərh edüb, sədr,
Nədir dil, nuri-didən can sifət bil.

Sorana "dil" nədir, budur cəvabım:
– Diləsən anı bilmək, var dilək dil.

Məqamü mərtəbədir eşqi-Düldül
Məhəbbətdən olub bikeyf mənzil.



Nədür beyti-ilahun dildən özgə
Ki ondan tövq içün eşq oldu məhmil.

Nə əvvəl var, nə axır qəlbə nisbət,
Gecə-gündüz sifətdən ay ilə yıl.

Dili dil olmayan bilmək diləsə,
Dil olub qıl dedim catıb yetir yıl.

Dili dilbərdən istə dil dilərsən,
Dilə verib rəvan, gəl, tərkini qıl.

Qələndərdir dili-dilbər, qələndər,
Vücudindən qomaz çün qalə bir qıl.

Ğərəzdən pak edüb qəlbüni saf et,
Qomayub andə qalə ğəşş ilə ğil.

Nədir dil, Gülşəni, görmək dilərsən
Rəvandan Rövşəni güzgüsini sil.

* * *

198. Nədür qalsuz dili hal əhlinin bil,
Ki, rəmz imadır ondan həlli-müşkil.

Çü olmaz hərfü sövti qalə nisbət
Zəbani-hal içün idrakə şamil.

Nə desəm anlamaz eşq ilə halım
Verən qalə könül əql ilə şağil.

Məhəbbətdən məzaq olur təkəllüm,
Nə bilsün ol dilün nitqini cahil.

Çü sirrün sirri dildir, qeybi-mütləq,
Məqəyyəd sanma dili kim, ola gil.

Məhəbbətdir dilə eşq ilə məzhər,
Çü məzhərdən urar binəqsi-kamil.

Nöşün münkir olursən hali-eşqə
Xirəd qalindən, ey məğruri-atil?

Əməl qıl elm ilə, seç hali haldan,
Himarə dönmə olub elmi-hamil.

Nöşün şərərü ab edərsən özün,
Əsəm əbkəmsifət cəhl ilə aqil.

Verib nəqsə dilüni diləməzsən,
Kəmali-halın ilə olma kamil.

Xəlilasa göründi talibi-həqq
Ki tərk edib gecə hər nəysə afil.

Qoma, ey Gülşəni, olub qələndər
Vücudindən qala qal ilə bir qil.

Soraram Rövşənidən bana deməz
Nədir səndən anınçun dilrüba dil?

* * *

199. Nə sevdadur başumda biləməzəm
Ki, *ondan əqli başə dirəməzəm.*

Vərəli könlümi sevdayi-eşqə
Dönübən nedüm ondan alamazam.

Nə heyrətdür bana bənsiz dirilik
Ki, sevdadan özümə gələməzəm?

Nedim sevda meyindən çünki məstəm,
Ayılub əqlim ilə olamazam.

Cahanda valehü şeydayi, heyran
Bənüm tək istəyübən bulamazam.



* * *

200. Nedəm könül əlindən biləməzəm,
Çəküb canım əlindən alamazam.

Gükərüb sevdügünə düşdügi dəm
Qararub gözüm, özüm görəməzəm.

İtirüb könlümi dilbər kuyində
Dilüm bağlanubanu soramazam.

İçəli bir qədəh eşqün şərabın
Olubani sərxoş ayılamazam.

Nə sevdadur başumda eşqün, ey məh,
Xəyalətdən özümə gələməzəm.

Nə deyüm Gülşəninün halını, çün
Edir kim Rövşənisiz olamazam.

* * *

201. Bən bu elə qərib gəldüm, kimsə bilməz halum bənüm,
Nə söyləyəm, çün eşidüb kimsə dilüm bilməz bənüm.

İkiligi tərk edübən birlik dilini söyləsən,
Yetmiş iki millət dilin bilmiyən anlamaz bənüm.

Heyrət budur ərənlərə, bixud sifət olanlara,
Eşqün halın soranlara qalum demək olmaz bənüm.

Varlıx gedüp, yoxlux sifət olana derəm mənqəbət,
Külli lisanda mə'rifət sözüm dilə gəlməz bənüm.

Bir gülinə eşqün könül vərəli bülbülə dönüb,
Ağlamaqdan nedəm, degüz, gül yüzümə gülməz bənüm.

Kim bilisər nə Leylinün Məcnuniyəm dəlü sifət,
Ta ki, soram əqlüm ana nişə gedüb gəlməz bənüm.

Aydın elində aysifət bulunmadın, nedüm, degüz,
Rövşənidən tabiş ilə könlüm evi dolmaz bənüm.

Eşq özidür, ey Gülşəni, deyən buni bax, gör, tanı,
Tərk etməyən mavü məni nə dedügim bilməz bənüm.

* * *

202. Mə'rifətin rəmzini çünki bəyan eylərəm,
Dinləyübən eşq ilə inləyənə söylərəm.

İstəyübən aləmi bulamazam adəmi,
K'ola həqün həmdəmi solü sağı soylaram.

Adəmi olmaz dəvar, bir den axı, nerdə var?
Mə'nidən insan çü var surətini neylərəm?

Mə'rifətün ne'mətin şövq ilə yedürməgə
Zövq edübən dadalı xəlqi cəhan toylaram.

Eşq ilə uyar dili, könlümi gözüm yumub
Qəflət ilə sanmaguz yatuban uyxularam.

Eşq özidür söyləyən, kər degilisən, eşit,
Duş görübən sanmagil, yuxuda sayuxlaram.

Hər ki könül verübən sevdi bəni eşq ilə,
Bən dəxi sevüb anı könlüm ilə yoxlaram.

Elmi-lədun ne'mətin ləzzət ilə zövq edüb,
Şövq ilə talibləri zövqüm ilə doylaram.

Eşq ərinə əql ilə münkir olanı görün
Zəmm edübən cəhlini elmə nəzər oylaram.

Elmi-lədun bəhrinə dolalı der Gülşəni:
– Yenəməzəm qə'rinə hər netə kim boylaram.



* * *

203. Ey hüsn elinün şahi, didarünə müştaqəm,
Ey hər gözəlün mahi, didarünə müştaqəm.

Ey şahidi-xoşmənzər, şirin dodağun kövsər,
Ey xub olana sərvər, didarünə müştaqəm.

Ey can ilə cananum, həm dərd ilə dərmanum,
Misri-dilə sultanum, didarünə müştaqəm.

Ey cümlə gözəl xubi, hər sevgüli məhbubi,
Ey hüsn eli mətlubi, didarünə müştaqəm.

Ey hurü pəriruxsar, ayüzlü mələkkirdar,
Ey hüsn ilə bərxurdar, didarünə müştaqəm.

Ey cənnət olan yüzi, həm şir, həm şəkər sözi,
Ey sevgülilər düzi, didarünə müştaqəm.

Ey dilbəri-cansurət, mə'ni yüzünə hikmət,
Ey qibləyi-hər millət, didarünə müştaqəm.

Ey gözlərimün nuri, fəth ilə sığır suri,
Ey cənnətimün xuri, didarünə müştaqəm.

Ey yüzi olan bayram, eşq əhlinə budur kam,
Qurbanun ola nakam, didarünə müştaqəm.

Ey mehr ilə məh xəddün, ey sərvi-rəvan qəddün
Məqbul olalı rəddün, didarünə müştaqəm.

Ey gecədə gündüzüm, həm eyd ilə novruzum,
Ey rövşən edən gözüm, didarünə müştaqəm.

Ey məzhəri-rəhmani, şilün var isə qani?
Yoxdur çü sana sani, didarünə müştaqəm.

Ey zuyi-hеqə sayə, verən nuri bədr ayə,
Hüsnün gözümə dayə, didarünə müştaqəm.

Ey qibləsi möhtacun, vey ayəti me'racun,
Lövlak olalı tacun, didarünə müştaqəm.

Ey eynə əzəl mübsər, vəhdətdə olan mənzər,
Vey hüsnə əbəd məzhər, didarünə müştaqəm.

Ey nuri səmavatun, vey hikməti ayatun,
Ey məbdəyi ğayatun, didarünə müştaqəm.

Ey cismü-cahan cani, hər mə'dənün ərkani,
Ey gövhəri-sübhani, didarünə müştaqəm.

Ey Rövşəninün xani, hüsn iqlimi sultani,
Vey Gülşəninün cani, didarünə müştaqəm.

* * *

204. Nedim eşqün əlindən biləməzəm,
Vərəli könlüm ana alamazam.

İtirdüm könlümi eşqə verəldən,
Arayub eşq əlindən bulamazam.

Nə sevdadur başumda biləməzəm eşq
Xəyalından özümə gələməzəm.

Alub heyrət bəni eşq ilə bəndən,
Ögümə neydügimi salamazam.

Dönüb Məcnunə eşqün dəlüsiyəm,
Nedüm ol Leylisiz çün qalamazam.

Könül der bəhri-eşqə daldur astə,
Dərindür nedəm ana talamazam.

Demə tərk eylə eşqin Rövşəninin,
Çü ansız, Gülşəni, bən olamazam.



* * *

205. Bana bənsiz vücud vəli nədəndür, bilməzəm, bilsəm
Ədəm nisbət nomid, vəli nədəndür bilməzəm, bilsəm?!

Nədür müşkil olan halsuz ədəm nisbət vücudimdən
Ki, ondan şani-budumi nədəndür, bilməzəm, bilsəm?!

Möhübbətdən şühud ilə nə yüzdür sevdürən vəchün
O şəhdən şühudimi nədəndür, bilməzəm, bilsəm?!

Dilərəm yoğ ikən varlıx nə fitrətdür bana nisbət
Çu hikmətdən vürudimi nədəndür, bilməzəm, bilsəm?!

Nə sevdadır xiyal ilə çıxan başə məvəddətdən,
O nisbətdən vədudimi nədəndür, bilməzəm, bilsəm?!

Uyur-oyanuğ olduğum bilinməz, heyrətim budur,
O yaqzilə rüqudimi nədəndür, bilməzəm, bilsəm?!

İrişüb fəqrinə eşqün ğəni nisbət vücudilə
Olan cüz-küllə cudimi nədəndür, bilməzəm, bilsəm?!

Möhübbətdən nişat içün nəva üşşaqə saz ilə
Olan dildən sürudimi nədəndür, bilməzəm, bilsəm?!

Könül Misrində üşşaqə olub Yusif sifət sultan
Mələksima cunudimi nədəndür, bilməzəm, bilsəm?!

Girübən cənnəti-eşqə möhübbətdən vücud ilə
O xüld içrə xüludimi nədəndür, bilməzəm, bilsəm?!

Görəldən Rövşəni vəchin, səkiz cənnət sifət yüzün
Dərəm köftü şenudimi nədəndür, bilməzəm, bilsəm?!

Soraram, Gülşəni, bana, nədür budum nəbud ikən,
Çün ol budü nəbudumi nədəndür, bilməzəm, bilsəm?!

* * *

206. Nedim eşqün əlindən biləməzəm,
Vərəli könlüm ana alamazam.

Yitürdüm könlümi eşqün kuyində,
Nedim istəyüb anı bulamazam.

Verür heyrət bana bənsiz vücudum,
Ədəm nisbət çü ansız olamazam.

İçəldən xəmri-eşqi məstü bixud
Olub, bir dəm özümə gələməzəm.

Bana nasih edər eşqün xiyalın
Başundən sal, nedim çün salamazam.

Nə sevdadur məhəbbətdən çəkərəm
Ki, qal etmədən ondan qalamazam.

Dəvasuz dərdinə eşqün giriftar
Olalı can verüb qurtulamazam.

Dirilə ölməyən qurtulmaz imiş
Bələdən Gülşəniveş öləməzəm.

* * *

207. Nedim dərdi-dilimi deyeməzəm,
Dəvasız dərdini gizləyəməzəm.

Məhəbbət dərdidür dilüm dəvası
Ki, onsuz möhnətinə duyamazam.

Bəli dedüm bəladən dərdi-eşqə,
O əhdümi bəladən sayamazam.

Bana şirin rəvanumdan bəladur
Ki, tərk etməgə dildən qıyamazam.



Bəlayi-eşqə verüp canım axır
İki aləmdə əldən qoyamazam.

Verüb can olmadan eşqün şəhidi,
Bələdən qanlu kəfən geyəməzəm.

Demən bir yüz verürəm eşqə nisbət
Məhəbbətdən rəvan kim sayamazam.

Məhəbbət dərdinə eşqün imami
Sala dedükcə nedim uyamazam.

Bəladur zahir edən xəbsi-qəlbi
Nedim ondan vücudum boyamazam.

Bəla nari qılur hər xami püxtə,
Nedim ol odə yanub göyəməzəm.

Məhəbbət sirridür eşqün bəlası
Ki, faş eyləyüb anı yayamazam.

Bəladur pərvər ayindən Gülşəni
Ki vəsfin Rövşənidən deyəməzəm.

* * *

208. Nedim eşqün əlindən biləməzəm,
Bəlasından qaçup qurtulamazam.

*İtürdim vərəli könlümi* eşqə,
Bəla bu, istəyübən bulamazam.

Vücudimi ədəm nisbət edibdir,
Bəla k'onsuz özümlə olamazam.

Bələdəndir yedür guya rəvanum
Ki, onsuz dəm verübən alamazam.

Bana şirin rəvanumdən bəladur
Ki, ansuz dirlik ilə olamazam.

Bəlayi-eşqə sərməsti nisbət
Olaldan bad ilə ayılamazam.

Nə sevdadur bəladan başimə eşq
Ki, əqlümə xəyaldan gələməzəm?

Bəladan pərvəriş bulur rəvanum,
Anunçün pərvərişsiz qalamazam.

Bəladur seyqəli-jəngi dilimün,
Nedim dil pasin ansız siləməzəm.

Möhübbətdən bəladur eşq zövqi,
Məzaqum ləzzət ansuz qılamazam.

Bana der Rövşəni, ey Gülşəni, sal
Bəlayi-eşqi başdan, salamazam.

* * *

209. Nedüm eşqün əlindən canə yetdüm,
Əgər dirlik budur, ölümə yetdüm.

Qaçub qurtulamadum eşq əlindən,
Biləmcə görürəm hər yerə getdüm.

Ədəm kimi görülməsəm, bəni eşq
Bulur, isteyübən hər dəm ki etdüm.

Verən can qurtulur eşqün əlindən,
Nedəm qurtulmadan bən yerə yetdüm.

Əcəl kimi düşübdür arduma eşq,
Bənümlə görürəm hər yerdə yetdüm.



Nedim dərdinə eşqün biləməzəm,
Çü olmadı dəva hər nə ki etdüm.

Dönüb pərvanəyi-şəm'inə eşqün,
Oda yanmağ içün canumi atdum.

Möhübbət eşq ilə sirri-xəfidən
Vücudimin şəhidin qeybə qatdum.

Kimə soram, bilüb verə cəvabum
Ki, eşqə verədən könlümi netdüm?

Sor axı, Gülşəni, şəh Rövşənidən
Nə yüzdən eşq əlindən canə yetdüm?

* * *

210. Misirdür məskənü məva durağum,
Anunçün qılmışam anı yatağum.

Biləməzəm nə yüzdən eşidürəm
Misirdən çıxmadan Rumdan sorağum.

Nedim taliblərün Rum ilə Şamda
Tolar güllər dəmasindən qulağum.

Eşidürəm səfər qılmaz evindən
Qılur talibləri Rumun yarağum.

Misirdə hüsni-Yusif satılan tək
Dolupdur müştəridən solü sağum.

Anubən həq kərim deyüb məqamın,
Olupdur cənnətasa bağü rağum.

Yazü qışda çıxandan xali olmaz
Ki, üzründən onun dolar dəmağum.

Məhəbbət aləmidür eşq mülki,
Cinani-Misr içində qəsrü bağum.

Səvadi-ə'zəmi-Misr içrə birdür
İki yüzdən görünən qarə-ağum.

Fərağət bulmuşam darül-əmandə
Ki, yox münkir sədası qi'vü qağım.

Nə bilür görmiyən Misrini eşqün
Məhəbbətdən gedür onda fəraǧum?

Gözümdən rövşən ol Aydın elini
Görəli, Gülşəni, yandı çırağum.

Görəli, Gülşənidən Misri eşqi
Qılubam Gülşəni candan turağum.

* * *

211. Elm ilədür eyni-həqq şəksüz imanum bənüm,
Həqqə görə çünki yox dildə gümanum bənüm.

Kəsrət ilə vəhdətüm birlik ilə göricək,
Ğeybü şəhadət olur dildən iqanum bənüm.

Eşqü möhübbət sevüb vəchümi şan edəli
Ay ilə gündən ziya oldu cəhanum bənüm.

Qüdrət ilə hikmətün məzhəridür eşq ilə
Mehrü məhəbbət dəmi, sevgilü canum bənim.

Sirri, nəfəxtü dəmi Adəmü eşqi-vədud
Sevübənü sevilən oldu rəvanum bənüm.

Məzhəriz-cüz' küllü cud. şahidğ məşhurü bud
Oldu iradət dəmi eyni-əyanum bənüm.



Əvvəl iradət sevüb vəchüm içün o dili,
Eyni-məhəbbət görüp eşq ilə anum bənüm.

Çünki əzəllə əbəd eşq ilə yoxdur bana,
Bəs nədür öndən sonra eyni-zəlanum bənüm.

Varlığ ilə yoxluğum məhv ilə isbat ikən
Kim bilisər neydügin bənsiz olanum bənüm.

Rövşənidən Gülşəni gənci-xəfi, sirrsifət
Olduğını kim bilür dildə nihanum bənüm.

* * *

212. Eşq qiyamət güni oldu, onun suriyəm,
Möhnət ilə darinun şövq ilə Mənsuriyəm.

Ay ilə Günəş kimi seyr edəli eşq ilə
Göz açanun mehr ilə, eyn ilə mənzuriyəm.

An ilə şan şühud bəndən edər çün vədud,
Ana görə cüz'-küllün dövr ilə Mənsuriyəm.

Sirri-nəfəxtü bənəm eşqə görə heyy sifət,
Anun içün mehr ilə dirilənün huriyəm.

Eşqü-məhəbbət dəmi vəchün olaldan murad
Zikri-lövlak edüb sevgilü məzkuriyəm.

Əhsəni-təqvim ilə fitrətüm insani-eyn
Olduğuçün cüz'-küllün didəsinin nuriyəm.

Əvvəl iradət gözi vəchümə qıldı nəzər,
Ol nəzərün tab ilə gün kibi mənşuriyəm.

İki cahanda vədud, zahirü batin, şühud
Sirri-ələn devrinün məşhədi-məşhuriyəm.

Aləmi, biçün sifət, sadəvü bimə'rifət
Olan içün bicəhət eşq ilə mə'muriyəm.

"Lövhi-əzəl"lə əbəd, "nunü qələm"dən rəqəm –
Anı bilür olduği Turilə səturiyəm.

Rövşənidən Gülşəni sirri-möhübbət xəfi
Olalıdan eşq ilə sevgilü məsturiyəm.

* * *

213. Yenə Məcnun sifət divanə oldum,
Xirədi-əql əhlinə biganə oldum.

Dəlürüb dağə düşdüm aqil ikən,
Anunçün xəlqara əfsanə oldum.

Bilinməz gəncə dönüb xəlqə nisbət
Əmanət gəncinə viranə oldum.

İki aləmdən övsə' oldu könülüm,
Çü vü'sət mülkinə kaşanə oldum.

Şərabi-eşq içüp talib olana
Möhübbət zövqilə peymanə oldum.

Cəhanda rindü meyxurə kim olsa
Xərabatə nəzər meyxanə oldum.

Məhəbbətdən sevilən vəchə nisbət
Təvafi-eşq içüp bütxanə oldum.

Nəfəxtü sirridür heyydən həyatum,
O candan cüz'-küllə canənə oldum.

Mənəm rindü xərabatiyi-müdmən
Ki, xəmri-eşq ilə məstanə oldum.



Həqayiq bəhriyəm ümmani-eşqün,
Səfasuz, biərəz dürdanə oldum.

Nə Leyliyəm nə Məcnun, Gülşəni, de,
Nə yüzdən əql ilə divanə oldum?

* * *

214. Cəhanda biqərəz yox kimi adəm,
Bilinməz istədim kəmdən dəxi kəm.

Ğərəzdən fikrə salan adəm oğlun
Ki, gah şad olur andan, gah pürğəm.

Ğərəzsiz bir nəfəs kimsə çəkməz,
Dirilməz kimsə ansuz çünki bir dəm.

Ğərəzdir cüzvü küllün cünbüşü çün,
Anunçün xəlq olisər iki adəm.

Ğərəzsiz tərkin urmadi cəhanun
Cüneydü Şibli kimi ibni-Adəm.

Ğərəzdir təlx edən şirin dəhani,
Əgər tiryaqsa ondan olur səm.

Ğərəzdən düni pür dövran gördün,
Girüb xərcə gecə-gündüz dəmadəm.

Ğərəzdir ayıran atadan oğlun,
Ğərəzsiz ülfət etməz xal ilə əm.

Ğərəzsiz, Gülşəni, var deme, yoxdur
Sanadım aləm içrə ibni-Adəm.

* * *

215. Çox qılmışam, yarəb, əstəğfürüllahül-əzim,
Olub günəhdən rusiyəh, əstəğfürüllahül-əzim.

Tövbə qılub, yüzüm sana dönüb derəm, ya rəbbəna,
Yarlığıyub rəhm et bana, əstəğfürüllahül-əzim.

Əski qulunam yenidən qılgil qəbul, ey dülmənin,
Zikrim budur sirrü ələn əstəğfürüllahül-əzim.

Anub günahım ağlaram, yanıb yürəgim dağlaram,
Olub peşiman uş derəm: – Əstəğfürüllahül-əzim.

Gəlmiş qulunu sürməgil, cürmin yüzinə urmagıl,
Əfv eylədim qulum, degil, əstəğfürüllahül-əzim.

Əfv et günahım, ey kərim, çünkim ğəfursan, həm rəhim,
Zikrim odur andan müqim, əstəğfürüllahül-əzim..

Yarəb, məasidən pənah zikrin durexcusemi iştibah,
Bəsdür dedügimə güvah, əstəğfürüllahül-əzim.

Nəfs uyuyub nisyan ilə, halum görüb üsyan ilə,
Dildən derəm uş can ilə: əstəğfürüllahül-əzim.

Nəfsim imiş yolum urub, asi qılubən azduran
Ondan derəm: – Ey dulmənin, əstəğfürüllahül-əzim.

Anub cəhənnəm oduni, nasü həcərdən qoduni
Qurtar derəm, yarəb, bəni, əstəğfürüllahül-əzim.

Küçəki, asi bəndəyəm, qılub günah, şərməndəyəm,
Zikrim budur ta zindəyəm, əstəğfürüllahül-əzim.

Tövbə qılub, ey Gülşəni, eylə şəfi'ün Rövşəni
Andan degil anub bəni, əstəğfürüllahül-əzim.



* * *

216. Düşüb qürbətdə, avarə olub tərki-diyar etdim,
Bu dirlikdən anun içün ölümüm ixtiyar etdim.

Gəzər biçarə sərgərdan bənüm kimi görəmezəm
Fələkdən özgə dövr ilə anunçün banə yar etdim.

Girüb meydanına çərxün, başın tup eyləyən bilür
Ki, nə çəvkan ilə başım çalınmağa düçar etdim.

Tömə'dən gün kimi sürüb eşikdən adinə yüzüm,
Əziz ikən öz-özümi zəlilü xuhü xar etdim.

Salub nam ilə namusi, biləməzəm nə mə'nidən
Olub qürbətdə rüsvavü məlamət, tərki-ar etdim.

Bəni qürbətdə müflislik qılalı fəqr ilə müztər
Qənidən qüvvəti-nəfsçün özümi şərmsar etdim.

Qənaət gəncinün nəqdin vərəli Rövşəni bana,
Mətain, Gülşəni, dəhrün canumə zəhrümar etdim.

* * *

217. Rövşəniyi görmədim, eşqi nədir bilmədim,
Rövşənidən özgə çün andan şeyi görmədim.

Rövşənidən sərbəsər hər neyə qılsam nəzər,
Andan açalı bəsər gördügimi sormadım.

Rövşənidir cüzvü küll can gözün aç, ey üqul,
Ta gözəsən kəşf ilə düş görübən yormadım.

Rövşənidir şəm'i-eşq olalı pərvanəsi
Kimdir o zudən yanub, xəlqə çirağ olmadım.

Rövşənidir, Gülşəni, Aydın elinün güni,
Ay sifət ondan ziya alalı ayrılmadım.

* * *

218\. Eşq ilə könül gözün açalıdan görürəm
Könül ilə eşqi bir, iki nədür soruram.

Könül ilə eşq özü birkən iki görürəm,
Gecə kimi gündüzi düşmi görüb yoruram.

Eşqə könüldür derəm, çün ikisin bir görəm,
Münkir edürsə kərəm, qulluğunu yürürəm.

Mə'rifətün oyunun fərz ilə rüx, fil kimi
Bilmək içün ərsədə bilübəni qoruram.

Rövşənidən Gülşəni ay ilə günəş sifət
Eşqü könül birligin iki degül görürəm.

* * *

219\. Qal ilə eşqün halın sorana əhməq derəm,
Çünki cəvabın sükut edübənü həq derəm.

Münkiri-eşqə ulu kim der isə eşidüb,
Diri kəlamın rəvan sidq ilə səddəq derəm.

Eşq ilə halum görüb sana məhal olanı
Hali-məhal anlayub dutma bana dəq derəm.

Alimi-cahil sifət, gövdənü bimə'rifət,
Cəhlüni ancəx düzət, elmün içün fəq derəm.

Eşq ilə narini nur Rövşənidən edənə
Ay kimi gündən yüzi gördirənə sərq derəm.

Rövşənidən Gülşəni şövqi ilə zövqinə
Eşqə-könül verəli sevgilü zəfləq derəm.



* * *

220\. Varü yoxdum bilməzəm, nədür vücudum, bən nəyim?
Müşkülüm budur ki, həllin kimsə bilməz nə şeyim?

Sə'dətü mə'ni nədəndür zahirü batin sifət
Əvvəl-axır bir ikən iki nə vəch ilə deyim?

Elm ikən eynün sübuti neydügin ana vücud
Bilməzəm künh ilə keyfün nə deyübən söyləyim?

Nə ədəmdəndir vücudum kim anunçün dad sübut
Olmadan mə'dum anı nə vücud ilə deyim?

Heyrəti isbat ilə nəfyun vücudi-həllidir
Kim nə keyf ilə ədəm mövcud olur anı bilim.

Ölü diri ziddü nədnadur vücud ilə ədəm,
Kim buları cəm' edəndir cüzvü küldən min həlim.

Rövşənidən müşkülüm həllini dedim, Gülşəni,
Ki, ədəmdən sabiq olan həyy vücudindən şeyim.

* * *

221\. İtirməyən özüni, çünki bulamaz nedim?
Anı bulan özüni, çünki bulamaz nedim?

Heyrətə salan bəni budur eşidün anı,
Eşqi görən özüni, çünki görəməz nedim?

Düşər kim eşqün yüzün kim ki, gümansız yəqin
Görür imiş tə'birin, çünki qılamaz nedim?

Gövhəri-kani-vücud eşq imiş, ey kani-cud,
Verməyən ana vücud nəqdin alamaz nedim?

Dürri-yetimi-səmin eşq imiş etdim kəmin
Bəhrinə, ey nazənin, kimsə dalamaz nedim?

İki cəhanı salan görür imiş can ərin
Eşq ilə özün bir an kimsə siləməz nedim?

Hər kim içər xəmrini eşqün, eşidün anı
Ayılmağa bir nəfəs, çünki gələməz nedim?

Eşq imiş Allah evi olubani münzəvi,
Qılmayan özün yarı anı görəməz nedim?

Rövşəninün sirrinə Gülşənidən birinə
Bəhri-rəvan dərinə fikrim irəməz nedim?

* * *

222. Eşq ərinə münkiri-kafəri mütləq derəm,
Batil eşitmək anın həqqinə, çün həqq derəm.

Neçələr inkar ilə küfr edər imanını,
Çün eşidər eşq ilə dəlürüb ər həqq derəm.

Əvvəlü axır eşit zahirü batində ər,
De yenə eşidübən sidqinə səddəq derəm.

Əql ilə dəlü kimi uslu sanub eşq ərin,
Sözünə sən, ey fəqih, dutmıyasan dəq derəm.

Eşqə könül verəli, valeh olub bixəbər
Sözüm "ənəl-eşq" eşit, gərçi "ənəl-həqq" derəm.

Dinlə kəmalın həqün qürbi-nəva qıldın uş,
Nə dedügim həqq ilə cün "fəbi yəntəq"[17] derəm.

Rövşənidən soruban Gülşəninin müşkilin
Həllin anun eşidün müşkilü məğləq derəm.



* * *

223. Eşq ilə bilişəli əqlimə yad olmuşam,
Ğəm yer ikən əql ilə, eşq ilə şad olmuşam.

Qeydə salan əql imiş mütləq ikən könlümü
Qeydin üzübən anun gör nə azad olmuşam.

Əql ilə demin bana, söylə muradın nədir?
Eşqi murad edəli tərki-murad olmuşam.

Eşq ilə zövq edəli ləzzəti-şövq ilə uş
Eşidünüz dedigim, zövq ilə dad olmuşam.

Bənciləyin əqlümün yapduğu bünyadını
Yeylə verüb eşq ilə, "sərsəri ad" olmuşam.

Girənə bazarına eşq ilə Misrin derəm
Al bəni, Yusifsifət hüsnə məzad olmuşam.

Rövşənidən Gülşəni Leyliyə Məcnun kimi
Sevübənü sevgüdən ad ilə yad olmuşam.

* * *

224. Eşqi həvadur deyən bül-həvəsə münkirəm,
Əql ilə eşqün yolun urana şeytan derəm.

Azubənü azduran, gümrəh edüb yol uran,
Bilübənü can adın nəfsüm imiş nə sorəm.

Eşq ilə əhvalimi qal edübən əql ilə
Düşdə səyuhlər kimi tə'bir edib nə yorəm.

Eşq ilə itürmədən bulamazan özümi
Anun içün deməzəm bulmaduğum bularam.

Heyrətə salan bəni budur eşidün anı,
Bilməyəcək bən bəni eşqi o dəm bilürəm.

Eşq ilə dirilmədən oluram ölü sifət,
Bir nəfəs ansuz əgər ver deyəni aluram.

Rövşənidən eşq ilə Gülşəninün vechini
Ay ilə gündən dəxi aydın ikən görürəm.

* * *

225. Eşq ilə bulsam cəvan, aqilü pir eylərəm,
Bəndən isə şəh sifət xəlqə əmir eylərəm.

Hər ki həvəsdən keçə deyü həva tərk edüb,
Mülki-Süleyman içün anı vəzir eylərəm.

Eşidəli fəqr ilə fəxrini peyğəmbərün,
Diləsə nəfsüm ğəna anı fəqir eylərəm.

Həqqə müti' olmayub sərkeş olan nəfsini
Ram edübən elm ilə bəndə əsir eylərəm.

Nəfsü həva izzətin zillət edüb fəqr ilə
Təhvetü kibrin anun xari-həqir eylərəm.

Fəxr ilə nəfsi-dəni diləsə kimin libas,
Geydürüb ana pəlasın, sanma hərir eylərəm.

Eşq ilə qılsam üruc yerdən ağuban gögə,
Kürsi qılub rəqri-fəm ərşi-sərir eylərəm.

Rövşəninün Gülşəni mahi-cəmalun görüb
Der ki, könül göginə bədri-münir eylərəm.



* * *

226. İstəyübən biqərəz aləmdə adəm bulmazam,
Ol səbəbdən bilübən bən sirrə məhrəm bulmazam.

Çox demin, azdır cəhanda biqərəz nadir vücud,
K'ol ədəmdən daxi gizlidir vücudin bilməzəm.

Sınadım, yoxdur ərəzsiz, çünki talib dünyada,
Anun içün bin müridi bir şizə almazam.

Çünki mövtü iqbali mövtün bizə əl-bəşər
Dirlə neçün ğərəzsiz can verübən ölməzəm.

Çün qərəzdir mütləq ikən qeydə salıb nəfsümi,
Silmədən ol bəni qeydə nişə anı silməzəm.

Soraram sərxoş qərəzdən ayılurmi dən bana,
Hər kimə sorsam, der andan məst olub ayılmazam.

Rövşəniyə verməđin can, Gülşəni, nedim degil,
Çün qərəzdən ana canı vermədən qurtulmazam.

* * *

227. İtirüb heyrətdən özüm bulmaz oldum, neləyüm?
Dəlü kimi nə dedügim bilməz oldum, neləyüm?

İçübən heyrət meyindən necə məst olalı
Gəlübən özümə uş ayılmaz oldum, neləyüm?

Verəli sevdayə könül məstü layəql sifət
Qurtulub ondan özümə gəlməz oldum, neləyüm?

Olalı dərhəm ğəmilə ağlamaxdan bir zaman
Açılub könlüm fərəhdən gülməz oldum neləyüm?

Düşübən bəndinə eşqün, seyd olalı mürği-dil
Can verübən bir nəfəs qurtulmaz oldum, neləyüm?

Diləməz könlüm ki, sirri sevdüginün faş edə,
Saxlayub sirrini anun, bilməz oldum, neləyüm?

Gülşəninün can verərkən son nəfəs budur sözü
Rövşənidən verüb anı almaz oldum, neləyüm?

* * *

228. Ey diriğa, nəqdi-ömrün qiymətini bilmədim,
Sərf edüb anı ərəz tək cövhərini almadım.

Kimiyayimiş vücudum sən kimi sərf etmənəm,
Biləli çəranum andan ağlayuban gülmədim.

Gənci-məxfi cak imiş viranə səndə bu tənün,
İstəyübən bu xərabun gəncinə yol bulmədim.

Tən sədəfdir, can imiş dürri-yetim, amma nedim,
Bu səfər pərvərdəsindən qiyməti dürr olmadım.

Hər nəfəsdə can verübən alır ikən dəmbədəm
Son nəfəs verübən anı alma fikrin qılmadım.

Ölübən dirilü bu gün dünyadan axirətə
Görməgə danlayi bu gün varubanü gəlmədim.

Ölmədən üryan oluban kisvətini dünyanun
Çıxarubən soncə kimi əgnim üsnə salmadım.

Rövşəni mir'atiyimiş Gülşəni, könlüm nedim?
Heyfüm oldur güzgü nisbət pasın anun silmədim.

* * *

229. Mə'rifətin rəmzini çünki bəyan eylərəm,
Dinləyübən eşq ilə inləyənə söylərəm.

İstəyübən aləmi bulamazam adəmi
Kola həqqün həmdəmi solü sağı söylərəm.



Adəmi olmaz dəvar, bir den axı nerdə var,
Mə'nidən adəm çu var, surətini neylərəm?

Mə'rifətün ne'mətin şövq ilə yekdür bana
Zövq edübən qaralı xəlqə aman duylaram.

Eşq ilə uyar dili, könlümi gözüm yumub
Qəflət ilə sanmaguz yatubən uyxularam.

Eşq özidir söyləyən kər degül isən, eşit,
Düş görübən sanmaguz, yuxuda sayuxlaram.

Hər ki, könül verübən sevdi bəni eşq ilə,
Bəndəni sevüb, anı könül ilə yoxlaram.

Elmi-lədun ne'mətin zövq edübən dadalı
Şövq ilə talibləri zövqüm ilə döylərəm.

Eşq ərinə əql ilə münkir olanı görüb
Zəmm edübən cəhlini elmə nəzər öylərəm.

"La"vü "illa"dən keçüb, əlayə bir göz açub,
Bənlik olandan qaçub sövdəmini saxlaram.

Sirri-xəfidən uman ol vaqifi
Ta biləsən varlığın yoxluğ ilə saxlaram.

Elmi-lədun bəhrinə dalalı der, Gülşəni,
Yenəməzəm qə'rinə, hər necə kim boylaram.

* * *

230. Rövşənidən eşq imiş, çün can ilə canum bənüm,
Məzhəbü millət oluban dildə imanum bənüm.

Heyrətim budur verəldən eşqə könül bilməzəm,
Andan özgə *nədir olan*, bənsüz olanum bənüm?

Doğalı könlümə eşqün günəşi kölgə sifət,
Bən itübən ol olupdur verüb-alanum bənüm.

Müşkili-bihəl bana bənsüz səfərdür eşq ilə,
Bilməzəm nədür varuban anda kəlanum bənüm?

Eşqlə ruzi-əzəldən əhdü peyman edəli
Sınmadı möhkəmligimdən dildə peymanum bənüm.

Bir nəfəs eşq ilə verib almışam, dirilməzəm
Çünki olur təndə canü dildə cananum bənüm.

Qılalı mə'düm bu dəm qılmadı bəndən vücud,
Anun içün yoğə döndüvü qalanum bənüm.

İtirübən istər ikən bəni bənsüz eşq ilə
Bilməzəm nədir, anı dildə bulanum bənüm?

Rövşəni eşqi canumdur, Gülşəni, hüccət ana
Diləsən, mehründən özgə nolə bürhanum bənüm.

* * *

231. Bilməzəm, ta istərəm, çün istədügim bulmuşam,
Heyrətüm bu, bulunana istən özüm olmuşam.

Talibi mətlub ilə bir görəli derəm bunu:
– Namurad ikən murada irübən qovrulmuşam.

"Əvhi lə xovfun əleyhim"[18] bil bəşarət sirrini
"Kəövliyaullah"[19]-həqdən əmr ilə buyrulmuşam.

Çəkəli nundan qələm hərfini lövhün yüzinə
Dövr ilə ağa qəradən yazılub pozulmuşam.

Tazədür bağı-rəvanum cənnətül-ma'va sifət
Gül kimi sanmın açılub tazəlikdən solmuşam.



Gər tikənsiz gül dilərsən, Gülşəni bağinə gir,
Gör necə bağı-ədəm tək xarın anun yolmuşam.

Elm ilə yoldan azanun cəhli-halın görübən
Ağlayub halına gahi, gahi qəh-qəh gülmüşəm.

Bir demə yüz bir denən, ey Gülşəni, dövran ilə
Rövşəniden ay sifət çox boşalub dolmuşam.

* * *

232. Bən bu mülkə gəlmədən nə yerdəlügüm bilmişəm,
Yenə dönüb o mülkə getmək içün gəlmişəm.

Şeş cəhəti, sağü sol bulmağ içün ona yol,
Arayuban bicəhət bulmağa əglənmişəm.

Şövq ilə girüb yola gəzməgə əylədin elin,
Girməgə dildən-dilə zövq ilə yol bilmişəm.

Canü cəhandan bəri oluban, ol dilbəri
Görmək içün çün pəri əglənübən qalmışam.

İki cəhan istəgin sevgilü xubun yegin
Desəm inan, ey güzin, istəyübən bulmuşam.

Eşq ilə dil halətin sorana bunu derəm:
Bir nəfəs ansuz demən verübənü almışam.

Eşidürəm Rövşəni Gülşəniyə der bunu,
Tərk edəli bən səni Bir ilə bir olmuşam.

* * *

233. Yol edəyim deyənə yeddi nişan soraram,
Bilməsə, yoldan anı çıx deyübən qovaram.

Əvvəli budur sual nəfs ilə nədir kəmal?
Bulana hicrü vüsal bilmək içün uyaram.

İkisi budur canum can ilə candan tənüm
Söylə nədəndür bənüm düşüm görüb yoraram.

Üçü budur ver nişan huy ilə heydən rəvan,
Faş edübən sirr əyan nə görünüb görərəm.

Dördü budur anlagil, həq dedügim dinləgil,
Mənsur olub de bana xəlqi neşün qoraram?

Beşi budur gənci-can kimdən idi siri-nihan,
Bildün isə et rəvan, çün itirüb araram.

Altısını qıl təmam, surəti-mə'ni məqam
Şeş cəhətə bir imam necə olur soraram?

Yeddi suali-nişan gün kimi degil bəyan,
Rövşənidən nagüran Gülşəni[yi] sevərəm.

* * *

234. Yetmiş iki millətün bir dili var söylərəm,
Türfə budur bən bənə söyləyübən dinlərəm.

İki cəhanda fərağ bulmadan ursan qulağ
Demə bu sözdən bəlağ eşidübən inlərəm.

İkiligi salalı, birlik ilə olalı,
Deyüb ələstu bəli əhdimi ismarlaram.

Birligə buluşalı, vəhdətə yerişəli,
Kəsrət ilə aşalı neydügimi anlaram.

Münkirün inkarını, cəhl ilə əsrarını,
Elm ilə miqdarını bilməyəni hamlaram.

Talib isən gözləmə, dərdi-dilün de bana,
Ta ki deyəm bən sana, dərd olanı amlaram.

Rövşənidən dərd ilə eşid axı, Gülşəni,
Neçəsi zari qılub kəsrət ilə inlərəm.



* * *

235. Halimə dut qulağı, çün qali-lisanə sığmazam,
Sorma bu dəmdə kim, nitqü bəyanə sığmazam.

Külli-lisanda halimi söyləmədin sana derəm,
Dilə gəlüb çü qal ilə vəsfi-zəbanə sığmazam.

Sövtü bəyanə nitqimi gəlməz ikən nədür yolun?
Çünki lədün məqalilləh, nitqü bəyanə sığmazam.

Qövlü-lisandə həqq ilə sidqü tə'yin ikən sözüm,
Şəklə vü həm verüb və həm meylü gümanə sığmazam.

Qüdrəti-həqqi-hikmətin bəndə sığar, vəli nedim,
Qüdrətinə dönüb həqün kövnü məkanə sığmazam.

Nə satılubən alınur, deyəməzəm, dökəm dükan,
Birlik içində seyr ikən çünki dükanə sığmazam.

Kim görisər əyan bəni sirri-xəfi nihan ikən,
Bəs deməgə əyan nədür, çünki nihanə sığmazam.

Eyni-əyanda məhv ikən kim istəyüb bulur bəni,
Çünki bu eyni-zat ilə eyni-əyanə sığmazam.

Nə var isə cəhanü can, bəndə sığar rəvan ilə,
Leyk əcəb budur, niyə bən bu rəvanə sığmazam?

Can elinün çü kaniyəm acmışam uş dükanımı,
Girehdə kan içində mən "in" ilə "anə" sığmazam.

Əhli-məkan olan xəmu bəndə sığar zəman ilə,
Leyk zəman ilə bu dəm eyni-məkanə sığmazam.

Bəndə sığar əzəl-əbəd şanə görə zühur edüb,
Vüs'ət ilən vəleyk mən an ilə şanə sığmazam.

Rövşənidən ziya ikən Gülşəni dedügim, eşit,
Vəsf edübən əyanımı nitqü bəyanə sığmazam.

* * *

236. Ey eşqi-həqiqətdən uran dəm,
Qədəm bas dedim üsnə xeyrə məqdəm.

Sənün mislün cəhanda nerdə vardur,
Həqiqi munisi-dil, canə məhrəm.

Önülməz yarə olur hicrə zəxmi
Əgər vəsl olmasa ol zəxmə məhrəm.

Könül dərdinə dərman edəyim, çün
Təzələr zəxmini hər neyləsəm am.

Dəva dedikləri dərdümə illər
Dəxi arturdi dərdim qılmadı kəm.

Pərişan ruzigar etdi bəni dil
Olaldan bir pəriruxsarə həmdəm.

Könül dilbər ğəmindən olalı şad
Fərəhdən Gülşəni bilməz nədir ğəm.

* * *

237. Mehriyilən ol sənəm yanma dilər, yanarəm,
Eşq ilə tutuşmamı, çünki sevər, yanarəm.

Düşəlidən eşq odu bu tutuşan canıma,
Dağlanubən mehr ilə təndə cigər yanarəm.

Hicriyilə gün kimi yanıyıram gündüzin
Vəslin umub gecə həm, dəxi betər yanarəm.

Şəm'i-rüxündən nedim, yanmayubən bir degüz
Çünki o yüzdən bana yanma düşər, yanarəm.

Oda düşüb şövq ilə yanduğumi danlamın
Könlüm alan [bənə] çün qılsa nəzər, yanarəm.



Şəm'ə dönüb dilərəm başdan-ayağə yanam,
Anun içün tutuşub şamü səhər yanarəm.

Nasihə degüz nişə mane olur yanmama,
Çünki həvadən degil eşq ilə gər yanarəm.

Yerdə yanan ah ilə çıxdı tütünüm gögə
Çünki ol oddan tütün gögi boyar yanaram.

Aşiq olalı ana yaxdı bəla odinə,
Bəndəsinə hökmi-şər çünki ötər, yanarəm.

Çəkübəni qaş yayın kirpük oxun atmağə,
Zəxmi-qəza urucəx canə qədər yanaram.

Rövşənidən yanmadın, Gülşəni, degil nedim,
Çünki bana mehr ilə qılsa nəzər yanarəm.

* * *

238. Eşqün bana yar olalı müştaqi-didar olmuşam,
Biganəyi-əql oluban anun ilə yar olmuşam.

Gül tək cəmalun qönçədən açılalı, ey gülüzar,
Bülbül kimi eşqün ilə, eşit, necə zar olmuşam.

Anəstu nadan sirrini görsətdi vəchün talibə,
Ol zuziyanun, ey pəri, uş nurinə nar olmuşam.

Yüzün görən arif necə vəsf edə ol vəchi deyüb,
Güldür çü ol yüzdən lisan binitqü göftar olmuşam.

Heyrət budur tanımazam özümi bən özgə sanub,
Çün eşq içün özüm ilə yar ikən əğyar olmuşam.

Vəhdət dəmində bən sözin dedim ənayi-eşq ilə
Mənsuri darə asdılar mən "leysə fid-dar"[20] olmuşam.

Sərxoş olalı eşq ilə ayılmadım huşyar olub,
Gözün kimi məxmur olan sanur ki, huşyar olmuşam.

Aşiqlərin sərxoşluğu eşqün meyündəndür müdam
Oldur dedügim talibə, ol xəmrə xümmar olmuşam.

Eşqün əmanətbardür təlxini şirin götürüb,
Ey Xosrovü Şirinliqa, gör nə şəkərbar olmuşam.

Məsi-vücudim kimya, eşqündən oldu pakü saf,
Ey nəqdi-eşqümə məhək, gör ki nə dinar olmuşam.

Eşq ilə bənda[m] olmuyan namusi bilməz nədür,
Anun içün bədnam olub, eşq ilə biar olmuşam.

İzzət dilərsən eşq ilə zillət çəküb səbr eyləgil,
İzzət bilübən eşqüni zillət çəküb xar olmuşam.

Eşqün bəlasın çəkübən səbr eyləgil Əyyubvəş,
Deme bəladən usanup eşq ilə bizar olmuşam.

Qeyd etdi zülfün könlümi azad ikən sərvi-qədün
Qurtulmazam ol bəndə çün möhkəm giriftar olmuşam.

Mah rüxün kəşf edübən qaldır niqabun, ey sənəm,
Ta vaqif oluban demə, ol kəşfə əsrar olmuşam.

Zülfün rümuzun mubəmu arif bilürmi qilü qal,
Biqil olan arifə sor k'ondan necə tar olmuşam?

Yüzün görəli mehr ilə eyni-əyan dəm bildim uş,
Ey Gülşəni, günəş sifət əğyanə ənvar olmuşam.



* * *

239. Ey cəmalun qüdrətullah, ayəti-sün'i-qədim,
Qaşlarundan zahir oldu hərfi-Qur'ani-əzim.

Yeddi müshəf nə var isə yazılubdur vəchünə,
Ey kəlamüllahü məzhər, lövhi-məhfuzi-ə'lim.

Nöqtəyi-xalun bilindi yari-bismillah imiş
Nübdəyi-Qur'an olaldan həqqi-rəhmani-rəhim.

Gün kimi yüzündən imiş xud təcəlli aləmə,
Onda nəymiş gördügi Turində Musayi-Kəlim?

Həqq sevüb dedi, həbibim, şanunə lövlak ilə
Elminə eyn olduğun dəm layəqindən nədim.

Əhsəni-təqvim imiş boyun əla-l-ərş istiva,
Qədün ögüb dərəm uş sidrədən ali müqim.

Cənnətül-məva yüzündür gözlərindən rövşən uş?
Hur eynü rizvan görinür ədnü lədüni-nə'im.

Doğru yolundan bilindi, ey əlifdən qəddi rast
Kim həq doğru durur şər'ün sirat əl-müstəqim.

Gər nəfəxtu fihi min ruhi degiləmsə dəmün,
Dirilərmiydi eşidüb anı hər əzimi-rəhim.

Kə'bə hüsnündə xalun qılmayan qiblə məqam
Yüz çevirüb, sümmə vəchüllah bilməz ol rəğim.

Vəhdəti-eşq ilə vəchün görməyən, ey nuri-həqq,
Biləməz nədür o yüzdən eşq ilə biçün deyim.

Nərgisün kimi əlilə ləbləründən qıl şəfa,
Çünki sihhət bulur anun şərbətün içən səqim.

Görmədim zülfü rüxünlə gözü qaşu kimi bən
Həmdəmü mə zadü liqam Musəvü məhrəmü nədim.

Zülfünün rövşən səvadidir bəyazi-vəch ilə
Küfr ilə imanı xəlqün, ey məhəbbətdən həyim.

Toprağə nisbət qılubən tisnün, ey qüdsi-vücud,
Münkirə şeytan kimi hər bulhəkəm oldu rəhim.

Küfri-zülfündür vətən, iman yüzündən bilinə
Sevmək ol küfri anunçün dedi imandan əlim.

Rövşəninün sirrini faş etmə derəm, Gülşəni,
Ğeyrətindən çünki olur faş edənə həqq əzim.

* * *

240. Eşq ilə deyüb "ənəl-həqq" gör nə Mənsur olmuşam,
Kəsrətümdən vəhdət içrə çünki məstur olmuşam.

Olalı biganə əqlə aşinayəm eşq ilə,
Həqqə yaxın olub ondan özümə dur olmuşam.

Söndürüb nari-həvami nur edəli eşq ilə
Can gözün açub, neçün gör nar ikən nur olmuşam.

Qılalı vəchün təcəlli mehr ilə candan sana
Ol təcəllidən yanubən sanasan Tur olmuşam.

Görübən hüsnün qiyamət xəlqi də'vət eylərəm,
Ün çəküb həşr içün guiya sur olmuşam.

Qibləyi-hüsnün görəldən Kə'bə qılmış vəchümi,
Ol nəzərdən Qüdsü Kə'bə, beyti-mə'mur olmuşam.

Yüzüni qeybü şəhadət görəli hər vəch ilə
Şahidün gördügi nazir, eyni-mənzur olmuşam.



Gün kimi rövşən nəzər çeşmində vardır şöhrətüm,
Yer yüzində, gögdə gündən-günə məşhur olmuşam.

Görəli iqlimi-hüsnün padşahidir yüzün,
Bəndəyəm şahinə anun, gərçi fəğfur olmuşam.

Qönçə hüsnün açılıban gəldügini görəli
Bülbülün tək ol fərəhdən şadü məstur olmuşam.

Eşqinün vəchinə könlüm lövhi-məhfuz olalı
Ol təcəllidən kəlamə rəqqi-mənşur olmuşam.

Yazılan sə'bül-məsani hüsnünün ayətidür,
Ol kəlami-eşqə nisbət hərfi-məstur olmuşam.

Qılalı eşqün mənzil könlüm evin, ey pəri,
Guyahinçün ol əvdən dilsirə məhcur olmuşam.

Gözümə duş olalı yüzün nedim, de, ey nigar?!
Unudub sevgündən özüm mehri-məğrur olmuşam.

Zikr edərkən eşqünlə Rövşənidən fikr ilə
Zakir ikən Gülşənisiz eyni-məzkur olmuşam.

* * *

241. Gün kimi rövşən cəmalun mahi-taban bulmuşam,
Görəli xədd ilə xalun küfrü iman bulmuşam.

Olalı zahir cəmalun, ey mələk yüzlü bəşər,
Əhsəni-təqvimə məzhər vəchə inan bulmuşam.

Surətün lövhinə yaxın surəyi-rəhman oxur,
Ey həqün vəhbinə məzhər, lövhi-Qur'an bulmuşam.

Dirilik dövranı gülzar ləbləründən təşnəyə,
Xızrvəş andan anunçün abi-heyvan bulmuşam.

Mütləq ikən qeydə salan bu pərişan könlümi
Bir pərinün zülfi kimi dili-pərişan bulmuşam.

Leylətül-qədrün bərati zülfünün pürtabidür,
Qədr nisbət ol pərişan zülfi taban bulmuşam.

"Küntü kənz"in gənci içün qılmışam könlüm xərab,
Gənci-eşqi gizləməgə gör nə viran bulmuşam.

Can verərdim cənnət içün görmədin didarini,
Ədn imiş vəchün, görəldən xüldün heyvan bulmuşam.

Aldayub vaiz bəni, "fərdayə satmə" kim, bu gün
Yarın olan cənnət ilə hurü ğılman bulmuşam.

Görəli cənnət cəmalun, ey gülistani-ədəm,
Gülşəni-bixar olan güldən gülüstan bulmuşam.

Gecə-gündüz açuban vəchün istər şeş cəhət,
Yerü gögdə hər nə var, hüsnündə heyran bulmuşam.

Qiblədə vəchün görəli bildüm Allahun adın,
Qüdsü Kə'bə ol nəzərdən pəs rəhman bulmuşam.

Vəchün imiş görsədən həqdən özün rəhman sifət,
Mari-meyti əzri-meyti ana bürhan bulmuşam.

Eydi-əkbərdir cəmalun görəlidən vəchüni,
Qıluban bayramü canum ana qurban bulmuşam.

Dərd imiş dərman bana eşqün dəvası, ey təbib,
Bilməzəm dərdi nədür, çün eşqi dərman bulmuşam.

Gün kimi rövşən cəmalun görəli, ey məhliqa,
Vəchünün sevgüsini canumə canan bulmuşam.

Açılalı qönçədən hüsnün güli, ey gülüzar,
Gülşənivəş əndəlibün bin hezaran bulmuşam.



* * *

242. Eşq ilə yoğurdu tinün çün əzəl kövni-həkim,
Ta ola təxmiri onun fitrəti-həqdən ə'lim.

Yoğ ikən ma ilə tinün surət ilə məzhəri,
Abü canun mə'nisinə surət edəydi qədim.

Vəhdətün elmində eyn ikən vücudi-kainat,
Bitə'yini-eynə məzhər sənsən, ey həqqə həmim.

Çün əlifbayi-bidayət sənsən ismü zat ilə
Dilindən məzhərən Allahü rəhmanü rəhim.

Yazmadın nunü qələm lövh üzrə xətti-kainat
Nurdən safi bəyazun nəsxə eyn idi, məqim.

Doğalı gün kimi vəchün tağılub bilinmədi
Şeş cəhətdən görsədüb ol eyni-ə'yandan ə'mim.

Sübhdəm qoxun alubən əsəli badi-səba,
Doldurur aləmə andan ənbərin buyin nəsim.

Ayü gün vəchün görəli gecə-gündüz dövr edər,
Sübhü şamın vəchün istər zuziya ilə nədim.

Yox şəbihün mülk içində, həm nəzirün, ey həbib,
Ziddü niddün çün ədəmdən mümtəne' sana qəsim.

Rövşənidən vəchün istər Gülşəni eynül-əyan,
Gün sifət rövşən ziyadən görmək, ey əbdi-kərim.

* * *

243. Ey məzhəri xiyalun, səndən budur sualum,
Nədür həqiqət andan, bildünsə ver cəvabum.

Sevdamıdır başundə xeyli xiyalun etgil,
Düşdəmisən sayuxlar deyüb xiyalə balum.

Mənbə xiyalə səndən yanə yox zamanda
Ana məkan anunçun derisən olub malum.

Tərk et xiyaluni ta sevdayi kimi andan
Bilüb həqiqətini demə bisəkrü balum.

Surət məcazun etmə mə'niyi-həqqə nisbət,
Çün nəqs odur deyənə təkmil içün kəmalum.

Könül verüb xiyalə salma başunə sevda,
Deyüb bəyanə andan budur dilümdə qalum.

Səmt et xiyali-dildən nitqün bəyan edən dəm,
Desün şəkvətün andan, gələməz yana halum.

Bin dil ilə der isən sevda nədür başumdə,
Anladmazam andan yüz binə bir xiyalum.

Bul vəsli-infisaldan, sən sor xiyali ta kim,
Sevdadan etməyəsən vəslünlə infisalum.

Mehr ilə aydan aydın göz açmayan görəməz,
Ta görsədəm xiyali andan sana cəmalum.

Ay kimi Gülşənidən Aydın elin xiyal et,
Ta gün kimi doğan dəm bulmayasan zəvalum.

* * *

244. Eyni-elmim dərk içün lam ilə mim
Məzhəri müzhər sifət elmi-ə'lim.

Elmi-əsmayi müsəmmadən bəyan
Edərəm tə'limi-rəbimdən müqim.

"Be"yi-bismillahi-məzhər nisbətim,
Məzhərim oldu cövri-həməndən rəhim.



Yox bana dərk ilə idrak ansuzun
İczü heyrət oluban daniş nədim.

Mə'rifətdəndir bəyanum elm ilə
Eynə məzhər qılalı dərkim kərim.

Elm içün lövlak gəldi şanumə
K'ol iradət nitqi-danişdir qədim.

Kənzi-məxfi sirrini faş eyləyən
Elm idi kim, bilənə ondan nəim.

Əvvəli mö'min bənəm ol elm içün
Dedi, danişür olan dəmdə kəlim.

İstifa andan bulur idrak ilə
Hər ki cüz'-külldən qılur qəlbin səlim.

Rövşənidən elm alalı Gülşəni
Bildi danişdən nədür dərki-həkim.

Rövşəniya, münkir görüb yerim,
Budur ol yüzi qara, əhli-cəhim.

* * *

245. Ey aşiqlər, sormun bana bənsüz nə kirdar olmuşam,
Çünki bu dəmdə sirr-xəfi eşq ilə göftar olmuşam.

Müşkül budur, həq qılubən dönməz ölümdən kimsənə,
Nə varlığ ilə yox sifət bənsüz çü pəndar olmuşam.

Verəlidən eşqə könül, ondan rəvanım cüzvü küll,
Yoxdur bana onsuz səbil, ondan çü həmkar olmuşam.

"Dul" aləmində şad ikən, mütləq sifət azad ikən
Eşq ilə bəndi-nisbəti qeydə giriftar olmuşam.

Eşq edəli bənsüz bəni, bildirməz oldu bən bəni,
Anun içün çün Gülşəni məcburü-muxtar olmuşam.

Urəx-yəxin birdir bana, bənsüz səfərdən hər yana,
Eşidübən qalmın dana, çün eşqə rəftar olmuşam.

Eşqün məhali-hal olur, ana günəh inkar olur,
Andan səvabum görübən demən günəhkar olmuşam.

Eşq ilə sirdən məhrəmi, olalı bilsüz həmdəmi,
Sirri-xəfidən adəmi cüz'-külldən əsrar olmuşam.

Girəli eşqün mülkinə yoxlığla varlıq eylərəm,
Qarışub anun gilinə topraqla mə'mur olmuşam.

Yıxub imarət küllini viranə qıldım eşq içün
Ta gəncini gizləməgə sorsan nə me'mar olmuşam.

Eşq ilə namü nəng imiş rüsvaylığımi biləli,
Tərk edüb ondan adimi şöhrətlə biar olmuşam.

Mənsur "ənəl-həqq" dedigin eşidə bəs leysə sözin
Deyüb ənəl-eşqi rəvan "leysə fi d-dar" olmuşam.

Eşqü məhəbbət güllərin qönçə sifət açılduğın
Biləməzəm ondan neçün, gəh gül, gəhi xar olmuşam.

Bir deməzəm yüz bin hezar, bülbülə dönüb ötərəm,
Eşqün gülüstanun görüb hər vəch ilə zar olmuşam.

Aydın elində Gülşəni Rövşənidən görüb tanı
Ayü günəşdən sən bəni, çün nur ilə nar olmuşam.



* * *

246. Sormun bana eşqi nədür, nolduğuni deyəməzəm,
Ana görə bəndən rəvan olduğini deyəməzəm.

Andan açub bu dəm gözüm, edəməzəm nedim sözüm,
İtirübən eşqi özüm bulduğuni deyəməzəm.

Tərk edübən aşiq özün, can verübən görər yüzin,
Can yerinə eşqi-güzin qılduğuni deyəməzəm.

Könlüm evin qılub töhi, canə verəldən agəhi,
Şah ilə bəndə *xərgəhi dolduğini* deyəməzəm.

Gözlərinin bəbəklərün qərqə verən könül kimi
Rövşənidən bəhrə rəvan dalduğini deyəməzəm.

Eşq edəli könül gözin, tərk edübən rəvan özin,
Bir yerinə canun yüzin alduğuni deyəməzəm.

Eşq ilə can dağlanalı, tutuşubən göynər könül,
Leyk ana dudi nədən salduğini deyəməzəm.

Eşq ilə varub ol yana, ta ki verəm canı ana,
Canı verən dəmdə bana qılduğuni deyəməzəm.

Gülşənivəş sevguyilə bey'ü-şira qılanda eşq,
Can verübən bəha ana alduğuni deyəməzəm.

* * *

247. Ey aşiqlər, bir den bana bən nəyə buldum, bilməzəm,
Bənlik olandan boşalub, den nəylə doldum, bilməzəm.

Yeddi dənizdən keçəli, dörd irmağından içəli,
Tey qılubən bəri degüz, nə bəhrə daldım, bilməzəm.

Bu mülkə əl urulmadan, tərtib rəvan qurulmadan,
Bən eşq ilə göndərilüb, nə ilə gəldim, bilməzəm.

Dondən-donə girüb gələn, eşqim deyü dövran edən,
Sevmək nədür anı bana deyəndə bildim, bilməzəm.

Heyrət budur eşidənə, eşq ərünə iş edənə
Bəndən itüb andan yana, bul, belə buldum, bilməzəm.

Eşqün dükanın açalı, könül mətaın görəli,
Nəqdi-rəvanım verəli andan nə aldım, bilməzəm.

Varlığ nə isə salalı, yerinə yoxlığ alalı,
Heyrət budur, yoxluğ içün varlığ nə saldım, bilməzəm.

Tərk edəlidən bən səni, budur tələb, ey Gülşəni,
Nə aşinalıxdan sana biganə oldum, bilməzəm.

* * *

248. Ey aşiqlər, eşqə görə neydügimi deyəməzəm,
Ana görə nəydim degüz, şeydügimi biləməzəm.

Heyrət budur, canbaz neyəm, den şeymiyəm,
billah teyəm,
Nə vəch ilə ol mə'nidən həydügimi biləməzəm.

Eşqün şərabın içənə, iyləməsindən qayinə
Əql ilə usdan keçənə meydügimi biləməzəm.

Eşq iqliminə girəli, iki cəhan bir görəli
Sultanlığ edib eşq ilə geydügimi biləməzəm.

Aydın elində, Gülşəni, Rövşənidən görsəm səni,
Rövşəniyi günəş misal neydügimi deyəməzəm.



* * *

249. Yarəbb, bu dərdümin ümmi bilsəm nədəndür, biləməzəm?!
Yaralu könlüm mərhəmi bilsəm nədəndür, biləməzəm?!

Ahum olub oddan şərər, bağrım kəbabi-dil çəkər,
Canım tutuşuban yanar, bilsəm nədəndir, bilməzəm?!

Canım yanub döndi tağə, tən kül olub sovrulmağa,
Dönə yerim vardan yoğə, bilsəm nədəndür, bilməzəm?!

Çarə dilər biçarəyəm, könül kimi xunxarəyəm,
Bixud sifət avarəyəm, bilsəm nədəndür, bilməzəm?!

Əqlim başa gəlməz bənim, ta kim seçəm dünü günüm,
Bir oluban yazü güzüm, bilsəm nədəndür, bilməzəm?!

Ölü kimi dirilməgüm, əqlüm gedüb dəlürməgüm,
Gah ağlayub, gah gülməgüm, bilsəm nədəndür, bilməzəm?!

Aydın elində Gülşəni huri-ziyadən Rövşəni
Ki deyər, amma bən anı bilsəm nədəndir, bilməzəm?!

* * *

250. Ey aşiqlər, eşq odunu bilsəm nədəndür, bilməzəm?!
Canü dilimdə dərdini bilsəm nədəndür, bilməzəm?!

Candan dilümi yandıran, dağ urubanu gündürən,
Tutuşduruban sunduran bilsəm nədəndür, bilməzəm?!

Könlüm içində nabəşir, qeyzi qəzən kimi dəşir,
Usum gedüb, əqlim şaşır, bilsəm nədəndür, bilməzəm?!

Könlümdəki eşqün odi, yandırmayubən nəm qodi,
Yanduğum andan sormadi, bilsəm nədəndür, bilməzəm?!

Yana-yana döndüm külə, sovruldu könlüm bülbülə
Müşkül vücudum həllilə bilsəm nədəndür, bilməzəm?!

Nur ilə narın söndürən, iki cəhanı bir görən,
Ol görməsin bəndən deyən, bilsəm nədəndür, bilməzəm?!

Aydın elində, Gülşəni, zuri-ziyadən Rövşəni
Gördüm nedim çün bən anı bilsəm nədəndür, bilməzəm?!

* * *

251. Könül bir dilbərə verdim, nedim den, bilməzəm nedim?!
Anunçun yetənə sordum, nedim den, bilməzəm nedim?!

Gözəllər canı sultanı, alub könlüm, dilər canı,
Nədür ol dərdə dərmanı, nedim den, bilməzəm nedim?!

Qapar əqlümi başumdən, qılub divanə düşümdən,
Çəkib əl aqil işindən, nedim den, bilməzəm nedim?!

Bəni bir Leyli Məcnuni qılaldan eşidün buni,
Seçəməzəm düni güni, nedim den, bilməzəm nedim?!

Görəli gülüzarumi, salub namusi arumi,
Gecə-gündüzdə zarumi, nedim den, bilməzəm nedim?!

Gecədə pasibanları uyumaz eşidüb zari,
Qovarlar çün bu bizari, nedim den, bilməzəm nedim?!

Düşəli eşq ilə halum, dükəndi əql ilə qalum,
Bilinməz oldu əhvalum nedim den, bilməzəm nedim?!

Sorarsa Rövşəni bana, nə oldu, Gülşəni, sana
Bilinməz halumi ana nedim den, bilməzəm nedim?!



* * *

252. Ədəm nisbət vücudumi nədəndir, bilməzəm, bilsəm?!
Bana bənsüz şühudumi nədəndir, bilməzəm, bilsəm?!

Nə dəlüyəm, nə usluyam eşidilmiş degil inan,
Səyuqlər kimi sözlüyəm, nədəndir bilməzəm bilsən?!

Cəhanda uslu-dəlüyəm, eşidilmiş degil inan,
Bana bənsüz bu söyləyən nədəndir, bilməzəm, bilsəm?!

Bana heyrət verən budur, dəlülik əql ilə xudur,
Oyanu qalq deyü xudur, nədəndir, bilməzəm, bilsəm?!

Soraram bən nəyəm bana, nədür bənlik olan sana,
Anunçün qalmışam dana, nədəndir bilməzəm, bilsəm?!

Budur müşkil ki, həll olmaz, anı bilən çü bilinməz,
Adamdan gizlü görünməz nədəndir, bilməzəm, bilsəm?!

Eşidib danlamın sözüm, yetürüb bulmazam özüm,
Görən bin göz ilə yüzüm nədəndir, bilməzəm, bilsəm?!

Bir oldum bir ilə, bir bax, ikilik tərkin ur, burax,
O birlə birligə yarıx nədəndir, bilməzəm, bilsəm?!

Tükənməz şan ilə andan hüviyyətdən zühur içün,
Xəfi sirdən verər dəmi, nədəndir, bilməzəm, bilsəm?!

Qəzayi-əsğər edən dəm cihadi-əkbərə dönsəm
O sultanın canü dini nədəndir, bilməzəm, bilsəm?!

Ziyadən Aydın elində görən der Gülşəni vechin,
Özün neydügini rövşən nədəndir, bilməzəm, bilsəm?!

Nə dəmsə Rövşəni deməz bana, ey Gülşəni, tabiş
Günəşdən Aydın elinə nədəndir bilməzəm, bilsəm?!

Görənlər Aydın elində sorar, ey Gülşəni, səndə
Ziyavü zunəma bunda nədəndür bilməzəm, bilsəm?!

* * *

253. Dur, yola düş, ey könül, eşq elinə gedəlüm,
Getməz isən o yola, de bana pəs nedəlüm?

Eşq elinə yönülən başdan qoyar ayağın,
Dur girübən o yola başdan ayağ edəlüm.

Dur uru yol yarağın, ey könül, eylə güzin,
Susuz girüb ol yola aclığı zar edəlüm.

Dur gedəlüm, ey könül, bir nəfəs ikinmədin,
Şövqə görə ol yolun zövqini dar edəlüm.

Oyalanub nəfsimiz candan şirin der dadan,
Gəl zövq ilə, ey könül, andan ləzzət dadalum.

Eşq elinin ləzzətin candan şirindir dadan,
Ərəs taxub boynuna itdən betər yedəlüm.

Rövşənidən görəyin Gülşəniyi, ey könül,
Deyübənü eşq ana, sor nə əda edəlüm.

* * *

254. Ey sər, demə təriqi-mə'rifət agahiyəm,
Ze dahi-şeyxəm vəli, talıblər dilxahiyəm.

Geyübən sufi səfasız sufi kimi zərq ilə
Laf uruban deməgil kim, sufiüllahiyəm.

İçməyən vəhdət meyindən, qılmaz sərxoşluğun,
Deyübən meyxur olanun pərdü tənhayiyəm.

Şiri-dəşti-fəqr yılmə özün, ey gürbə, vəli
Ögünüb desən rəvadır, cümlənün rəvahiyəm.

Ögüdi budur, dutarsan pirin, eşit, ey can,
Mar ikən demə özünə bəhri-dildə mahiyəm.



Qıl təvəzzö', sərvər, asta ayağə sürüb yüzün,
Buni deyüb pir olanun bən də xaki-rahiyəm.

Adəmün yedügi buğda xirmən ikən, eşit,
Kəhrəbayi-eşq olanun cəzb edəndə gahiyəm.

Qılmazam cəhl ilə rəşt, xəlqi-həqqə həqq bilür,
Mürşidü dana, vəli ariflərin həmrahiyəm.

Aysifət, aydın dil olub gün kibi rövşən göz aç,
Gör nə elmi-Misr olanın dəşd ilə dərgahiyəm.

Görsədüb gün kibi yüzüm məhv edən dəm yulduzi,
Rövşən ol yüzdən derəm kim nəcm olanın mahiyəm.

Rövşəni pərvərdəsiyəm, Gülşəni, günəş sifət,
Rövşən oldu aləmə kim, qul olanun şahiyəm.

* * *

255. Bənəm şəhbazi dövranun, şikar etməlikçün gəldim
Ki, şahi-eşqün əlindən uçub, seydün nədir bildim.

Qılub pərvazi eşq ilə məhəbbətdən şikar içün
Könül anmagə candan xəsisin övc ilə buldum.

Girüb Qafın cəhanunə nədür Simurğ ilə ənqa,
İkisüz biri seyd edüb, nədür mürği-rəvan bildim.

Nədir şəhbazi şəh seydin sorana şəh dilin derəm,
Cuş edər gəhi şəhbazım könül ovlamağa saldım.

Tükənməz mürği-dil vardır nəhayətsiz şikar içün,
Anı seyd etməgə şəhdən cüda düşübən əgləndim.

Əzəlsüz biəbəd eşqün şikaristani var cüz-küll,
*Anun mürğün* şəh *əlindən* şikar etməgə salındım.

Nedim şəhbaz ikən şahdan məhəbbət bazının seydi
Olubanü şikar içrə rəvan eşq ilə alındım.

Qılub pərvazi eşq ilə məhəbbət cani seyd içün
İtüb ənqa sifət andan rəvan Simurğini buldum.

Nədür şəh Rövşəni seydi ki, şəhbazi şikar edər,
Degil, ey Gülşəni, sənsüz qaçan seyd ilə bilindim.

* * *

256. Bilməzəm ruzi-əzəldə kim bəli dedi "nə'əm",
Çün yoğ idi kimsə ol dəm bud çün ğeyri-ədəm.

Vari yoqdan yandı ol dəm say ilə verən cəvab
Kol həvadisdən olandır cüzv ilə küldən üməm.

Nə vücud ilə ədəmdən sözə gəldi kainat,
Ta ki, imkani-həvadis olanə gör qədəm.

Yox əzəllə çün əbəddən ol sübuti-elm içün,
Eynə nisbətdən tə'yin kim vardır deyəm.

Ğeybin şey edən vücudi yox ana məşhuri-eyn,
Çün ədəm nisbətdən özün görməyüb der "la şey"əm.

Nəğməyi-ruhül-qüdüsdən bulmuyan dirlik deməz,
Nə vücud ilə xəfi sirr nisbəti, şeydən heyəm.

Qılmayan mə'dum nisbət öz vücudin deyəməz,
Mavü mənsüz şeyə nisbət biləməzəm nə şeyəm.

Müşkili-bihəll bana xud varlığ oldu yoğ ikən
Biləməzəm çünki yoxdan varlığ ilə bən nəyəm.

İtirüb heyrətdən özüm bulamazam istəyüb,
Çün vücudumun ədəmdən neydügin fikr eyləyəm.



Nə vücud ilə ədəmsüz söylədüm dil dilini,
Ta ki, andan tərcümançün məntiqin zikr eyləyəm.

Rövşənidən Gülşəniyi görmədən günəş sifət
Neçə hər sudan əyani önünə zilldir deyəm.

* * *

257. Hüsn iqliminə şahlığ edən yarımı buldum,
Sultani-zəman sevgilü dildarimi buldum.

Bülbül tək olub gülşəni-hüsnün görəli zar,
Ol yüzi güli-cənnətü gülzarumi buldum.

Bir baxışına iki cəhan nəqdini vermək
Ha nəqdi-rəvan sikkəlü dinarumi buldum.

Şad olubanü həmmi-cəhandan yeməzəm ğəm,
Çün sevibənü həmdəmi-ğəmxarumi buldum.

Gül kimi yənəx görsədəli gülşəni-hüsni
Nədir o gülə tikən olan, xarumi buldum.

Münkir kimi eşqünə əduvvi-zahidi-xudbin
Yarəm deyici məkr ilə əğyarumi buldum.

Qəddün görübən neyşəkərə nisbət edən der:
"Əl-minnətü lillah"[21] ki, şükür yarumi buldum.

Baxtum yuxuda görə gözünü, oyandı,
Ol gözi görən yuxuda bidarumi buldum.

Gözbağlayıcı sehr ilə fitnədə cadu,
Səhhari-zəman dilbəri-əyyarumi buldum.

Könül verübən həmdəmi-can istər idim uş,
Ol həmdəmi-can məhrəmi-əsrarumi buldum.

Türrə görəli bağladuğun belə kəməndün,
Uş dövri-qəmər türrəsi tərrarumi buldum.

Mənsurə dönüb mehr ilə derəm: "ənəl-eşq",
Çün ğeyrət ilən asmağ içün darumi buldum.

Bikar oluban kar edəli mehrüni candan
Tərk edüb işüm eşqün ilə karumi buldum.

Zülfün görəli küfr ilə iman kimi yüzün
Tərsayə dönüb din ilə dindarumi buldum.

Eşqünlə bəla çəkmək imiş bari-əmanət
Əyyub[ə] dönüb səbr ilə ol yarumi buldum.

Məhv eyləyəli kəsrətümi vəhdəti-eşqün
Kəsrətdən itüb vəhdət ilə varumi buldum.

Əhdinə vəfa qılalı der Gülşəni, ey məh,
Kim, Rövşəniyi-yarü vəfadarumi buldum.

* * *

258. Candan dəxi sevgilü olan yarumi buldum,
Ol dil diləgi həmdəmü dildarumi buldum.

Hicran ilə cövrini çəküb könlüm alanum,
Vəsl ilə bu dəm əhdə vəfadarumi buldum.

Yusif kimi Misri-dilümə girəli mehri
Hüsnü satılan candakı bazarumi buldum.

Dəgməz dü cəhan bir pulə ol hüsnə bəha, çün
Nəqd diləmiş verməlü dinarumi buldum.

Ömr nişə yerim olmıyubən şadü fərəhnak
Şad olmağ içün həmdəmü ğəmxarumi buldum.



Məhrəm deməzəm faş edənə razini eşqün,
Bir gizləyici məhrəmi-əsrarumi buldum.

Görəli gözi şəbdəsin işvədə rövşən
*Könlüm alıcı fitnəyi-əğyarumi buldum.*

Nərgislərin uyur oyanux görəli çeşmün,
Datlu yuxuda didəyi-bidarumi buldum.

Ğeydinə salub bənd edəli könlümi zülfi
Can qeydedici bənd ilə tərrarumi buldum.

Mənsurə dönüb eşqün ilə də'vi qılalı
Zülfün kimi bənd ilə bəla darumi buldum.

Vəchündən imiş Turlə Musəyü təcəlli
Yüzün görüb, ol nur ilə uş narumi buldum.

Sən'an sifət tərk edəli din ilə millət
Tərsa oluban eşq ilə zünnarumi buldum.

İtirüb özüm deyəməzəm sənsuzin, ey dil,
Əğyar itürən yar ilə dildarumi buldum.

Şiranə gözün məst olalı qanım içübən
Rövşən baxubən göz görə xunxarumi buldum.

Ney kimi qədün bər verəli hübbi-nəyadən
Zövqün verübən şəhdü şəkərbarumi buldum.

Mehr ilə görən yüzüni, ey məh, nəzər edüb
Necə demişün ol məhi-ənvarumi buldum.

Gün kimi yanub mehr ilə bir mahliqadən
"Əl-minnətu-lillah" yüzi gültarumi buldum.

Zahid, sanki cənnət bənə didari həbibün,
Cənnət olmuş xüld ilə gülzarumi buldum.

Yüzün görübən tərk edəli dilini, ey can,
İtürmişidim mehr ilə bizarumi buldum.

Zülfün görəli küfr ilə imanə irişmiş,
İmanını küfr ilə edən darumi buldum.

Gün kimi əyan oldu cəhan xəlqinə zalim,
Kim, Gülşənivəş Rövşəni dildarumi buldum.

* * *

259. Hər nəfəs bir elmə məzhər an ilə şan olmuşam,
Mə'rifətdən ana görə eyni-ürfan olmuşam.

Qüdrəti-hikmətnümayəm "min lədun"[22] tə'lim ilə
"Əlləmül-əsma"[23]yə nisbət çünki insan olmuşam.

Gəh Süleyman məşrəbəm, gahı çu Asif elm ilə
Min lədun tə'limi-məzhər, eydi-rəhman olmuşam.

Gəh çü Musəyəm, gəhi tə'lim içün mə'ni sifət,
İstəfadən mövlud ilə ali-İmran olmuşam.

Gəh yədi-beyza sifət, gahi əsayi-mö'cüzət,
Gəh xiyaldan sehr yüdən ölimə sə'ban olmuşam.

Gəh Əzizi-Misr oluram, gahi Yusif qul ona,
Bəndəlikdən xidmət ilə mülkə sultan olmuşam.

Gəh olub Yə'qubi-məşrəb hüzn ilə vərhəm ğəmin,
Gəh fərəhdən şadü xürrəm, şeyxi-Kən'an olmuşam.

Gah Xəliləm xəllət ilə məşrəbi təslim olub,
Gəh anınçın nari-nurdən virdü-reyhan olmuşam.

Əvvəl-axır, ənbiyavü övliyanın məzhəri,
Kəsrət ilə vəhdət içün cəm'ü Qur'an olmuşam.



Oxuyub səb'ül-məsani duy nədir yeddi sifət,
Ki, əzim ol fəqrə nisbət cəm'i-Quran olmuşam.

Sirri-lövlakın məhəbbət kənzinə rövşən, vəleyk
Hüccədim həqdır, çü andan eyni-bürhan olmuşam.

Birdən ikilik cəhanın görsədir hər vəch ilə,
Qüdrəti-hikmətlə məzhər eyni-əyan olmuşam.

Gah oluram Nuh nisbət Nuh ilə gəştiyan,
Gah anın gözü yaşından eyni-tufan olmuşam.

Gah oluram nəhri-cənnət, səlsəbili-kövsərin,
Gah andan Xızr nisbət abi-heyvan olmuşam.

Gah səkkiz cənnət sifətdən "Ədn"iyəm mö'minlərin,
Gəh yeddi taliyyə nisbət həbsi-zindan olmuşam.

Bir demək yüz bin dərkə nisbət elm ilə
Hikmət içün "min lədun"dən çünki loğman olmuşam.

Var demək yoxdur əzəl çün eşqə nisbət ləmyəzəl
Kar edüb seyrinə nisbət şani-dövran olmuşam.

Dərdi-eşq içün dəva istəyən gəlsün verəyin,
Çün məhəbbətdən dəvasız dərdə dərman olmuşam.

Xəstəyi-eşq içün olan hikməti-Əflatunun,
Astanayi-səhhət içün şərbəti-can olmuşam.

Yeddi gəzdən sayanlar qətrəsin əmvac ilə
Desəm əgər hər birindən mövci-ümman olmuşam.

Sirri-insandan əmanət məzhəri olan bilir
Kim nə faş olmaz xəfi sirr, gənci-pünhan olmuşam.

Gün kimi yoxdur nəzirim Aydın elində şəbih,
Mən ki mehri-dərvişidən mahi-taban olmuşam.

Rövşənidən Gülşəninin nəzmini dürri-yetim,
Çün nəziri yoxdur anun, der ki, ketman olmuşam.

* * *

260. Ey aşiqlər, eşqə görə neydügimi deməzəm,
Anə görə nedim degüz, şeydügümi bilməzəm.

Heyrət budur çün bəni den şey-meyəm, billah şeyəm,
Nə vəch ilə ol mə'nidən heydügimi bilməzəm.

Eşqün şərabın içənə, ayılmasından qaçana,
Əql ilə usdan keçənə meydügimi bilməzəm.

Eşq iqliminə girəli, iki cəhan bir görəli,
Sultanlıq edüb eşq ilə geydügimi bilməzəm.

Aydın elində Gülşəni Rövşənidən görsəm səni
Rövşən günəşdən bən ana neydügimi bilməzəm.

* * *

261. Nəfsüm imiş düşmənim, dust edübən bəslərəm,
Eybini sirr sanubən anun içün gizlərəm.

Canıma ə'da ə'du biləli nəfs olduğun
Tərk edübən dustlığın düşmən anı bilərəm.

Hər kim anun dustluğın istəsə bəsləyübən
Gövdənü əhməq, səfih bixəbər ana deyərəm.

Nəfsi-həvadən həvəs birəxü çıx könlümə,
Meylini tərk etməyən könülü bən neylərəm?



Bir deməzəm yüz həvəs pərvər edər nəfsi-dün
Meyl edəcək ziynətə könlüm ilə gözlərəm.

Yaxşı-yaman, xeyrü şər, nəfsüm olur nəf'ü zər,
Anə görə halumi qal edübən söylərəm.

Heyrətə salan bəni budur eşitdün anı
Bilübəni nəfsümin fe'lini yalanlaram.

Rövşəniyə Gülşəni düşürəli nəfsümi
Səndən edüb dirligin, deyübən ismarlaram.

* * *

262. Nedim əql ilə bilinməz nədir halım, bəyan etsəm,
Çü sirr nisbət nihan olur, anı qaldan əyan etsəm.

Məhali aqilün bana olan dəm eşq ilə halət
Günəşdən faş olur nedim əgər sərdən nihan etsəm.

Nə deyüb anladım xəlqə məhali əql olan halum,
Çü eşq ilə bulub dirlik nədir andan rəvan etsəm.

Zəman yox haləti-eşqə məkansuz laməkan içrə,
Nə deyüb anladım əqlə, o haldan ani-şan etsəm?

İki aləmdə bir yüzdür məhəbbət eşqlə təcəlli
Tükənməz bir ikən anun bəyanın cavidan etsəm.

Məgər ənqa məhəbbətdür nişansuz Qafi-eşq içrə
Ki, əglənməz bəyan ana nişandan binişan etsəm.

Həzaran vəch ilə təqrir edərəm vəsfini eşqün,
Bilür təsdiq qılıb andan nə vəchə şani-an etsəm.

Şühudi-qeybçün təcəlla təsəvvürsüz yəqin edən
Bilür təsdiq qılub andan iman içün cinan etsəm.

Qılan təslimi-vəchini məhəbbət, eşq ilə dildən
Bilür ehsan nədir, andan həqə nisbət iqan etsəm.

Gülüstani-məhəbbət çün dönübən bülbüli-eşqə
Həzaran naleşüm vardır, özüm cüz'-küll zəban etsəm.

Nedim, ey Gülşəni, eşqü məhəbbət dilidir nitqin,
Xaçan kim ikisiz birə bəyanun tərcüman etsəm.

İki aləmdə söyləyən məhəbbət dilidir, əglən,
Əgər birdən iki sözün bəyanum səd cəhan etsəm.

* * *

263. Gərək degülsün, eşit münkir səma' edən dəm,
Ta qovar eşqi dildən zövqi-rəvanə mənzəm.

Candan açub qulağı bisəma'ə ilə eşit
Surini əhli-eşqün nəfxi-həqq ilə müdğəm.

Eşitməzdinmi, ey kər, eşq əhlinin səma'ın,
Dövr ilə dövrə görə gəlüb gedənidir həm.

Hərgiz səma'i inkar etmədi qütb olanlar
Hamə həbibi-nuri Şiblivü ibn Ədhəm.

Cəhlün bəyan edər bil elm əhlilə dilündən,
Qal ilə halə etsən tə'nə ziyadə lə kəm.

Sufi səma' edən dəm cəhl ilə zahidi-xüşk
Tər oluban qəm ilə olmaz fərəhlə xürrəm.

Münkir girüb səma'ə yılan kimi buruldu,
Guya ki, sancar anun canını mari-ərqəm.

Zövq etmiyən səma'ün sərxoşluğun inanmaz,
Yolundə məsti ondan düşər olub xəmi-cəm.



Hər kim səma'i xəmrin zövq etmədən bilməz,
Kondan şərab içənlər nə zövq ilə olur xətm.

Sərxoşluğun səma'ın zövq etməyən nə bilsün,
Neydügin ol müdamun kim içdi can ilən cəm.

Hər münkiri-səma'i-sorsəm cəvab verəməz,
Tiryaqi-əhli eşqün caninə nişədür səm.

Görsəm səma'ə münkir əql ilə qal edəni
Hal ilə dilə gəldim derəm səfihə sərsəm.

Qal etmə münkiri-dün görüb səma'ə halın,
Kəs dilüni o dəmdə səmt ilə olub əbkəm.

Eşitmədin sələfdən, ey naxələf ki, etdi
Halətlənüb səma'i elm ilə səndən ə'ləm.

Əhli-kəramət olan zövqün bilür səma'un
Halət dəmində biqal olubənü mükərrəm.

Hər kim ki şərh qıldı sədri-məhəbbət ilə
Zövqi-səma' olur çün zəxmi-dilinə mərhəm.

Ey Gülşəni, səma'ə inkar edənə derəm:
– Kəs dilüni bu qaldan, hal ilə ol ki, əpsəm.

* * *

264. Nedəm qurtulmadum eşqün əlindən,
Ağudan acı tə'n ilə dilindən.

Keçüb ömrüm gecə-gündüz ğəm ilə,
Yedügüm həmdür anun hasilindən.

Kimə sorsam bu müşkil həllini, der:
Budur könlümdə bəndən müşkilindən.

Yağar yağmur kibi eşqün bəlası,
Başuma rəhgüzər sağü solumdan.

Cihan güldür, tikani tə'ni-xəlqün,
Sorun, ol nişi-xari bülbülündən.

Dilərsən, Gülşəni, qurtulmax, eşit,
Görübən xarını əl çək gülündən.

* * *

265. Yüzün görən keçər canü cəhandan,
Çü şirindür anı görmək rəvandan.

Başından keçməyən, eşqün yoluna
Ayax qoymaz, sevüb can ilə candan.

Dilərsən vəsli-dilbər hicrət edüb
Keç özündən, görükən inü andan.

Verüb nəqdini ömrün eşq ilə al,
Həvasın dilbərün qurtul ziyandan.

Yəqindir vechüni şəksiz görənlər
Olup mö'min, keçər zənnü gümandan.

Lisanunçün dedi həq "lə təhərrük",
Ğəni de çü vəch ilə bəyandan.

Kəlamullahə məzhərdür bəyanun,
Deyən həqdür sənün nitqün lisandan.

Sənün vechündən oldu zahir əşya,
Amadə sirr ikən məxfi əyandan.

Həqün vechin bəyanun zahir etdi
Deyüb candan dəxi şirin bəyandan.



Sana münkir, münafiq oldu kafir
Çıxub cəhl ilə dinü həm imandan.

Sənün vechün mürid olub iradat
Dilədi sevgini kövnü məkandan.

Sənün yüzündən özgə Gülşəni der
Nədür cüz'-küll görən eyni-zamandan.

Ziyayi-Rövşəniyi Gülşənidən
Görən bilür nə zəvdur ani şandan.

* * *

266. Gəl bağə girüb, seyr edəlüm bir sənü bir mən,
Gül kimi ələ cam alalum bir sənü bir mən.

Dövr ilə içüp cami ləbaləb qılalum zövq,
Saqi ləbi kimi soralum bir sənü bir mən.

Xəlvət qıluban gülşəni-hüsnün həvəsini
Həmdəm oluban cam içəlüm bir sənü bir mən.

Yeyüp içəlüm, xürrəm olup eyşi-cəhandan,
Ğəm yeyən içün xoş güləlüm bir sənü bir mən.

Gül çağıdır, ey sərvi-səhi, gülşənə meyl et,
Ta seyr edüp onda varalum bir sənü bir mən.

Bir demə ki, yüz bülbül ötər gülşənə girsən,
Gəl varub anı eşidəlüm bir sənü bir mən.

Cənnət yüzünü görəlidən der bana könlüm:
– Bu cənnətə gəl can verəlüm bir sənü bir mən.

Yüzünü görən qiblə kimi der bana səcdə,
Bu vechə nəzər gəl qılalum bir sənü bir mən.

Könlüm hərəmi eşqüni xəlvət qıluban der:
Canumə rəvan ol, görəlüm bir sənü bir mən.

Şirü şəkərün zövqi nədür lə'lünə nisbət,
Datluluğun anun soralum bir sənü bir mən.

Bülbül kimi yüzün görübən zari qılanı
Eşitməgə qulağ uralum bir sənü bir mən.

Ney kibi nəva qılubənü inləsə aşiq,
Dəf kimi yüzinə çalalum bir sənü bir mən.

Sirrini desəm Rövşəninün Gülşəniyə, der:
– Candan ondan məxfi biləlüm bir sənü bir mən.

* * *

267. Kim edər yanmadum eşqün əlindən,
Yanub dinlənmədüm eşqün əlindən.

Gecələr şəm' kimi dan etisincə
Yanubən sönmədüm eşqün əlindən.

Çəküp eşqün bəlasın səbr edübən
Deyüp vah dönmədüm eşqün əlindən.

Tutuşub gün kimi, mehr ilə yanub
Demən kim günmədüm eşqün əlindən.

Qaçan seyd eyləyəm simurği-ruhi
Uçuban qonmadum eşqün əlindən.

* * *

268. İçənlər tolu camı eşq əlindən
Bilür zövq ilə kamı eşq əlindən.

Qaçan ayıluban özünə gəlür
İçən cami müdami eşq əlindən.



Keçəli ağü qaradan duymaz oldum,
Nədür sübh ilə şami eşq əlindən.

Olub bədnamü rüsva, rindü ovbaş
Saluban nəngü nami eşq əlindən.

Könül pərvanəvəş yandırdı canum,
Qıla ta püxtə cami eşq əlindən.

İtirüb bulmaz oldum, heyrətüm bu,
Özümlə xassü ami eşq əlindən.

Necə rədd eyləyüm xəlqün cəvabın
Unudanda səlami eşq əlindən.

Məkan ilə zəmani bilməz oldum
Məratiblə məqami, eşq əlindən.

Deyəndə mə'rifət qalini xəlvət
Unuduram kəlami eşq əlindən.

Kimə dad eyləyüm bidad edən dəm,
Degüz yırtub yəxami eşq əlindən.

Dəlirüb dağə düşənlər nə bilür,
Nəmaz ilə imami eşq əlindən.

Olur Məcnunü aqil Gülşənivəş,
Məqam əhli təmami eşq əlindən.

* * *

269. Yenə sevdayi oldum eşq əlindən,
Əcəb şeydayi oldum eşq əlindən.

Dönüb məcnunə aqillər qatında
Əqilsiz tayi oldum eşq əlindən.

Keçüp namusü arindən cəhanun,
Nedüm rüsvayi oldum eşq əlindən.

Gecə-gündüz qılub əfqanü nalə
Düdüksüz nayi oldum eşq əlindən.

Qılub tərki-vətən aləm içində
Gəzüb hərcayi oldum eşq əlindən.

İtüb eşq ilə özüm bulmayalı
Xəyalın "la"yi oldum eşq əlindən.

Dəmadəm Rövşəniyə Gülşəni der:
– Nedim sevdayi oldum eşq əlindən.

* * *

270. Nedəm dərdim tükənməz eşq əlindən,
Deyən dərdin usanmaz eşq əlindən.

Bəla çəküb könül bir dəmdə yüz gəz,
Qayıdub gerü dönməz eşq əlindən.

Susayuban könül bağrum qanuna
İçüp qanumi qanmaz eşq əlindən.

Düşüb pərvanə kimi şəm'i-eşqə
Könül kim der ki, yanmaz eşq əlindən.

Tutuşub mehr ilə yananda canum
Gözüm yaş töksə, sönməz eşq əlindən.

Urub dağ üstünə dağ eşq ilə dil
Rəvan den, nişə yanmaz eşq əlindən.

Yanuban Rövşənidən Gülşənivəş
Xanı sabir ki, dönməz eşq əlindən.



* * *

271. Necə fəryad edəm, billah, amansuz eşqün əlindən,
Çağırıb dad edəm, billah, amansuz eşqün əlindən.

Könül verüb alamazam, gözüm ağlar, güləməzəm,
Nida çəküb biləməzəm amansuz eşqün əlindən.

Cəhanda rindü rüsvayi olub, bednami-hərcayi
Yığubən başə ğovğayi amansuz eşqün əlindən.

Nədür halum biləməzəm, özümə çün gələməzəm,
Gözün yaşın siləməzəm amansuz eşqün əlindən.

Könüldən qaynayub daşə, xəyalun çıxalı başə,
Od urmuşam quru yaşə amansuz eşqün əlindən.

Düşəndə müşkülüm ona, soraram, Gülşəni, sana:
– Nədür halum, degil bana, amansuz eşqün əlindən?

* * *

272. Əcəb sevdayə düşdüm eşq əlindən,
Quru qovğayə düşdüm eşq əlindən.

Gəhi dağ ilə daş oldu məqamum,
Gəhi səhrayə düşdüm eşq əlindən.

Dəlürdüm bilməzəm qal ilə halum,
Budur heyhayə düşdüm eşq əlindən.

Nədür, nasih, bana tədbir verəyün
Çü mən xudrayə düşdüm eşq əlindən.

Məkanum külxan oldu gülşən ikən,
Əcayib cayə düşdüm eşq əlindən.

Olub sərdari-eşqün sərfirazəm,
Əgərçi nayə düşdüm eşq əlindən.

Görünüb Rövşənidən Gülşəni der:
– Günəşdən sayə düşdüm eşq əlindən.

* * *

273. Yenə divanə oldum eşq əlindən,
Yenə biganə oldum eşq əlindən.

İmarət dilər ikən könlümü uş,
Yıxub viranə oldum eşq əlindən.

Dönüb Məcnunə halum Leyli içün
Yeni əfsanə oldum eşq əlindən.

Ayılmaz sərxoş oldum cuş içində,
Məgər xümxanə oldum eşq əlindən.

Könül meyxanəsinün xəmri içün
Əcəb peymanə oldum eşq əlindən.

Əmanət gənc imiş kənzi-xəfidən,
Ana viranə oldum eşq əlindən.

Qılub canini qurban Gülşəni der:
– Fəda cananə oldum eşq əlindən.

* * *

274. Könül sevdayə düşdü eşq əlindən,
Başum qovğayə düşdü eşq əlindən.

Sararan gün kimi bənzümə baxun,
Əcəb simayə düşdi eşq əlindən.



Başum tup edəli meydani-eşqə,
Çalınup payə düşdi eşq əlindən.

Neçə Məcnun bənüm tək şəhrü kuyi
Qoyub səhrayə düşdi eşq əlindən.

Könül tərk edəli rayini başdan
Əcəb birayə düşdi eşq əlindən.

Çəküp ğəmdən nəfəs canum rəvandan
Fəğanə, vayə düşdi eşq əlindən.

Başumə Rövşənidən, Gülşəni der:
– İlahi sayə düşdi eşq əlindən.

* * *

275. Qaçup qurtulamazam eşq əlindən,
Nedəm, den, biləməzəm eşq əlindən.

Qılub Məcnun kimi Leyliyi sevda
Özümə gələməzəm eşq əlindən.

Əcəb budur itirübən özümi
Arayub bulamazam eşq əlindən.

Verəli könlümi sevda xəyalə
Dönübən alamazam eşq əlindən.

Könüldən olalı mehr ilə yoldaş
Verüb can qalamazam eşq əlindən.

Bana den Gülşəni nədür bilənlər
Konunla olamazam eşq əlindən.

* * *

276. Neçə bir dad edəm eşqün əlindən,
Yanub fəryad edəm eşqün əlindən.

Çəküb ün ney kimi hər dəm nəfəsdən
Nəvamı bad edəm eşqün əlindən.

Duyulur nedəyim könlümdəki sirr
Anub gər yad edəm eşqün əlindən.

Könlüm qullux qılub, şahlığ diləməz
Koni azad edəm eşqün əlindən.

Qılup ah ilə vah zikr ilə hər dəm
Neçə arvad edəm eşqün əlindən.

Yaxub könlüm diləməz çün imarət,
Necə bünyad edəm eşqün əlindən.

Diləməz qayğudan qurtula könlüm,
Necə bəs şad edəm eşqün əlindən.

Görəndə Rövşəniyi, Gülşəni der:
– Kimə fəryad ədəm eşqün əlindən?!

* * *

277. Qaçup qurtulamazam eşq əlindən,
Nedəm, den, bilməzəm eşq əlindən?

Olub Məcnun sifət Leyliyi eşqə,
Özümlə olamazam eşq əlindən.

Qılup sevdayi kimi heyrət içrə,
Sözümi biləməzəm eşq əlindən.

İtürdüm əql ilə fikrü xəyalum,
Arayub bulamazam eşq əlindən.



Əzəldən könlümi verəli eşqə,
Əbəddə alamazam eşq əlindən.

Nedəm, ey Gülşəni, candan dilümi
Verəli alamazam eşq əlindən.

* * *

278 Kimə qılam şikayət eşq əlindən?
Nədür halum hekayət eşq əlindən?

Tükənməz dərdim ondan söyləyübən
Bulamazam nəhayət eşq əlindən.

Bilindi dərdü möhnət çəkməgümdən
Bana can vermə ğayət eşq əlindən.

Qiyamət gəlmədən uş qopdi bana
Cəhan içrə qiyamət eşq əlindən.

Nəsəqim olan bulmaz sihhət andan,
Kimi gördün səlamət eşq əlindən.

Yedi dəniz mürəkkəb olsa, yazsam,
Qalur baqi rəvayət eşq əlindən.

Qələm duymayuban şəqq oldu başdan,
Qılanda həq bidayət eşq əlindən.

Yeddi qat yerü gögü daxi tasıra,
Qəbul etməz əmanət eşq əlindən.

Mükərrəm olmayan Adəm geyəməz
Başa tacü kəramət eşq əlindən.

Könül eşqə verən olmaz peşiman,
Çəküb, axır nədamət eşq əlindən.

Demin bana, xanı nam ilə nəngün?
Əgər olsam məlamət eşq əlindən.

Könül sevüb səfər dilər rəvanum,
Qılamaz çün iqamət eşq əlindən.

Əmin olan əmanət sirri içün
Verür əhlə əmanət eşq əlindən.

Səyadət taci bəsdür Gülşəniyə,
Aman içün əlamət eşq əlindən.

* * *

279. Dəlürüb dağə düşdüm eşq əlindən,
Nə bəndü bağə düşdüm eşq əlindən.

Eşit ney kimi əfğanum nəvasın,
Yaxub dil dağə düşdüm eşq əlindən.

Çəküb seyr ilə eşqün dərdüni xoş,
Əcəb uçmağə düşdüm eşq əlindən.

Qıyub təxtü nə'imini cəhanun
Gəlüb toprağə düşdüm eşq əlindən.

Cəhan xəlqi qılub başumə qovğa
Guruh yığnağə düşdüm eşq əlindən.

Gözüm yaşi çıxar sirrin tutana
Nedim ayağə düşdüm eşq əlindən.

Tolu kimi yağub başumə taşlar,
Əcayib çağə düşdüm eşq əlindən.

Gəzirkən doğru yolumə əgilüp
Nə solü sağə düşdüm eşq əlindən.



Görən halumi yığılur başumə,
Nedəm oynağə düşdüm eşq əlindən.

"Gözümə uyxu girməz", Gülşəni der:
– Nedəm oyağə düşdüm eşq əlindən.

* * *

280. Ey aşiqlər, gizlü nihan kimdən edüm görülmədin,
Nerdə idim, edün bana bu karxanə qurulmadın?

Ol cəhandan bu aləmə nişə gəldüm, edün bana,
Eşidənlər qala tana tə'b çəküb yorulmadın.

Yer gögə bünyad olmadan, şeş cəhətə ad olmadan,
Nəhr ilə bir də yelü ma bulunuban turulmadın.

Yerüm ikən mülki-Ədəm, keçə idi günüm o dəm,
Dövr edübən mülki-vücud ağ-qaradan görülmədin.

Bilmişdim adəm olanı, əvvəl axırda gələni,
Həqq ilə batil biləni adım adəm urulmadın.

Çərxi-fələk dövr etmədən, gecə gəlüb gün getmədən,
Adəm gəlüb düş görmədən, tə'bir ilə yorulmadın.

Qüdrət suyilə hikmətin töxmini tinin neydügin
Kim bilür sirrdən xəfi nə vəch ilə yoğrulmadın.

Rövşənidən sirri neçün Gülşəni faş edər, desün,
Eşq ilə can verübənü könül ilə sorulmadın.

* * *

281. Cəhanda görmədüm avarə bəndən,
Kolubdur çarəmüz biçarə bəndən.

Dilərəm güzgümü könül yolundan
Aparam şövqümi dildarə bəndən.

Nedəm könüldən özgə bulamazam
Ki, peyğam ilətə gizlü yarə bəndən.

Təvafi-kuyin içün Kə'bə kibi
Degil, ey dilbərüm, kim varə bəndən.

Könül gözün açup vəchün görəli,
İçər qan oluban xunxarə bəndən.

Kimim var göndərəm ol tündxuyə
Könüldən özgə kim yalvarə bəndən?

Könül eşqün mərizidür umar kim,
Deyəsən yox şəfa bimarə bəndən.

Yüzün gülün görübən güldən özgə
Nə bülbüldür gələn gülzarə bəndən?

Könül Mənsurə dönüb eşqün ilə
Nedəm asılmağ istər darə bəndən.

Eşidüb razimi həmdəm verüpdi
Bu həsrət, zar ilən dildarə bəndən.

Cəhanda ğəm yeyən eşqünlə çoxdur,
Vəli az bulunur ğəmxarə bəndən.

Yüzün gülən görəldən könlüm, ey can,
Dönübdür əndəlibi-zarə bəndən.

Könül, var Rövşənidən istə çarə,
Bulunmaz, Gülşəni, çün çarə bəndən.



* * *

282. Girüb meydani-eşq içrə başın tup eyləyən gəlsün,
Əyax yerinə başini o meydanə qoyan gəlsün.

Dirilə ölmiyən geyməz kəfən fəqrin libasını,
Kəfən yerinə ol toni olub diri geyən gəlsün.

Olalı mübtəla eşqə səla derəm fəlah üçün
Bəlavü möhnətə ondan könül verüb duyan gəlsün.

Seçənlər zəhrü tiryaqi biləməz ləzzətin eşqün,
Bu yolda nuş edən nişi, acı-datlu yeyən gəlsün.

Səvadi-ə'zəm içində səladur cüməvü eşqə,
Qiyaməti-qamətindən çün imam oldum, uyan gəlsün.

Günəşdən faş edüb eşqi deyəndə qal ilə haldan
Eşidüb surəti qaldan rəvan mə'ni duyan gəlsün.

Cəhani tərk edən geyər başinə Rövşəni tacın,
O tacı Gülşəni kibi bu tərk ilə geyən gəlsün.

* * *

283. Bana eşqün təriqini nədür deyüb soran gəlsün,
Ayax qoyanda ol yola başı ləzgin uran gəlsün.

Dirilə ölməyən bilməz nədür eşqün təriqini,
Olub eşq ilə dirinün düşin görüb yorən gəlsün.

Bu can quşu qənət açar, məhəbbət mülkinə uçar,
İkidən birligə qaçar, o seyranə girən gəlsün.

Şəriətlə ayax basan təriqət yoluna candan
Həqiqət rəhbərin sorup yol ərinə varan gəlsün.

Yeddi dənizlə altı səd keçənlər irdi mənzilə,
Keçübən bəhr ilə bərdən o mənzilə irən gəlsün.

Təriqət mülkinə şər'ün əlifdən toğrudur yoli,
Həqiqət iqlimi içrə üçüni bir görən gəlsün.

Eşidüb Gülşəni sözün, məhəbbət sirridür, əglən,
Deyəndə bir qili yüz gəz bu mə'nidən yorən gəlsün.

* * *

284. Bəlayimiş bu eşq, ana çəküb möhnət deyən gəlsün,
Dönüb Əyyubə dərd ilə tənü canə qıyan gəlsün.

Dirilə ölmüyən kimsə duyamaz dərdi nə eşqün,
Diriylə girübən qəbrə kəfən tonun geyən gəlsün.

Yürək qanın şərab edən, cigər dəlüb kəbab edən,
Yemək-içməgi tərk edən, anı içüb-yeyən gəlsün.

Bənəm Əyyubi dövranın, çəkərəm möhnətin anın,
Urana tərkini canun səla derəm, uyan gəlsün.

Bəlayi-eşqi zövq edən, canından daxi şövq edən,
Cihanü cani tərk edüp acı-tatlu deyən gəlsün.

Bəladür bişürən [cani], odur xas eyləyən ami,
Ol oddan bişməgə xami, yanubanü göyən gəlsün.

Ölən eşq ilə dirilür, itirmişkən özün bulur,
Nədür nəfs ilə rəbb bilür, anı bilim deyən gəlsün.

Səladur eşqə aşiqlər, imaminə bu qamətdən
Nəmaz ilə niyazini məhəbbətdən qılan gəlsün.

Edən fani sifatini, bilir baqiylə zatini,
Bəqadən heyy həyatini görüb ölüm deyən gəlsün.

Bu yolda tərk edən tacı, bulur eşq ilə me'racı,
Əbadan fəqr ilə taci, tacın başə geyən gəlsün.



Salan əqlin pəlasını, geyər eşqin libasını,
Ərənlərün əbasını möhübbətdən geyən gəlsün.

Uçurup eşq ilə canın, unudan ab ilə nanın,
İçübən bağrınun qanın kəbab edüb yeyən gəlsün.

Girüb eşqin təriqinə, çağır talib fəriqinə,
Salubən kibr ilə kinə baş ayağə qoyan gəlsün.

Eşidün Rövşəni sözün nədür təliblərə candan,
Fədayi Gülşəni kimi dilü canə qıyan gəlsün.

* * *

285. Nədür eşqün təriqini könül verüb soran gəlsün,
Ayax qoyanda ol yola, başı tərkin uran gəlsün.

Məhəbbət yoluna girən urur canü cəhan tərkin,
O yolda eşqə canunı qoyubanu verən gəlsün.

Məhəbbət taci, ey dilbər, iki aləmdə tərk olur,
O tərkün tacini başə müvəddətdən urən gəlsün.

Uyur oyanuğəm deyən yuxu içindəki bixud
Oyanub eşq ilə bu dəm anun düşin yorən gəlsün.

Bu yolda varlığın salan, bulup yoxlux ədəm olan,
Vücud iqliminə girüp ögülmədən verən gəlsün.

Diləyən mə'rifət sirrin, eşitsün Gülşəni sözin
Deyəndə bir qılı yüz bin bu mə'nidən yorən gəlsün.

* * *

286. Cəhanda görmədüm avarə bəndən
Ki, ola çarəsiz biçarə bəndən.

Könül eşqə verüp qurtulamadum,
Dilər canum dəxi həm varə bəndən.

Əcəl kimi düşübdür ardıma eşq
Ki, alup canum ol aparə bəndən.

Könül eşqə verəli uğramadum
Canından olmuşa bizarə bəndən.

Görən bülbüllügüm gülzari-eşqə
Qalur heyran düşübən zarə bəndən.

Nə var canumdan özgə, Gülşəni, ta
Aparam Rövşəni dildarə bəndən.

* * *

287. Cəhanda nerdə var avarə bəndən
Ki, ola çarəsiz, biçarə bəndən?

Yeddi iqlimi gəzən "görmədüm" der,
Ləvəndü müflisü bikarə bəndən.

Yürək qanın içici su yerinə
Kim ola bilməzəm xunxarə bəndən?

Fələk gözün açalı dövr içində
Görəməz özinə həmkarə bəndən.

Bulamaz tə'nədən xəlq içrə gözlik
Yüregi ola yarə-yarə bəndən.



Nolaydı son nəfəs alan rəvanum
Aparaydı rəvan dildarə bəndən.

Nə var könlümdən özgə, Rövşəniyə
Aluban, Gülşəni, apara bəndən.

* * *

288. Kim gördü mələk yüzlü pəri cinsi-bəşərdən,
Bir sənciləyin ruhi-rəvan, əhli-bəsərdən.

Aydan dəxi aydın görürəm yüzünü, ey məh,
Mehri günəşi doğduğu dəm eyni-səhərdən.

Açıldı sinüb ğönçədə ikən güli-hüsnün
Çəkdün o gülüstanə ğəta sünbüli-tərdən.

Bildim nəyimiş nar ilə Musayə təcəlli
Mehrin günəşi görünəli tabi-şəcərdən.

Qəddün kimi sərvi-rəvan görmədi kimsə
Bəhr ilə bəri gözübəni xüşk ilə tərdən.

Baş tərkin urup, qo qədəmüni rəhi-eşqə
Qurtulasın eşqə görə xövfü xətərdən.

Aparmaz imiş yolu başa xövf ilə kimsə
Çəkmə qədəmün qorxubani can ilə sərdən.

Dil sevdüginin şövqini qıl canunə munis
Ta mehrün alup can verəsən ana nəzərdən.

Ay kimi yüzün görə demə zahidi-xudbin
Görməz, çü anı kurü bəsər didəyi-sərdən.

Gün kimi görən Rövşənidən Gülşəni vəchin
Bilür nə ziyayimiş anı zilli-Öмərdən.

* * *

289. Cəmalun tabişi məhparələrdən,
Görünür ay kimi istarələrdən.

Yüzünün tabişin hüsn iqlimində
Diriğ etmə baxan nəzzarəllərdən.

Gözündən fitnədə cadu görürməz
Nəzər əhli olan biçarələrdən.

Necə sevdayi olmasun görənlər
Sənün qaşü gözünü qarələrdən.

Çəkər bidillərin ğəm hicrün ilə,
Xəbərdar ola gör ğəmxarələrdən.

Könül kirpik ucundan parələnüb
Seçilməz oldu uş ol yarələrdən.

Uyalı gözümə könlüm görən der
Olupdur bixəbər avarələrdən.

Əcəb bir çarə istər könlüm, ey can,
Özündən çarəsüz biçarələrdən.

Gözüm kimi tana qalub uyumaz
Görənlər ay yüzün istarələrdən.

Gəzəndə it kimi dişlər rəqib uş,
Gezəni, çıx deyüb, ol aralərdən.

Çatub qaşu gözün qılanda fitnə
Görən məftun olur həmxarələrdən.

Gözəl məkrini görüp Gülşəni der:
– Budur canum alan məkkarələrdən.



* * *

290. Dəmbədəm çün məst oluram zövq ilə mə'şuqdən,
Ün çəkübən aşururam naləmi əyyuqdən.

Deyəli eşqə salan mə'şuq dilindən əzəl
Seçməz oldum bən əbəddə sabiqi məsbuqdən.

Bilməzəm fəthi-mübindən özgə den nədür açan
Talibün yüzinə bağlu rövzəni məğluqdən.

Diləsən gülzari-eşqün gülini dərmək, eşit,
İgnə kimi tənnüni keçür dəmür çaruqdən.

Aci-tatlu qəhrü lütfi seçməyən talib bilür
Ləzzəti-eşqi nədür sormaguz faruqdən.

Dilərəm bu hoqqəbazi-dəhrə soram dəmbədəm
Nişə gətürüb-aparur lə'bətin sanduqdən.

Girəli Misrinə eşqün istərəm bazar edüb
Almayam Yusifdən özgə can isə ol sövqdən.

Eşidi gör Gülşəninün hikmət ilə də'vətin
İstəyənə xaliqin çün keçün məxluqdən.

* * *

291. Əcəb neçün bəlasuz olmayam bən,
Dəlülər uslanur, uslanmazam bən?

Çəküp eşqün bəlasın gecə-gündüz
Nedəm yüz çevirüp usanmazam bən.

Cəhanun möhnətü dərdin dəvasız
Çəküp eşq yolundan dönəməzəm bən.

Könül tutuşalı eşqün odundan
Yetər şəm'ə dönübən sönməzəm bən.

Gecələr tanə dəkin eşq əlindən
Qılup zari, yatub diklənməzəm bən.

Cəhənnəmdən betər eşqün odundan
Kim edər gecə-gündüz yanmazam bən.

Bana der: – Gülşəni, faş etmə sirrün,
Anunçün, Gülşəni, uş dinməzəm bən.

* * *

292. Könüldən özgə nəm var, varə bəndən,
Apara gizlü razum yarə bəndən.

Sürüp yüzün ayağına, pəyamum
Dilə gəlüp demə dildarə bəndən.

Nədür çarə sora ol dilrübadən
Olanə çarəsüz biçarə bəndən.

Düşəli eşq ilə karü barum
Bulaşmadum nedüm bikarə bəndən.

Dəlürüp eşq ilə tağlarə düşdüm,
Çü əqlüm aldı ol səhharə bəndən.

Başumə çıxalı sevdayi-eşqi
Görəməzəm, gəzər avarə bəndən.

Sor axı Gülşəni, canumdan özgə
Nə dilər Rövşəni həm varə bəndən.



* * *

293. Cəhanda yox kimi bir xar bəndən
Bulunmaz istəsən ğəmxar bəndən.

Gəzübən bulmazam bəhr ilə bərdə
Gəzər üryan cəhanda ar bəndən.

Mücərrəd fərdi-eşqi istər isən
Nədür fərdi anun gəl sar bəndən.

Gəlübən soranə eşqi-xabum
Budur derəm anı bax gör bəndən.

Çu münkir görəməz eşqün cəmalun
Niçün göz diləməz ol kur bəndən.

Könül hər dəm verüb dərgahi-eşqə
Sürüp yüz gün kimi baş qor bəndən.

Görəndə Gülşəni düş kimi eşqi,
Rəvan der Rövşəniyə yor bəndən.

* * *

294. Könül ğeyrət qılur dildarə bəndən,
Anunçün gizlü varur yarə bəndən.

Diləməz sevdigüni görə gözüm
Anunçün rəşk edər həm varə bəndən.

Biləməzəm nə yoldan seyr edər, den,
Varup k'olur çü ol səyyarə bəndən.

Gözüm bağlu görəndə dilbərini
Nə dilər bilməzəm sətharə bəndən?

Qapar əqlüm başumdan görsə yarın,
Könül dönübənü əyyarə bəndən.

İçüp qanumi qanmaz bağrı yanub,
Könül dönə-dönə xunxarə bəndən.

Nedim könül əlindən biləməzəm
Çü oldur çarəsiz, biçarə bəndən.

* * *

295. Nə deyəm yar ilə halum anlayə əğyarə bən,
Bir nəfəsdə olsa yüz can verdügimi yarə bən.

Çəkübən eşqün bəlasın mübtəla olan bilür,
Nə balalar çəkərəm dil verübən dildarə bən.

Keçmişəm canü cəhandan eşqə könül verəli,
Oluban Mənsuri eşqün gəlmişəm uş darə bən.

Gecələr sevdayi kimi yuxu girməz gözümə,
Qılalıdan bir nəzər ol nərgisi-bidarə bən.

Eşq ilə biçarəlixdən özgə yox çarə bana,
Anun içün dilərəm biçarəliğin çarə bən.

Eşq əlindən dəlü kimi düşübən dağlarə den,
Necə gezəm bixud ikən oluban avarə bən?

Rövşənidən gün kimi rövşən göz açan Gülşəni,
Bilür ol aydın bəsərdən baxmışam didarə bən.

* * *

296. Yüzün görüp derəm canü cəhandan
Zəman ol vəch imiş eyni-məkandan.

Sənün vəchündür əvvəl-axır, ey can,
Qılan batin özin zahir rəvandan.



Cəhan bir tən kimidür canı sənsin
Nədür can, ondan özgə kün-fəkandan.

Görən yüzün verür tatlu rəvanun,
Çü şirindir onun zövqi rəvandan.

Möhübbət aləmində vəchün imiş
Sevübən sevilən sevgilü candan.

İradət sirrisən lövlak danux
Lə'məründür qəsəm şanun bəyandan.

Hənuz Adəm yoğ ikən ma'yilə tin
Sənün cismün var idi canü candan.

Günəşdən zahir, ey can, Gülşəniyə
Görünən Rövşəni vəchündür ondan.

* * *

297. Necə könlüm ğəmündən dərhəm olsun,
Cəhanə şadilix, bana ğəm olsun?

Sürudü eyşü eşqün zarim'ilə
Möhübbət əhli içün xatəm olsun.

Çəküb dərdin dəvasız eşqünün bən
Deməzəm canumə ondan am olsun.

Dönüp Əyyubə çək eşqün bəlasın
Çoxalsa möhnətün demə kəm olsun.

Qaçup mülkinə maldan hər ki keçməz
Xaçan eşqün yolunda Ədhəm olsun.

Vücudun görməyən eyni-ədəmdən
Demən kim ol mükərrəm Adəm olsun.

Möhübbət halinə qal eyləyənin
Gözi kurü dili lal, əbkəm olsun.

Özün bilməsə, cahil den kim isə,
Əgər əllamdən ol əlləm olsun.

Fərəhdür Rövşənidən Gülşəniyə
Gələn həmm ilə ğəm, den, dərhəm olsun.

* * *

298\. Səfər qılmax dilər dilbər, deyübən: – Əlvida olsun,
Bana der könlüm uş ona düşübən: – Əlvida olsun.

Əgər bin olsa can təndə, biri qalurmi, den, bəndə?
Alan könlümi dünyadə, verübən: – Əlvida olsun.

Uyub sevdügine canum, gedər təndən könül kimi,
Dəxi nəm var ki, der dilbər, qoyuban: – Əlvida olsun.

Qiyamət ol zaman qopar başumə ildən ilərü
Ki, deyə dilbərüm bana duruban: – Əlvida olsun.

Necə taqət gətürəm de, bana nasih ögüt verür,
Deyəndə dilbərüm yola girübən: – Əlvida olsun.

Bana degüz fəraq ünün, eşidüb necə ölməyəm,
Desə dilbər səfər düşin, geyübən: – Əlvida olsun.

Əcəb budur eşidənə bənüm halumi firqətdən
Deyə ol bivəfa canum aluban: – Əlvida olsun.

Rəqibün tə'n ilə suzi bana ağudan acidur,
Desə ayrılduği dəmdə, gəlübən: – Əlvida olsun.

Dilərəm qəhr edüp alə canumi dilbər ol dəmdə,
Deyə lütf ilə halumi, soruben: – Əlvida olsun.

Necə can verməsün, degüz eşidüb, Gülşəni miskin,
Desə ağlarkən ol dilbər, gülübən: – Əlvida olsun.



* * *

299\. Bir türki-şuxü şəngin getməz həvasi başdan,
Sevdayə düşəli dil, ondağı gözü qaşdan.

Görən açalı dövran mehr ilə məhi hüsnün
Görmədi ancılayın döndükcə dövri başdan.

Bir göz görən camalun keçüb iki cahandan
Meyl etməz o yüzdən xublarə pəncü şeşdən.

Ağ yüzdə qarə xalın rövşən görən sözidir,
Kim gördi to'vəm olmuş rumi ilə həbəşdən.

Göz kibi mülki-hüsni seyr eyləyən könüldən
Ussı gedər görəndə ol hissi başda ğəşdən.

Həsrət yaşın axıdub hicrindən ol pərinün,
Vəslin umub nedəm, çün bitməz o quru yaşdan.

Dəlü kibi o yüzdən dağə düşüb nedim çün
Verməz nişanın anun bir kimsə dağü taşdan.

Ey Gülşəni, deməzəm adın o türki-şuxun,
Çün qorxaram qaxısa anun kibi yavaşdan.

* * *

300\. Vücudum bilməzəm nedür ədəmdən,
Ədəm olmaz vücudum çün qədəmdən.

Ədəm sora verür bəndən vücudə,
Dəmadəm dövr ilə döndükcə dəmdən.

Qənidən həqq vücudi ikisindən
Əgərçi ayru degül bişü kəmdən.

Vücudun yoğ mə'dudum nisbət
Olur mir'ati-rövşən cami-cəmdən.

Ədəmdür görsədən zahir vücudun
Nəfəsdən ney kimi zir ilə bəmdən.

Ədəm ayinədür rövşən vücudə
Ki, vəchün görür onda dəmbədəmdən.

Ədəmsiz Gülşəni bilməz vücudin,
Nədəndür nəfx olan ruhi-qədimdən.

* * *

301. Ey bibəsər, nəzər qıl vəchümə istivadən
Yumubənü gözüni ol dəmdə masivadən.

Eyni-ədəm görəməz ol vəchi aç gözüni,
Görüb bəsirət ilə qurtula gör əmadən.

İsmün qılub müsəmma, eyn et təxəllüf ilə,
Ta istivayi-təfsir etməyəsən həvadən.

Sayma həva həvəsdən əhsa deyüb, həq ismin,
Sə'y et təxəllüf isə əhsa ilə Xudadən.

Qəlbini ərşi-Rəhman görən bəyan edüb der
Təfsiri-istivayi anlayana səfadən.

Mö'min isən dilüni beyti-ilah edə gör,
Ta həqq girüb oyuna, sən çıxasın aradan.

Təfsiri-istivayi qəlbini ərş edən dəm
Eşidüm əgliyə göz təslim ilə rizadən.

Məhv ilə anla nədür nəhvini istivanun,
Sərf etmə bilməginə ömrün ağü qəradən.

Təfsiri-istivayi, elmi-ləduni eşit,
Sevdügi qulə tə'lim edər anı yaradan.

Ey Gülşəni, günəşdən faş etmə Rövşəninün
Sirrini saqla, qorxub, zəxmi-qədər, qəzadən.



* * *

302. Bən bu mülkə gəlmədən yerüm idi laməkan,
Birdən özgə yoğ idi ikidən onda nişan.

Elmə görə eyn idim, eyn ilə bir ğeyn idim,
Sadə sifət an idim sirri-xəfi binişan.

Elm ilə bulub vücud, olmuş idim bişühud,
Sirri-xəfi biümid ağü qəradan nihan.

Birlik ilə bir ikən yoğ idi bana məkan
Olmuş idim binişan lə sifət əz anü şan.

Eşq bəni buy ilə gətürəli hüsn ilə
Görməgə hər vəch ilə bəni dilərkən fəkan.

Birdən iki vəch ilə alıbənü ver mana,
Satü bazar etməgə açdı özündən dükan.

Yox əzəl ilə əbəd birlik elində əhəd,
Eşqə görə, ey vələd, sirr ikən oldum əyan.

Əvvəlü axır bana zahirü batin kimi
Birdən idi bir ilə yoğ ikən iki məkan.

Adəmi mə'ni sözün dərk edəməz, nə deyim,
Surət ilə edübən mə'ni yüzündən bəyan.

Rövşəninün sirrini faş edübən, Gülşəni,
Deyəməzəm kimsəyə qalə götürüb rəvan.

* * *

303. Çün bəqasi yox cəhanun, keç bu fani dardən,
Cifədir murdar dünya çək, əlün murdardən.

Yençübən yapma imarət qıluban tuli-əməl,
Can alur ücrət yerinə çün yapan me'maridən.

Dünyanun bali bəladur şirinübən yeməgil,
Niş olur nuşi çü anun hələ zəhri-mardən.

Təlx edər şirin söz anun dünya axır eyşini,
Sorun anun acılığın canı verən bazardən.

Bülbülün gülşəndə nalan olduği fəsli-bahar
Budur əgər qış gəlüb ayrılduğun gülzardən.

Dut qulağun əndəlib ilə həzarun sövtinə,
Çünki zari qıla yerlər gülşən içrə xardən.

Demə, yarım, aldanubən dünya savun kimsəyə,
Çünki yar olur sana ğəm, ancılayın yardən.

Umma dövrandan vəfayi, çün cəfa qılub dutər,
Kim bulupdur istiqamət dönüci-divardən?

Dəninün arif qatındə qədri yoxdur zərrəcə,
Arif isən tərkin urub keç zəni-miqdardən.

Aşina olmaz sana biganə dünya xəlqi, çün
Oluban biganə ana qılma yar əğyardən.

Əhd ilə peyman edübən dünya xəlqi söndürər
Qövlünə inanma, çün inkar edər iqrardən.

Dünyanın beyü şirasın issi bilmə özünə,
Sorub anın xəsri nədür can verən tüccardən.



Aldanubən zali-dəhrün əlinə verməyün könül
Qurtulamaz aldanan al nakiri-ğəddardən.

Dünya sevən kişinün çün ari yox namus ilə,
Yüz çevir görsən ovbaşi sanıyub biardən.

Gülşəniyə Rövşənidən özgə yoxdur çün murad,
Rövşən oldur gördügi çün zuyi nuri-nardən.

* * *

304. Gənci-xəfi eşq imiş sirr ilə sərdən nihan,
Bildim anı gün kimi olalı eynül-əyan.

Dövr ilə gedüb gələn, qeybi-şəhadət qılan,
Eşq özüdür can irən dövrə görə yövmü şan.

Seyr edərək eşq ilə uğradı yolum dilə,
Söylər isəm, kim bilə ol yar elindən nişan.

Eşq ilə dilbər görüb iki deməgil sorub,
Ta ki, düşün tək yorub tə'bir edələr rəvan.

Dilədügim dust eli gördün isə deyəli,
Hal ilə bildi, vəli, qal ilə qılma bəyan.

Dust elinə varana, candan yüzin görənə,
Könlüm verüb alana varmı zamanla məkan.

Cənnəti-Darüssəlam dust elidir qıl məqam,
Ta ki, Xəlifə İmam qıla səni müstəan.

Əvvəli-axır gözət, kəs sözün ancaq uzat,
Qaluni haldan düzət zahirü batin rəvan.

Sədrüni şərh eyləgil, qaluni tərh eyləgil,
Fe'lün olandan degil geyməyə qulun yalan.

"La" salub, "illa"yə gəl, nəf' ilə isbatun al,
Hu deyübən bəhrə dal, samət olubən bəsan.

Turilə bil sirrüni, Kə'bə qılub dirrüni,
Qomə qıla ğeyrüni, k'olə yəqindən güman.

Sirrül-ilahidən et, mə'i fi-l-llahə yet,
Dövr ilə billahə get, görsədübən huyi-şan.

Rövşənidən göz açan, Gülşəni, nisbət görür,
Aydın eli şahini qütb ilə sahib zəman.

* * *

305. Yüzünün bayramına qaşun imarətdür bu gün
Kim, çəmalun eydinə aydan bəşarətdür bu gün.

Hüsn elində xublara sultan olub Yusif cəmal,
Gör ki, aləm xəlqinə andan imarətdür bu gün.

Canuni qurban edübən Kə'bə kimi kuyini
Gəl təvaf etgil o dəmdən çün ziyarətdür bu gün.

Danla deyüb bu gündən fürsətün fövt etdügin
İş sanursan leyk ol işdən bətalətdür bu gün.

Verməyən nəqdi-rəvanın eşqünə candan bəha
Sevdi ol sevdayinün eyni-xəsarətdür bu gün.

Eşq ilə bey'ü şera qıl ixtiyarun var ikən,
Çünki ondan verüb almadan ticarətdür bu gün.

Yax imarət olanun gəncin eşq içrə rəvan,
Ol xərabə talib içün çün imarətdür bu gün.

Mehr ilə yüzin görəndür gün kimi rövşən nəzər,
Eyni-əyanə o gözdən çün bəsarətdür bu gün.



Zi mehri yerdən sadiğ imiş mehrün ilə yanmıyan,
Ol bürüdətlə qılanlar bihərarətdür bu gün.

Zahidün qüslündən olmaz su kimi ariedən,
Yunməyincə eşq ilə kondan təharətdür bu gün.

Qobdi hüsnündən qiyamət aləmə, ey sərvqədd,
Həşrü nəşrin xəlqün andan gör ibarətdür bu gün.

Gülşəninün Rövşənidən vəchini, ey nuri-eyn,
Eşq ilə candan görən sahib bəsarətdür bu gün.

* * *

306. Ey dil, ölürəm sevgilü aramım içün,
Candan sevilən dilbəri-xudkamın içün.

Mehr ilə görüb sevgilüni gecəvü gündüz,
Can verirəm sübh ilə ol şamun içün.

Başdan qapalı əqlüm mehri-gülə dəlalum,
Arammi qodun bəndə dilaramun içün?

Dərman nə olur dərdün içün de bana candan?
Ey dil ki, qılam dərdimə dərmanun içün.

Ey dil, nə dəvadur bana de, Gülşəni kimi
Can verməsinə mehr ilə əncamun içün?

Eşq ilə neçə bindürəsən könlümi, ey dil,
Neçə qıluram deyübən ol camun içün?

İçüb qanumi qanmadun, ey dil, gecə-gündüz,
Ol şürbi-müdamdan nə deyim camun içün?

Eşq ilə bəni qılalı rüsva yılmazam,
Qəsdindədir, ey can, dili-bədnamun içün.

Eşq ilə xəfi-sirrsən imsək biləlidən
Faş edəməz neydügin e'lamun içün.

Eşq ilə məhəbbət səni sevüb dedi lövlak,
Vəhdət dəmi kəsrət yoğ ikən namun içün.

Qeyb ilə şəhadət bir ikən vəsfünə nisbət
Göründü mükərrəm olub ikramun içün.

* * *

307. Nə deyüm yar ilə halum anlıya əğyarə bən,
Bir nəfəsdə olsa yüz can verdügimi yarə bən?

Çəkübən eşqün bəlasun mübtəla olan bilür,
Ta bəlalər çəkərəm dil verübən dildarə bən.

Keçmişəm canü cəhandan eşqə könül verəli,
Oluban Mənsuri eşqün gəlmişəm uş darə bən.

Gecələr sevdalı kimi yuxu girməz gözümə,
Qılalıdan bir nəzər ol nərgisi-bidarə bən.

Eşq ilə biçarəlixdən özgə yox çarə bənə,
Anun içün dilərəm biçarəlikdən çarə bən.

Eşq əlindən dəlü kimi düşübən dağlarə dən,
Necə gəzim bixud ikən oluban avarə bən?

Ey Rövşənidən gün kimi rövşən göz açan Gülşəni,
Bilür ol aydın bəsərdən baxmışam didarə bən.

* * *

308. İlahi, dilərəm bana mədəd səndən, mədəd səndən,
Olub zar inlərəm, bana mədəd səndən, mədəd səndən.

Qılanda bir nəfəs bəndən, verəm çün canımı təndən,
Ayırma, yarəbb, imandan, mədəd səndən, mədəd səndən.



Öləm çün qərilər görə, fərіştələr halum sora,
Dilərəm, yarəbb, uş çarə, mədəd səndən, mədəd səndən.

Öləndə qazısı xəlqün, bana hökm edəcək ədlün,
Dilərəm, ya ğəni, fəzlün, mədəd səndən, mədəd səndən.

Sənün fəzlünə ğayət yox, gunahimə nəhayət yox,
Nə vardır rəhmətündən çox, mədəd səndən, mədəd səndən.

Gecələr çıxarıb dana derəm, ey Gülşəni, sana,
Desən, yarəbbina, bana mədəd səndən, mədəd səndən.

* * *

309. Eşq bana surətin görsədəli mə'nidən,
Bildim o yüzdəndürür can ilə candan bədən.

Aləmə candan cəsəd andan imiş, ey vələd,
Bilür anun neydügin canını canan edən.

Təyyibi-zahir vücud eşqün imiş qıl şühud,
Kona sədəf kimidir qisməti-dürri-ədən.

Eşq ilə me'racini qıldı Həbibu-llah,
Eşq idi mahisifət Yunisi suda yüzən.

Eşq ilə doğru yola girməyən içün derəm,
Doğru sanub yolunu əql ilə əgri gedən.

Eşq ilə ləzzət nədür, zövq edənə sor, desün,
Bilür anun neydügin ləzzət ilə çün dadan.

Sirrin məhəbbət xəfi eşq əridir sormaguz,
Faş edəməz kimsə çün soranə anı nədən.

Eşq ərinin təxmirin eşidübən sanmaguz,
Toprağını yoğurub qüdrət əli bu sudan.

Rövşənidən eşq ilə mə'ni yüzin görməyən
Deyəməzəm, Gülşəni, surət olur mə'nidən.

* * *

310. Eşq bana bənsüzin verəli candan bədən,
Bildim anın dirligin nədir olan bibədən.

Sirri-məhəbbət xəfi dirlik imiş eşq ilə
Faş edəməz sirr sifət nədir anı eşidən.

Müşkili bihəll odur hikmət olan qüdrəti
Ğeyrət edib ğeyridən gizlədi çün yaradən.

Şeş cəhəti bicəhət eşq ilə görən bilür,
Eyni-əyani-vəchün neydügini aradən.

Vəhdət ilə kəsrətin bir görən içün degüz
Cüz'i-küllün oldur görən vəchini hər yörədən.

Mə'ni edən surətin yüz bini birdən görər
Azü çoq anı bilür eşqə məsəl törədən.

Üsuli-gəcbin sifət biri iki görəməz
Birlik içün kəndüdən görməsini tərk edən.

Tərki-həva qılmayan, şərinə dönüb rəvan,
Doğru yolu qoyuban əgriyə oldur gedən.

Rövşəninin tabişin Aydın elindən görən
Nisbət edüb günəşə biləmədi bənzədən.

Rövşəninün eşqidür zövqü məhəbbət dəmi,
Gülşəniyi tərcüman edübəni söylədən.



* * *

311. Eşq bana surətini görsədəli mə'nidən,
Seçəməzəm mə'ninün neydügini də'vidən.

Surəti-mə'ni qılan görər anun vəchini,
Bir oluban yüz bini güzin ilə görsədən.

Şahidü məşhur idi, görənə derəm buni,
Can gözidür açduğun birisi eyni-bədən.

Surətini mə'nidən görür imiş bicəhət,
Narini nəfsün rəvan nur ilə təbdil edən.

Cüzvü gülün vəchini həqqi-yeqindən görən
Bilür imiş neydügin can ilə canandən.

Bir imiş, iki degül, surətü-mə'niyi bil,
Əvvəlü axır təmam dövr ilə gəlüb gedən.

Ay ilə gündən dəxi aydın olan vəchini
Gülşənidən kim dürür Rövşənini fərq edən.

* * *

312. Biləməzəm necə dirilür kimsə, ey can, sənsüzin?
Öldürür həsrətlə cani, çünki hicran sənsüzin.

Bir nəfəs necə ayru düşsəm səndən, ey dilbər, nədən
Çəkdürür can ol nəfəsdən banə hirman sənsüzin?

Qəsr ilə gülşən sərayi neylərəm bən, ey sənəm,
Çün olur onlar xəmusi bana zindan sənsüzin.

Danlamayın şövqü zövqi görübən xəlqün nedim,
Qalub ol şövq ilə zövqə dəngü heyran sənsüzin.

Xari güldən seçməzəm ol neyləyüm bixud sifət,
Çün olupdur gül təninlə bana yeksan sənsüzin.

Başını tub eyləyən meydani-eşqə diləməz
Kimsə çalə həmlə qılub ana çövkan sənsüzin.

Rövşəni dərdinə verər Gülşəni axır nəfəs,
Çünki bulmaz can verübən dərdə dərman sənsüzin.

* * *

313. İstədügim buldum uş, bəndəyimiş bənsüzin,
Sən dəxi bir bula gör səndəkini sənsüzin.

Bildim axı bən neyəm, dirilüb ondan heyyəm,
Anun ilə çün şeyəm, şey degüləm ansuzun.

Görməyübən can yüzin, qılmadım anı güzin,
Olmadı həll müşkülüm hüccətü bürhansuzin.

Bilməzəm ansuz neyəm, zahiri bənsüz nədür?
Bulmasam ansuz vücud, qalmış idim cansuzin.

Canumə candan rəvan andan imiş bigüman,
Şək dutan ana qılur küfr ilə imansuzin.

Görməyən iman yüzin, küfrini qılur güzin,
Can verübən gedər ol dünyadan ayaqsuzin.

Yoluna andan vücud, qıldı məlayik sücud,
Baş qoyuban əmr ilə cümləsi dərmansuzin.

Şəh demədən bədənün kim dutisər əmrini,
Kimsə müt'i olmadı bəndəyə sultansuzin.

Rövşənidən vəchüni kim görisər, Gülşəni,
Şanə görə bicəhət surəti-rəhmansuzin.



* * *

314. Eşit nə derəm, sərxoş, ayılmadın ol meydən,
Sərməsti anun çünkim ayılmazmış heydən.

Həqdir huy ilə zikrüm, bu dəmdə eşidürsən,
Hu-hu dedugim oldur keçübənü hey-heydən.

Aşiqə nəva verən bu sövtü səda dərddi,
Dinlə nəfəsi-Rəhman dəmsüz çalınan neydən.

Yandurəli şövq odi könlümi nedəm, degüz,
Gündür bənüm canum, tutuşdur yer-göydən.

Bir dəm nəfəs urduğum hicran ilə bədtərdir,
Bin yıl bana, ey nasih, sərdisi dəmiridən.

Eşqə verəli özüm, andan açalı gözüm,
Cüz'-küll görürəm yüzüm baxduxda xəmuşdən.

Sin mülkinə girübən vəchün nəyimiş bax, gör,
Çin gözləyübən gəzmə Maçinə rəvan Reydən.

Ey Gülşəni, ay kimi pərvərdə görən vəchün
Bilür nə ziya imiş ol Rövşəniyə feydən.

* * *

315. Ayru degil istəgün canun kimi bədəndən,
Bulmaz anı istəyən qurtulma deyən təndən.

Görməyən anı bunda, görməz varubən anda,
İstə bula gör sən də itirüb özün andən.

Görmək diləsən anı, tərk eylə rəvan canı,
Andan açubən gözün bax ki, görəsən səndən.

Vəhdət diləyən bulmax, kəsrət olunan salsün,
Üryan oluban talib "ma"yilə "məni" məndən.

Neçün surətin bilən çün deməz ol vəchə,
Hali deyübən biqal sormun anı siz bəndən.

Birəngə dönüb rəngün, qoma qılanı rəngün,
Yaxub gözət ol dəmdə sən-bən nəyimiş ondən.

Anda varubən danla bulmazsan anı, cəhd et,
Bu gün bula gör ta kim bilə gedəsən bundən.

Üryan olubən dalğıl bu bəhrə rəvan olub,
Üşəd sədəqün keçün bu dürr ilə mərcandən.

Həqdən yenə, ey talib, dildən bula gör buni,
İstərsən anı bulmax dil mülkinə gir candən.

Dəyişər, oda desəm anı, içərüdən əvvəl verər,
İçərü desəm, dişrə dolu görünün andən.

Bəndən diləsəm görmək, sənsüz nurum deyər
Kim, görər anı bənsüzəm vəchə görə şandən.

Tanıyanmış vəchün şaninə görə həqqün,
Hər vəchə görə çünkim zahir görünür andən.

Görsəm yüzüni candan, der Gülşəniyəm, bax, gör,
Çün görən anı oldur, bilmən anı seyrindən.

* * *

316. Ey dil, verürəm cani sənə sevdügün içün,
Can verməgə ol sevdüginə urdugun içün.

Pərvanə kimi yanıyıram şəm'inə candan,
Görmədim anı deyübənü sorduğun içün.

Candan dəxi məxfi görübən sevgilü yüzin
Görmədim anı deyübəni sorduğun içün.

Döndərmədim, ey dil, görəli sevdügünə yüz,
Döndərmiyəm andan dögübən qovduğun içün.

Adın deməzəm, Gülşəniveşdir könülü dil,
Həsrətlə yanub yürəgüni avduğun içün.

* * *

317. Bənəm "dari-səlamət" talib içün,
Məhəbbətdən kəramət talib içün.

Dəvasız dərdinə eşqin giriftar
Məhəbbətdən əzamət talib içün.

Könül eşqə verübən gerü almaq
Olur dildən nədamət talib içün.

Könül mə'mur ikən eşq ilə yəqin
Kim olur eyni-şamət talib içün.

Qılubən bəndəlik bir şahi-eşqə,
Gərəkməzdir kəsalət talib içün.

Məhəbbətdir sual içün cəvabi
Qılan dildən vəkalət talib içün.

Həvayilə həvəsdir eşqə görə
Olan dildən zəlalət talib içün.

Könül həqdən dönüb batilə vermək
Olur dildən səfahət talib içün.

Təmə'dən izzət olan eşq ərinə
Çü zillətdir qənaət talib içün.

Könül eşqə verüb dirilə ölmək
Olur dildə əlamət talib içün.

Səlahü zöhdü təqvadır sanadım
Şəqavətsüz səadət talib içün.

Ədəm nisbət vücud ilə gərəkdir
Təcərrüddən məlakət talib içün.

Vücudin məhv edən eşq ilə bilür
Nə yüzdəndir həlakət talib içün.

Günəhdir bir nəfəs eşq ilə dəklik
Olub dildən fəraqət talib içün.

Sual etmək məhəlsüz eşq ərindən
Məqal olur həmaqət talib içün.

Sükut ilə cəvabın əhməqün den,
Nədür andan xəlaqət talib içün?

Təfərrüz kibidir eşq ilə təcrir
Olan dildən sənaət talib içün.

Ay ilə gün sifət Aydın elinə
Odur rövşən sənaət talib içün.

Məhəbbət elmidür eşqin bəyani
Ki, andandır cəhalət talib içün.

Həmişə, Gülşəni, şəh Rövşənidən
Məhəbbətdir şəfaət talib içün.

* * *

318. Bənəm şəm'inə cizginüb yanan pərvanəsi eşqün,
Vücudimdir ədəm nisbət ziyadən yanəsi eşqün.

Məhəbbətdən rəvan ilə düşüb şəm'inə yanmayan,
Olamaz Rövşəni nisbət nedim mərdanəsi eşqün.



Cəhandə Gülşəni biki məhəbbət dəlisin görən
Bilür məcnun sifət kimdir olan divanəsi eşqün.

Məhəbbətdən dəlürməyən bilinür, sor olən hali
Ki, əqlə aşinalıqdan olur biganəsi eşqün.

Girüb meyxanəyi-eşqə məhəbbət xəmrini içən
Biləməz məst olub andan nədür xümxanəsi eşqün.

İçən Cəm kibi camini məhəbbət xəmrini bilür,
Nə meydən dolar ol cami olub peymanəsi eşqün.

Xərabati-məhəbbətdən olan miskin çü xümmarə
Anunçün rindü ovbaş odur kaşanəsi eşqün.

Məhəbbətdən vücud ilə edəm söz dirilə bilür,
Nə dəmdən ol həyatilə olur cananəsi eşqün.

Nedim əqlin məqalini səmər nisbət bəyan etsən
Məhəbbətdən eşidən der budur üfdadəsi eşqün.

Nə dürür, Gülşəni, nəzmin sədəf nisbət bəyan içrə
Ki, der eşidən ol nəzmi çü dürdür danəsi eşqün.

Soraram, Gülşəni desün bana sirr, Rövşəni nisbət,
Məhəbbətdən kim olupdur hezar fərzanəsi eşqün.

* * *

319. Ayru degil istəgün canun kimi rəvandan,
Bulmaz anı istəyən qurtulmayan bu təndən.

Görmiyən anı bunda, görməz varubən anda,
İstə bula görsən də itirüb özün andan.

Görmək diləsən anı, tərk eylə rəvan canı,
Andan açubən gözün vəchün görə gör səndən.

Vəhdət diləyən həqdən kəsrət olanın salar,
Üryan oluban sadə “ma”ilə “məni” məndən.

Birəngə dönüb rəngin, qomə qala neyrəngün,
Bax görübən ol dəmdə “sən”, “bən” nəyimiş andan.

Anda varubən dinlə, bulmazsan anı, eşit,
Bu gün bula gör ta kim bilə gedəsən bəndən.

Dil yolu varar doğru həqdən yenə, ey talib,
Həqq istər isən bu dəm dil bulana gir candan.

Dişrədə desəm anı yiçərüdən ün verər,
İçərü desəm dişrə dolu görnür andən.

Bəndən diləsəm görmək, sənsüz görünür derəm,
Kim görər anı bənsüz, buminə görə şandən.

Həqdir bu söz, ey həmdəm, ansuz kim olur bir dəm,
Səndən sana yaxındır həm təndəki can andan.

Nəfsin tanıyan bildi həqqi, nəyisə mütləq,
Biqeyd olub ovsadi nəqinə görə qandan.

Eşit bu sözi, həqdir canunə verər canı
Kim çəktü nəfəs ansuz can yerinə bu təndən.

Canun tənə mehmandur xar etmə əziz ikən,
Utanmamısan həqdən, könlündəki mehmandan.

Aninə görə həqqün vəchüni tanı, nədir,
Zahir görünir, çünkim vəchün sənə ol şandan.

Çün görən anı oldur, pəs bən nəyəm aradə,
Bənsüz görən ol vəchi den banə nədir andan.

Çün Rövşəniyi görsəm der Gülşəniyəm, bax gör,
Ər Gülşəniyə baxəm, anı görərəm bəndən.



* * *

320. Sataşdum, eşqə derəm, ey pəriru,
Nə yüzdən sirri-xəfisin gözə gizlu?

Biləməz kimsə sənün neydügini,
Əgərçi tolu səndən yaşü quru.

İki aləmdə yox sənsiz nümayiş,
Xəla bulunmayub sənünlə tolu.

Bulunmaz sirr əmanət kimi həqdən,
Sən imişsən möhübbətdən dəmi-hu.

Səni istər könüldən can verübən
Məhəbbətdən yenən dəm kiçi-ulu.

Sevübən sevdürərsən səni sana,
Möhübbətdən bilinməz səndəki xu.

Səkiz cənnət sənün vəchündən özgə
Möhübbətdən nədür sevgilü meyxu.

Sənin yüzin görəni yandurəməz,
Behişt olur anunçün yeddi tamu.

Dəmi-qüdrətdən adım hikməti-həqq,
Bəni bil Rövşənidən Gülşəni xu.

Bənəm ruhül-qüdüs, namusi-əkbər,
Məhəbbət qoxusundan ğaliyəbu.

* * *

321. Könül eşqün əlindən parə-parə
Olupdur, bulamazam ana çarə.

Önülməz zəxmi var eşqün sanadım,
Olalı könlüm ol zəxm ilə yarə.

Təzələr zəxmi-eşqə mərhəm urmaq,
Dönüb bikarlığ edən hərzəkarə.

Nedim zəxmini eşqün çün bəlürməz
Ki, ondan görsədəm yarami yarə.

Dönüb Mənsurə eşqün parəsini
Yedim asılmadan bənd ilə darə.

İlan kimi çu sancər könlümü eşq,
Dönübəm yarədən ağulu marə.

Yeyüp zəxmini eşqün Rövşənidən,
Verür can Gülşəni didarə, yarə.

* * *

322. Boyun sərvin görən bustan içində
Əcəb nəxli rəvan, der, can içində.

Qədündür əhsəni təqvimə məzhər,
Anılan vəhy ilə Qur'an içində.

Əcəblər müshəfi-hüsnünə baxan
Qaşun hərfin görüp Qur'an içində.

Görən bayram edər ay kimi yüzün
Qılur canın fəda qurban içində.

Baxan vəchünə, der, sultani-hüsnün
Bu yüzdür, ay kimi dövran içində.



Ay ilə gün sifət yüzüni görən
Başuna çizginür giryan içində.

Girən meydani-eşqə ki, bulur baş
Açanda çalınur çövqan içində.

Muradi Gülşəninün Rövşənidən
Günəşdən bəllidür ə'yan içində.

* * *

323. Yüzündür yazılan Qur'an içində,
Qaşun hərfi kimi fürqan içində.

Açalı mehr ilə aləm gözüni,
Nəzirün görmədi dövran içində.

Görənlər mehr ilə, ey məh, cəmalun,
Ay ilə gün sanur seyran içində.

Dilərəm bir dəm içrə bin nəzərdən
Görəm vəchün sənün hər şan içində.

Nə var vəchündən özgə ta görənlər
Cəhan xəlqi, çu oldi an içində.

Sənün vəchün ziyasıdır görünən
Günəş kimi əyan insan içində.

Dedi həq sevübən vəchüni lövlak,
Məhəbbət gizlüyikən kan içində.

Məvəddət kənzi səndən zahir oldu,
Çü sənsən sevgilü ə'yan içində.

Görən eyn əl-yə'qindən vəchüni der:
– Şəhadətdir bu yüz iman içində.

Sənün vəchün görənlər Rövşənidən
Bilür iman nədür itqan içində.

Görənlər Rövşənidən Gülşənini
Olur külli lisan irfan içində.

* * *

324. Düşüb Məcnun kibi sevdayi-eşqə,
Könül verdüm rəvandan rayi-eşqə.

Dəvasız dərd imiş dərmani nedəm,
Sınadum mərhəm edüb dayi-eşqə.

"Ənəl-həqq" yerinə deyüb "ənəl-eşq",
Sataşdum dar ilə qovğayi-eşqə.

Dilün kəs tə'n ilə tənz etmə məqsəd,
Görüp bixud sifət şeydayi-eşqə.

Dönüb şeytanə, münkir, olma bədnam
Uzadub dilüni rüsvayi-eşqə.

Gözün yum iki aləmdən, açub bax
Nə yüzdür görünən binayi-eşqə.

Unut, cəhl ilə elmün tərkin, urğıl,
İrişmək diləsən danayi-eşqə.

İki aləmdə sultanlığ dilərsən?
Qul olğıl, Gülşəni, mövlayi-eşqə.

* * *

325. Verəldən başumi sevdayi-eşqə,
Ulaşdum ğülğüli-qovğayi-eşqə.

Dəva istər ikən dərman yerinə
İrişdüm dərdi-dildən dayi-eşqə.



Görən Məcnunə nisbət halimi der
– Baxun, bədnam olan rüsvayi-eşqə.

Nə sevdadur başumda biləməzəm
Ki, ondan dönmüşəm şeydayi-eşqə.

Nedim biləməzəm ray ilə tədbir
Xirəd istəyübən rayi-eşqə.

Bana müşkil olan halsız nədür hal
Soruban bilmədür ənayi-eşqə.

Nədür isbat olan nəf ilə bilsəm
Vücud ilə ədəmdən "la"yi-eşqə.

Nə yüzdən olmuşam Məcnuni dövrin,
Məhəbbət məzhəri Leylayi-eşqə?!

Məhəbbətdən nə soram gəncinisbət
Xəfi qüdrət kimi alayi-eşqə.

Bir ikən iki yüzdən görünəli
Bilindi neydügim binayi-eşqə.

Qılan tey "la"vü "illa"idən məratib
Bilür hudən nəyəm heyhayi-eşqə.

Məhəbbət Qafinə simurğ nisbət
Girən uğrar imiş lanayi-eşqə.

Vücudini ədəmdən edən imiş,
İrişən bicəhət məvayi-eşqə.

İrax-yaxın yoğ imiş vüs'ət ilə
Olan bişeş cəhət səhrayi-eşqə.

Nedim, ey Gülşəni, vəsf edəməzəm
Deyübən Rövşəni mövlayi-eşqə.

* * *

326. Bəha dedüm çəküb möhnət məhəbbətdən bəla eşqə,
Bilür möhnət nədür ondan olanlar mübtəla eşqə.

Məhəbbət möhnətin çəkən bəla neydügini bilür,
Anun içün bəladan der qəzadur iqtiza eşqə.

Dönüb Əyyubə möhnətdən bəlasın çəkməyən eşqün,
Çəküb ondan bəla möhnət nədür bilməz rza eşqə.

Əzəldən qisməti eşqün möhübbətdən bəlayimiş,
Qədir guya o qismətdən olanlar müqtəza eşqə.

Məhəbbətdən bəlasına giriftar olalı eşqün,
Sorana dərdü möhnətdən qəza derəm, qəza eşqə.

Mühali-əqli-hal imiş möhübbətdən dirilənə
Xirədlə narəva olan olub ondan rəva eşqə.

Günah demən xəta nisbət məhəbbət gərdinə görüb
Çu əql ilə səvab olan xəta olur əta eşqə.

Ğənidür cud ilə aşiq möhübbət fərqinə nisbət
Anunçün cüzvü küll olur məvəddətdən gəda eşqə.

Məhəbbət möhnətin çəküp bəla zövqini dadmayan
Biləməz kim, nə ləzzətdən dadanlar der nəva eşqə.

Şəhidi-eşq olanlar der məhəbbətdən ğəza içrə
Giriftari-bəla ikən dəvasız gəl bəla eşqə.

Bəladur, Gülşəni, möhnət möhübbət Rövşəni səndən
Qılur pərvər rəvanumi, edübən mübtəla eşqə.



* * *

327. Könül qul olalı sultani-eşqə,
Dilər canın verə qurbani-eşqə.

Başın tup eyləyüb meydanə girən
Çalınmasun dilər çövkani-eşqə.

Necə bir ğərq edə tiflini eynün,
Görəndən seyl olan tufani-eşqə.

Bulut yer yüzinə qətra tökən dəm,
Dönər seyl axıdan giryani-eşqə.

Könüldən geyən qəza vase' bulunmaz
Girübən seyr içün cövlani-eşqə.

Bilinməz mazi müstəqbəllə hali
Anunçun qalə sığmaz ani eşqə.

Həvayilə həvəs şanin edən tərk
İrir şuriş sınadum şani-eşqə.

Görənlər Gülşənidən Rövşəniyi
İrişsə danmidür ürfani-eşqə.

* * *

328. Nədür dünya, degüz, ğəflətdən özgə?
Həvayilə həvəsdən, bütdən özgə?

Nə var bu məzrə içində bana den
Əkilən tüxm içün alətdən özgə?

Açub qüdrət gözün çüz'-küll cəhanda,
Degüz nədir olan hikmətdən özgə?

Keçürmə qəflət ilən ömrün, eşit
Ki, üsyandur əkin taətdən özgə.

Qılub cəhl ilə ta'ət zay' etmə,
Çü zaydür əmək heyrətdən özgə.

Dedi xeyrül-bəşər dünyayə saət,
Nədür dünya den ol saətdən özgə?

Soranə dünya nədür, buni derəm:
Nə bilüm neydügin heyrətdən özgə?

Səni həqdən irağ edənə degil:
Çu yoxdur dünya ol firqətdən özgə.

Sorana dünya nədür amm ilə xass
Cəvabum yox, nedəm, gər bütdən özgə.

Ədəmdür ki, vücudi bu cəhanun
Bilübən nedürəm qüdrətdən özgə.

Bilür bu məzdə'ün hasili nədür
Görənlər mə'nisin surətdən özgə.

Budur yelə dönən fani cəhanun
İrişməz hasili nikbətdən özgə.

Sorаram Gülşəniyə Rövşənidən:
– Bana hasil nədür qürbətdən özgə?

* * *

329. Nədür sirri-əmanət dildən özgə,
O halsız üqdəyi müşkildən özgə?!

Nəfəxtü sirridür faş olmaz ol dil,
Anı bil sirr ələn dil güldən özgə.

Dilin dilin bilən anlar nə derəm,
Çü ondan dil olur qal-qildən özgə.



Kinayətdür nedəm dildən dil olan,
Bilinməz dil dilidir eldən özgə.

Dilün dövrani var sirdən cəhansız
Ay ilə sınanan yıldən özgə.

Həva sanmın həvəsdən aləmini,
Dilün çün aləmi var yeldən özgə.

Həzaran şəhr var bəhr ilə bərsiz,
Dilün Misrilə Şam dilindən özgə.

Müqəddəsdür dilün ərzi-hərəmdən
Bulunmaz ol zəmində haldən özgə.

Nedəm sirdür deməzəm Gülşəni faş,
Nedər şəh Rövşəni dildən özgə.

* * *

330. Yüzün görmək dilərəm dönə-dönə,
Verüb canumi anə dönə-dönə.

Neçə bir can çəkəm şövqinlə, ey dil,
Yüzini görmək içün dönə-dönə.

Alamaz kimsə təndən cani nedəm,
Sana can verməyincə dönə-dönə.

Nedəm eşqün əlindən biləməzəm,
Alub könlüm, dilər can dönə-dönə.

Könül eşqə uyub tərk etdi bəni,
Soraram nerdə leykən dönə-dönə?

Əcəl bir can alur, amma nedim, eşq
Dilər bir yerinə yüz dönə-dönə.

– Dilərəm Rövşənini, Gülşəni, der: –
Görəm Aydın elində dönə-dönə.

* * *

331. Həqq rizasın dilər isən, gəl xidmət et ərənlərə,
Könül pasın silər isən, gəl xidmət et ərənlərə.

Dutğıl bir ərin ətegin, kilətə səni Həqqə degin,
Sevər isən işün yegin, gəl xidmət et ərənlərə.

Ərənlərə xidmət qılan zilli olur Həqqin, inan,
Odur həqqə sultan olan, gəl xidmət et ərənlərə.

Ayru degül həqdən ərən, bulur həqi könül soran,
Həqdəndürür bu söz inan, gəl xidmət et ərənlərə.

Həqq ərənə bənüm dedi, sevgisi ilə gizlədi,
Ondan mərizət söylədi, gəl xidmət et ərənlərə.

Ərən əli iş dutmadı, həqsiz görüp eşitmədi,
Həqdən ayru suz etmədi, gəl xidmət et ərənlərə.

Eşqün yüzin ərən görər, könül verüb candan sevər,
Dil verməgə ana ivər, gəl xidmət et ərənlərə.

Görməz bu göz ərənləri, çün cani-candur tənləri,
Görmək dilərsən anları, gəl xidmət et ərənlərə.

Aç can ilə könül gözün, bax, gör nədür ərən yüzün,
Həqq görüp ondan sənsüzin, gəl xidmət et ərənlərə.

Surət degül ərən yüzi, mə'nidən aç ana gözi,
Yüzin görüp gəsgil sözün, gəl xidmət et ərənlərə.

Ərənlərin halın bəyan eyləyəməz nedim zəban,
Olmaq içün küllə misal, gəl xidmət et ərənlərə.

Eşqün yüzini, Gülşəni, Rövşənidən görgil tanı,
Görmək dilən isən anı, gəl xidmət et ərənlərə.



* * *

332. Eşq ilə bilişəli yad olmuşam özümə,
Əql ilə dəq dutmagüz anlamadan sözümə.

Biləməzəm neydügüm, nə vəch ilə şeydügüm,
Dirilübən seydü kəm baxubanü özümə.

Eşq ilə açılalı tazə gülüstan sifət
Kim, məhəbbətdən deməgüz, soldi rəvan gözümə.

Talib isən eşidüp pəndüm ilə qıl əməl,
Sür yüzüni toprağə, baş qoyuban izümə.

Dilər isən, dil gözün rövşən aça gül sifət,
Kəhli-cəvahir degil rövşənidən tozumə.

Eşq ilə əqlüm ədəm, qılalıdan dəmbədəm,
Gələməzəm, den, nedəm fikr ilə kənduzimə.

Heyrətə salan bəni budur eşidün anı,
Bir görürəm can təni ikiyikən gözümə.

Eşq ilə əqlini bir hər [ki] görür, buni der:
İki demək nə gəzür eyd ilə novruzumə.

Rövşənidən qıl kimin Aydın elinün günin
Gözün açub Gülşəni candakı yılduzimə.

* * *

333. Aldanub inanma, ey dil, münkirün iqrarinə,
Çün müzürrdür ol yalançı gercəkün inkarinə.

Gerçəgəm der, söyləyüp xəlqün yalani əksəri
Verübən ondan rəvaci satuvü bazarinə.

Dünyadan iqbal umandur xud səadətsüz şəqi,
Bulmadı iqbal düşərin müdbərün idbarinə.

Şər deyübən yemə balini bəlalü dünyanun
Dəgməz anun bali çünkim arusinun xarinə.

Çifə dedi dünyaya peyğəmbər, ey talib, eşit,
Səg degilsən düşmə anun cifədən murdarinə.

Arif içün rüsva qılubən əhli-dünya özüni
Xar olur zillətlə, baxun xəlqinün biarinə.

İt kibi murdari yeyən tahir olmaz suyilə,
Tövbəsüz ol cifə təndən sanmagüz [ki] arinə.

Çün cəfadur sana dünyanun vəfasi aqibət
Pəs yoğa say bu dəm anı baxmayuban varinə.

Saqın mö'mindür, eşitdün cənnətini kafurun,
Yanma kafər kimi anun mö'minsən narinə.

Danla denüb istənən gün bu gün imiş anladım,
Anun içün qoymazam bən bu günimi yarinə.

Tərk edüb vari-cəhani olmayan Mənsuri-eşq,
Girübən meydani-eşqə asmaz özin darinə.

*Keçməyən iki cəhandan eşq ilə arif degil,*
Anun içün yox vüqufi mə'rifət əsrarinə.

Dünyada gül yox tikənsüz, əl uzatma dərməgə
Dəgməz andan qoxu çün kim ələ batan xarinə.

Dil bəri qılub cəhandan eşqə verən könlüni
Gülşəni kimi irişür Rövşəni didarinə.



* * *

334. Vay ana kim, ucundan düşə dünya bəndinə,
Aldanubən zali-dəhrün mal ilə peyvəndinə.

Şirniyübən yemə balini bəladur dünyanun,
Pərvər edər çünki qatub zəhrini gülqəndinə.

Müşkil işdür, dünya əqdin dildən ursan bəndünə
Tərki-həldür, çünki ondan bağlanan dilbəndinə.

Ölmədən dutun qərasın dünyaya can verənün,
Bu səbəbdən ağlar oldum görübən xursəndinə.

Al edübən aldar imiş zali-dünya çoxları
Al ilə ondan irişməz kimsə anun fəndinə.

Neçələr əqlin verübən sevdai-dünyadan
Dəng olup ondan xiyalun düşdi çünü çəndinə.

Eşq ilə İskəndər olup qıl həvaya Yəcucini,
Səd çəküp Yəcucü divün əql ilə derbəndinə.

Demə dana dünyaya, elmin bilici görübən
Əhməqü nadan deyüb ol cahilün gülqəndinə.

Əhdü peyman etmə xəlqə dönməyilən şərt edüb,
İnanubən hər yalançı kövdənün sövgəndinə.

Keçdi ömrün istəgilən xəlqi aləmdən, nedəm,
Uğramadum Gülşənivəş Rövşəni manəndinə.

* * *

335. Günəş kimi yüzün münkir gözün açub xaçan görə,
Qara gündür çü aydınlıx anadan doğmacə korə.

Məhəbbətdən göz açubən görəndə şövq ilə vəchün
Nə deyüm zövqini onun, gəlüb gər talibi sorə.

Bana lütf ilə qəhründən baxalı nurü nar ilə
Qədün kimi şəcərdən uş göründi varmadan Turə.

Sana səndən yaxın ikən bula gör istəgün bu gün
Ki, danlaya qosan anı, bulamazsan düşüb durə.

Dirilə ölənə qopar qiyamət həşrü nəşr ilə,
Qulağ ur ol qiyamətdən bu dəm nəfx olunan surə.

Bu gün yuxudan oyanub görə gör danlanı hanun
Vay ana kim, bu yuxudan düşi sanub anı yorə.

Cəmalun düş kimi xəlqə ğələt tə'bir edər yoran
Gözün kimi oyanmayan o yüzdən düş xaçan yorə?

Dəmadəm Rövşəni kimi ziyadan dolmasa könlüm,
Necə döndərəm ay nisbət yüzümi, Gülşəni, nurə?

* * *

336. Yanmıyan Musa kibi "anəstü nar"un narinə
Görməyübən bu gün təcəlli qoydu anı yarinə.

Yanubən Turində eşqün mehr ilə tağlanmıyan
Açamaz gün kimi gözün vəchünün ənvarinə.

Ayü gün mir'atə dönüb bil nə yüzdən cizginür,
Duş olam deyü o yüzdən dilbərün didarinə.



Yox məlahətdə şəbihi, həm səbahətdə nəzir,
Mehrü məhdən özgə takim bənzədəm rüxsarinə.

Görmədi hüsnün nəzirin kimsə, ey sahib-cəmal,
Kim düşə Yusif kimi ol Misirin bazarinə.

Qomayan əvvəl qədəm eşqün yolunda başinə
Dönübən Mənsurə ondan asmadılar darinə.

Münkirün qövli yalandur halinə eşq əhlinün
Ğürrə olma sidqün ilə kazibün iqrarinə.

Gülşəni-hüsnün deyər kim, behişti-can budur,
Göz yumub açmaz o yüzdən cənnətün gülzarinə.

Gül tikəndən xali olmaz, duygil nuş içün,
Gül dilərsən, qatlan ondan sancılan dil xarinə.

Görübən eydü rəvanun, ey pəriçöhrə, rəvan
Necə qurban olmasun dil dilrüba dildarinə.

Heyrəti-eşq ilə özün itirübən bulmadun,
Qulağ urma eşq ərinün rəmz ilə əsrarinə.

Namü namus istəyənlər eşq ilə bədnam olur,
Ah edər çün aqil ondan baxman onun arinə.

Tə'n edər halum görənlər qal ilə, nasih, bu dəm
K'olubən bikari əqlün əhli-eşqin karinə.

Bağlama könül görübən dünyanun iqbalini
Bax ol iqbalə irənün dövri-idbarinə.

Hali-eşqi qalə gəlmə, saxla dildən kətm edüb,
Rövşənidən Gülşəniveş duruşub izharinə.

* * *

337. Ey dil, qoyuban yaruni, əğyarə yapışmə,
Gül tərkin urup bilməyübən xarə yapışmə.

Şəm'ə dönübən şövq ilə yan dilbərə qarşu,
Ey dil, görübən nuri-rəvan narə yapışmə.

Tərk eylə fəna darini, gər bəqa dilərsən,
Könül verübən alma fəna, darə yapışmə.

Mənsur olubаn eşq ilə bil daruni nədür,
Varun oyikən mehr ilə bu darə yapışmə.

Çün cifə dedi dünyaya həq sevdügi məhbub,
Talib olubаn o səgi-murdarə yapışmə.

Bil qiymətidür bəhri-lədun dürrini-safi
Anı qoyuban lə'ləyi-şəhvarə yapışmə.

Eşq ilə dedün çünki bəli, dönmə bəladən,
İqrarüni tərk eyləyüb, inkarə yapışmə.

Ağ ilə qəra tərkin uran əbcədin oqur,
Eşqin eşidüb məcmə'yi-muxtarə yapışmə.

Təcrid ilə bul ruhi-qüdüs zindəsin, ey dil,
Hər fərd ilə tərsa kimi zünnarə yapışmə.

Kəsb eylə bu gün axirətün danlayə qoyub,
Şüğlü əməlü dünyayi-ğəddarə yapışmə.

Şeytan kimi yoluni uran nəfsi-həvadə
Aldar çü səni, məkr ilə məkkarə yapışmə.

Eşq ilə yola girübənü şər'i-sirat et,
Asan deyübən əql ilə düşvarə yapışmə.

Tərk eylə derəm Gülşəniyə eşq ilə arın,
Bədnam olubаn aqilü biarə yapışmə.



* * *

338. Düşübən qərq olmayanlar eşqünün dəryasına,
Bərdə qalub bəhrə girməz dürrinün almasinə.

Rəşk edər görəndə gözüm yüzini könlüm, nedəm,
Girəməzəm çün könüllə gözümün arasinə.

Can ilə nəqdi-rəvandan özgə nəm var ki, verəm
Al ilə almağ diləsə gözlərin alasinə.

Bilməzəm uyur-oyanux olduğum heyrət budur,
Verəli eşq ilə könlüm fikrinün sevdasınə.

Kim bilür könlüm xəyalın ,fikrün ilə, ey pəri,
Kim nə vəch ilə düşübən zikrünün sevdasinə.

Görübən biari-eşqi əql ilə ar etmə kim,
Tərk edüp eşqi ki, arun düşüsən rüsvasinə.

Rövşəni qal ilə verüp Gülşəni halini, der,
Şövq ilə baş vermişəm uş eşqinün ğovğasinə.

* * *

339. Eşidüb, ey cəvan, pəndüm, səxin, pirünə naz etmə,
Dilərsən nazənin olmax, duruş, tərki-niyaz etmə.

Sevübən sevdür özüni möhübbət artırup pirə,
Çalışup eşq ilə sevgün çox edübənü naz etmə.

Sana əmr edicək pirün, demə nə dönmədin anı
Mürid ikən mərid olub ənа doluci saz etmə.

Bilüb kərkəsligin nəfsün əmək çəkdürübən pirə,
Açub baluni seyd içün qara qarğanı baz etmə.

Əgərçi Məsih suri yox bu ümmət içrə, ey talib,
Özüni məsxi-mə'nidən, səxin, meymun güdaz etmə.

Uzatma qalü qiluni, dilün kəs tə'nədən pirə,
O qaldən qət' içün dilə sükutdan özgə kar etmə.

Günəşdən faş edüp xəlqə deyəndən Rövşəni sirrin
Bana der, Gülşəni, andan ikindən gəşti-zar etmə.

* * *

340. Dükənməz dərd imiş eşqün, nəhayət yox bəlasinə,
Dəvasuz dərd imiş bildüm nəhayət, mübtəlasinə.

Dönüb Əyyubə möhnətdən, dəvasuz dərdimi çəküb,
Sorana dərdi-bidərman derəm eşqün dəvasinə.

Alınca bir nəfəs yüz can cəfadən verməyən eşqə,
Nə deyəm anlamaz anun bana olan cəfasinə.

Bəlayi-eşq başuma dolu kimi yağar nedim?
Deməz içi yanub kimsə bu miskinin xətasinə.

Bana bir dəmdə yüz zəxmi yetər eşqün, görüb anı,
Neçün tə'yinlə tuz əgər xəlayiqdən yərasinə?

Bənümlə eşq arasına girirsən, nasih, eşitgil,
Girən çün iyüyüb çıxar ətü dırnax arasinə.

Cəhan Misrində eşqün məzadın eşidən verər
Möhübbət neqdini candan bənim kibi bəhasinə.

Mərizi-eşqün olmadan bulamaz söhbətin andan,
Anunçün xəstədür canum ləbün camü şəfasinə.

Yüzün mehr ilə məh kibi görən, ey Rövşəni, bilür
Ki, görüb Gülşəni anı, nə can verər liqasinə.



* * *

341. Eşit candan sözüm eşqün dilincə,
Könül, dustə gedirəm, gəl biləmcə.
Düşüb eşqün yoluna bən ölüncə,
Könül, dustə gedirəm, gəl biləmcə.

Nedəm bənlik bəni yoldan qoyupdur,
Oyalandurubani aldayupdur.
Salub bənlik xaçan buni deyüpdür,
Könül, dustə gedirəm, gəl biləmcə.

Girəldən yola gedüpdür qərarum,
Təhəmmül qoymayuban intizarum.
Anunçün tərk edərəm ta ki varum,
Könül, dustə gedirəm, gəl biləmcə.

Eşit aşiq nədür eşqün dilindən,
Çu həll edər o dil dil müşkilindən.
Budur söz, çıxmadan eşqün yolundan
Könül, dustə gedirəm, gəl biləmcə.

Eşitdüm ğeyrətündən ğeyrinə yar,
Diləməz görsədə ğeyrətlə didar.
Salub ğeyr olanun andan ana var,
Könül, dustə gedirəm, gəl biləmcə.

Düşüb Aydın eli yoluna candan
Dilərəm qurtulam Tirə vətəndən.
Qaçub yolum uruci "ma"vü "mən"dən
Könül, dustə gedirəm, gəl biləmcə.

Günəşdən bəxtlü rövşən məqamə,
Ziyadən aydın ol Darüs-səlamə,
Ol ay aydınlığı bədrüt-təmamə
Könül, dustə gedirəm, gəl biləmcə.

Görəldən bəni bən suzi-rəvandan,
İtirüb bulmazam özümü andan,
Eşidürəm buni bən bu sözümdən:
Könül, dustə gedirəm, gəl biləmcə.

Bana heyrət verən bənsüz rəvandur,
Bədən kim der ana, çün canə candur,
Əyan dedikləri sirri-nihandır,
Könül, dustə gedirəm, gəl biləmcə.

Açan gözünü candan görər ani,
Bu göz görməz çu kordur ol rəvani,
Derəm görmək içün ol cani-cani,
Könül, dustə gedirəm, gəl biləmcə.

Eşit, ey Gülşəni, candan sözümi,
Açalı Rövşəni andan gözümi,
Görüb derəm rəvandan bən özümi,
Könül, dustə gedirəm, gəl biləmcə.

* * *

342. Aşiq xaçan bəlayə düşübən mə'lul olə,
Çün səbr edüb bəlasına eşqün həmul olə.

Eşqün yolunda kim ki, bəladan qaçar, bilün,
Talib degil ki, mürşidi-həqdən qəbul olə.

Lütf ilə qəhri-dilbəri bir bilməyən nedim
Kim qəhr edəndə dilbəri andan nəkul olə.

Naqis qılub kəmalə irişməz, yolun irməz
Övrət kimi ki rəhbəri naqis üqul olə.

Götür bəlayi-eşqi əmanət bilüb rəvan,
Gərçi götürmədin anı adun cəhul olə.

Tövhidə irişüb bələnüb Gülşənisifət
Rövşən nədür, bu mə'niyi sanma cəlul olə.



* * *

343. Eşqün məratibinə sanma nəhayət olə,
Əvvəldən axır anun şaninə qayət olə.

Yox əvvəl-axır anın zahir məqami içün,
Ta qeyb çün şəhadət andan bidayət olə.

Mə'ni gözilə eşqi bikeyfdir görənlər,
Keyf ilə surət andan vahü rəvayət olə.

Batin gözinə zahir mə'ni yüzi görənlər
Ol eyni-surət içün dini şəhadət olə.

Görmək yüzini eşqün neçün vücudə görə
Surət kimi ədəmdən eyni-kəramət olə.

Eşqün qiyamətini dirilmə ölənə sor
Şayəd qiyamət ona bu dəm bu saət olə.

Eşqün bəyaninə yox, ey Gülşəni, nəhayət,
Demə ki, qalun andan halə kifayət olə.

* * *

344. Qış gedib, aləm gülüstanü bəhar oldi yenə,
Dövri-bülbül gəldi, zağun rövnəği xar oldi yenə.

Açılubən yer yüzini dutdi güli-günəşsifət,
Qızarubən kuhü səhra laləzar oldi yenə.

Geyübən ziynətlü xəl'ət zali-dünya yenidən,
No ərusə dönübən nəqşü nigar oldi yenə.

Gül kimi nərgis əlindən camını sunar müdam,
Baxub ol sərxoş liqadan göz xumar oldi yenə.

Dövrə girüb şeyxi şəhrün, rində dönüb cam içən
Talib olan anı görüb badəxar oldi yenə.

Gül kimi camun əlündən qomayub içgil müdam,
Cədinlə məhqi cami-gülün aşikar oldi yenə.

Görsədəli suzi-dildən lalə dağın aşiqə
Göndərüb aşiq rəvanın daği-nar oldi yenə.

Görsədər gülşəndə gül, çün bizimçün cam şərab,
Qoma əldən cami, çünkim butimar oldi yenə.

İçəli gülşəndən camin novbəhari hüsnünün
Qızarub, gülün yanaği gülüzar oldi yenə.

Saqiya, xəmri-müdami sun ləbündən cam ilə,
Camun içün Cəm kimi çün tacdar oldi yenə.

İxtiyarun sana verən, ey canumdan sevgilü,
Taleyi məs'ud oluban bəxtiyar oldi yenə.

Xızr xəsra olmuş ikən bərkü barından bəri
Abi-heyvandan dirilüb tazə bar oldi yenə.

Cənnəti-hüsnün görəldən, ey gülüstani-İrəm,
Gülşəni zari bir ikən bin hezar oldi yenə.

* * *

345. Tükətməz elmi var eşqün nəhayətsüz bəyan ilə,
Nə əvvəl var, nə xud axır ana şani-cəvan ilə.

Nədür zahir ki, batindən olur hər vəch ilə məxfi,
Çü oldur sirr ki, faş olmaz məhəbbətdən əyan ilə.

İki aləmdə birdəndir anun şəni nəhayətsüz,
Edər dövran durmadan cəhani-cavidan ilə.

Məhəbbət aləmi-eşqi bəyan edər, nə andandır,
Olan dövranini daim məkansız la zəman ilə.



Əzəlsüz biəbəd eşqün xəfi sirrdən zühuri var
Ki faş olmaz nə andandır bəsit olan cəhan ilə.

Cəhani-eşqə girməyən məhəbbət aləmin bilməz,
Nedim ol mülkə çün girməz dil olmayan divan ilə.

Dirilə ölməyən bilməz nədür zindəligin eşqün,
Anunçün dilərəm ölüb-diriləm cani-can ilə.

Görən eyni-şəhadətdən nə andandır bilür eşqi,
Məhəbbət şaninə nisbət xəfi sirrdən nihan ilə.

Yaqından açmayan gözün məhəbbət vəchini görməz,
Dönübən gözətən edər ana şəkdən güman ilə.

Nedim təsdiqini eşqün təsəvvür edübən münkir
Məhəbbətdən məzaq edər o ləzətsiz yalan ilə.

Bilən cəm' ilə fərqini məhəbbət eşq ilə nədür,
Odur möhsin məvəddətdən edən cəm'in iqan ilə.

Şəhadətdən görən eybün nədür təsdiqini dildə
Məhəbbətdən odur bilən imanını cinan ilə.

Nə deyüb vəsf edəm eşqün, naziri yox düzədəndən
Pəri nisbət xəfi sirrdir rəvandan insü can ilə.

Nedim şəh Rövşəni deməz bana, ey Gülşəni, zahir
Bunu kim, eşqi-batindir məhəbbətdən nişan ilə.

* * *

346. Tükənməz elmi var eşqün, nəhayət yox bəyaninə,
Nə deyüm əvvəl-axır yox anun vəsf ilə şaninə.

Girənlər bəhrinə eşqün neçə ğəvvasi-yəm olsa
Qılur qərqə özün andan irişmədən miyaninə.

Görüb bikeyf ikən keyfin nə deyüb anladım eşqün,
Şəhadətdür çü qeyb anun nihan ikən əyaninə.

Ğinayi-eşqə irməyən nə bilsün fəqr ilə fəxrin
Dilərsən bilmək ol fəxri, irişgil fəqri kaninə.

Bana den varmıdır, billah, məkannisbət zəman eşqə,
Çu cəhd edüb irişmədim zəman ilə məkaninə.

Əzəllə çün əbəd olmaz cəhani-eşqə nisbətdən,
Anunçün kimsə irişməz məkan ilə zəmaninə.

İki aləm məhəbbətdən görənə eşq ilə birdir,
Anunçun ikisüz birdir girən eşqün cəhaninə.

Verən nəqdi-rəvanini məta'i-eşq içün bilsün
Nə olur müştəri girsə anun be'yi-dükaninə.

Məhəbbət kəsmin, ummayın, həbibullah ola demin
Ki, andan taciri-eşqün deməz ıssı ziyaninə.

Cəhani-can imiş bildim məhəbbət aləmi-eşqə
Vərəli könlümi anun məvəddətdən rəvaninə.

Cəhanda Rövşəni zövqin dadanlar Gülşəni kimi
Əcəb meydir o ləzzətdən qıyarsa datlu caninə.

* * *

347. Bəla den eşqün adın kim sorərsə,
Bəladır ana çün hər kim irərsə.

Bəla çəkmək gərək möhnətlə, talib,
Oluban mübtəla eşqi dilərsə.

Bəladur bişürən xamini eşqün,
Anunla püxtə olur kim bisərsə.



Müxənnətdir girən meydani-eşqə
Bəlayə doymayub hər kim qaçərsə.

Başundan keç derəm əvvəl qədəmdə,
Ayax qoyub bu yola kim girərsə.

Açar könül gözün eşqün yüzinə,
Yuxudan gözlərin hər kim uyərsə.

Bilür eşqi nədür tə'bir edən dəm,
Düşümi anlayub hər kim yorərsə.

Qiyamət qopubən eşq ilə sərxoş
Ayılmaz nə bilür anı qopərsə.

Qiyamət qopsə bilməz məsti eşqün,
Ayılmaz camın anun kim içərsə.

Çü eşqün sərxoşi ayılmaz imiş,
Nə bilsün aləmi köçüb qonarsə.

Görən düş kimi eşqi Gülşənidən
Yorubən Rövşəni der, kim irərsə.

* * *

348. Dilbər qədəm qoyuban gəlsə başum üstinə,
San ömür tazə qoydi gəlüb yaşım üstünə.

Ol növbəhari-hüsn tərü tazə gül kimi
Lütf edübən qodi qədəmin başum üstünə.

Görəndə nov əruse dönən hüsnin cilvəsin
Can verürəm, könül dəxi şabaşum üstünə.

Zövqi-ləbün sorub sanmun şövq ilə könül,
Şirin canın verər ləbi-əyyaşum üstünə.

Dedüm qiyamətün bana göstər əlamətin
Dedi ki, fitnədən dönə göz qaşum üstünə.

Öldür bəni ki, təm'əynən kuyün itinə
Başəd yüzün görüm gəlicək laşum üstünə.

Qıymaz qəzən kimi daşıban yaş tökər gözüm,
Sönməz odu nedim qurudub, başum üstünə.

Dilbərimlə heyyət diləyüb ğəmlisə könül,
Kim ğəncü işvədən səbə duz aşum üstünə.

Demiş qədəm başun qılubən gəl bana, nigar,
Varam qələm kimi qurudan yaşum üstünə.

Görə bəbəklərün sanub sanma haluni, gözət,
Gülər düşüm deyüb o nəzərdaşum üstünə.

Qeyrət qılub rəqibə nə der ol həbib, eşit,
İt kimi həmlə qılma o xoşdaşum üstünə.

Vəhdət dəmində gəlmə derəm, Gülşəni, sana,
Kəsrət verüb o sirrlə sirdaşım üstünə.

* * *

349. Elmini eyn eyləyəndir höccətü bürhan ilə
Bir demən, yüz bin dil ilə əgilən irfan ilə.

Bilməyən cəm' ilə fərqün hikmətün həqdən yə'qin
Anlamaz Qur'an bəyanın neydügin fürqan ilə.

Münkirün halumə qalan bənzədürəm dinləgüz,
Çaycuğəzlər cuşi kimi mövc uran ümman ilə.

Kəs dilün tə'n etmədən əbkəm oluban biməqam
Qılmayasan ta ki, qıldan haləti-hirman ilə.



Kər sifət neçün eşitməz əhli-həqqə münkirün
Batilə uyan həlakın qəhr edər dövran ilə.

Bilməzəm neçün istəməz dövri-iqbaldan xəbər,
Əmr ilə nəhy olan oldur, çünki anü şan ilə.

Ənbiyavü övliyayə münkirün küfrin bilib
Deməzəm, can verən dəm gedər ol iman ilə.

Cəhd edüb iman ilə islamini cəm' etməyən
Fərq ilə bilməz nədir iqanini ehsan ilə.

Rövşənidən mə'rifətdir qərq edən, ey Gülşəni,
Şərqü qərbi elmə nisbət mövc urub tufan ilə.

* * *

350. Nə deyüb bildirəm eşqi məhəbbətdən bəyan ilə,
Çü vəsf olmaz, bəyan oldur xəfi sirrdən nişan ilə.

Bəsitü sadədür anı müqəddəs zat ilə neçün
Məhəbbət məzhəri olan məzahirdən hər an ilə?

Vücudi cəm'i-mövcudun yəğinindən zühurindir,
Məvəddətdən bəyan içün müqəddəs anü san ilə.

Günəşdən rövşən əsmadan müsəmma məzhəri olur
Ki fərq olmaz anun cəm'i-məzahirdən əyan ilə.

Məhəbbətdən təyin edən müqəddəs məzhəri-eşqi
Olur bişək ol iqandan, demək qalur güman ilə.

Məvəddətdən dirilməyən biləməz sirrini eşqün,
Çü anı bilməgə dirlik gərəkdir cani-can ilə.

Şəhadət vəchidir eşqün müqəddəs zati-imandur,
Anı görən məhəbbətdən bilür eşqi iman ilə.

Məvəddət aləmi eşqün zühuridir şəhadətdən
Ki, qeyb andan cəhan olur məkansuzlə zəman ilə.

Vücudin məhv edən bilür başini neydügin eşqün,
Məkanindən cəhan oldur müqəddəs laməkan ilə.

Eşitdüm Rövşəni derdi sana, ey Gülşəni, buni:
– Məhəbbət sirridir eşqün, əyan olmaz bəyan ilə.

* * *

351. Yügənməz dərdi var eşqün, nəhayət yox bəlasinə,
İnanmazsan anun sorgil bəlasın mübtəlasinə.

Düşənlər dərdinə eşqün dəva istəyübən bulmaz,
Anunçün irmədi kimsə anun dərdi dəvasinə.

Cəfayi-eşqi zövq edüb verən şövq ilə könlüni,
Vəfadır zövq edüb anun cəfayilə ünasinə.

Həvəsdən abi-datlusin saçan eşqün həvasinə
Demən aşiq ki zövq içün uyupdur, ur həvasinə.

Qədərdir aşiqə eşqün qəzasından bəla çəkmək,
Anunçün razıyam anun bəlayilə qəzasina.

Gözüm tifli uşəx kimi anadan doğalı ağlar
Nedim gözümlə könlümün girəməz[əm] arasinə.

Günəş tək Rövşəni dövri dutali aləmi derəm,
Sana, ey Gülşəni, döngil özü zillü ziyasinə.



* * *

352. Daş atma saxın qəsd edübən dil şişəsinə,
Bin şişə sınar dildən əgər bir şişə sinə.

Mürtəd bilür gözərdi dili küfr ilə mütləq
İman yüzini görmiyəsər qonə həb'inə.

Dil rədd edən imani qəbul etməyisər həq,
İslam ilə girməz oluban ol kişi sinə.

Tə'n içün atan oxunu dildən yenə bir gəz,
Bin ox yeyisər canə qəza biri yerinə.

Ərşün günəşidür dili-kamil nə huri-nuş,
Vəsf ilə desəm, şişə dilə sınma qafinə.

Yer pərtövidir dil göyünün mehri cəhan tab,
Bin gün denilən anə görə zərrə kəminə.

Candan göz açub bax yüzümə, ta ki görəsən,
İman günəşi doğduğun anının həbisinə.

Dirilə girüb sinə dilə xəlvəti yolın
Bulmaz o yolu dirürən sinnilə cinə.

Uzatma dilün əhli-həqə tə'n ilə zinhar,
Həbs et qılıcun soxubənü dil kimi qinə.

İncidügi çün əhli-həqqi cəhl ilə bu qövm,
Axı oluban yetmiyisər biri-birinə.

Öldür özüni deyər ikən bir neçə müddət,
Dirlik nəyimiş ölməgilən səndəki sinə.

Dirlik diləyən olma gərək külli özündən,
Təslim oluban ta ki, irə həqqi-yəqinə.

Görməz yüzini eşq ərinin küfr ilə iman,
Əql ilə qılan uğrar imiş küfr ilə dinə.

Ağü qəradan keçən açar qeyb qapusin,
Miftahə dönüb dili irər fəthi-mibinə.

Bihuş oluban eşidinüz huş nidasın,
Başdan ayağa guş olub anun nə'linə.

Salubdır cəhan ğəmini dildən ola gör şad
Çün dəgməz imiş qəmmi-cəhan dil qəminə.

Tassız fələkə sığmaz imiş dildəki ne'mət
Daşub dökülür hər nə qosəm dövrə qabinə.

"Püf" deyübənü ayinənün yüzinə dəmdən
Göndərmə qubarın yağuban sinədə kinə.

Seyqəl uruban gərdi-dilə ayinədən pak
Sil kim, görəsən göz kimi ayinəsinə.

Dildən diləgüz kənzi-xəfi sirri ki olur,
Ol gənci-əmanət çün olan gizlü dəfinə.

Dil vəsfini anub nə desün Gülşəni miskin,
Can verübən irişəmədi dil fe'linə.

* * *

353. İstərsən həqi yəqin aşkarə can içində,
İtür özün, anı bul cani-cəhan içində.

Ərş ilə kürsi sifət dişrə degil istəgün,
Oldur olan bicəhət kövnü məkan içində.

Gözün açub gördügin eyni-yə'qindir həman
Zahirü batin nə var eyni-əyan içində.



Yer ilə gög şeş cəhət bicəhətün əksidür,
Vəchə görə şanidür dövri-zəman içində.

Dil həqiqət yüzin sirr ilə məxfi görən
Bildi nə yüzdür ə'lan sirri-nihan içində.

Zənn ilə şək divini sidqi yəqini sanub,
Zillüni gerçəkləmə vəhmü güman içində.

Göz açubən ibtida görmək edən vəchüni
Eynin imiş, qıl nəzər şan ilə an içində.

Adəm imiş sevgilü həqdən mərid,
Qüdrəti-Həqq görsədən hikməti-şan içində.

İtirübən özünü bulma nişanın ki, ta
Həqqi bulasan itüb şani-nişan içində.

Qövsi-qəza çəkici eyni-qədərdən degil,
Rövşənivəş yaz dəva tirü-kəman içində.

Rövşənidən gün kimi dövri-qəmərdən ziya
Gülşənidən der görən xəlqi cəhan içində.

* * *

354 İstədügim buldum uş eyni-əyan içində,
Sirr ilə sirrdən xəfi an ilə şan içində.

İstənübən istənən bir imiş, iki degil,
Sirri-e'lan görünən gizlü nihan içində.

Sevübənü sevilən bir yüz imiş ikidən,
Birə ikidir deyən qaldı güman içində

Gün kimi dildən açan eyni-əyanə gözün
Şeş cəhəti bir görər dövri-zəman içində.

Kəsrət ilə vəhdətin eynə görə birligin
Görməyənə gör derəm gözlü cəhan içində.

İki cəhan istəgin birlik elində bulan
Bildi nədir istənən kövnü məkan içində.

Eşq ilə dövr edəli, mülki-dilə girəli,
İstədügin bulmuşam sevgilü can içində.

Seyqəl urub dilümə güzgi kimi siləli
Gözəyürəm, dilbərim, nədür ol an içində.

*Biləməzəm istənən* Aydın *elində nədir,*
Rövşənidən özügə ədni-cinan içində.

Rövşənivü Gülşəni birdir, iki deməzəm,
Birlik ilə görəli iki rəvan içində.

* * *

355. Yanaram həsrətündən dönə-dönə,
Kəbabə dönüb andan dönə-dönə.

Ölüm bir can alur, bən şövqün ilə
Verürəm cani təndən dönə-dönə.

Nedim can almadan usanmaz ol şux,
Qılub işvəylə bəndən dönə-dönə.

Atar qaşi yayından kirpük oxın
Canumə ol kəmandan dönə-dönə.

Nolaydı can verən dəm dilbərümi
Görəydüm mürvətindən dönə-dönə.

Umub vəslini ol şuxun, nedim çün
Ölürəm firqətindən dönə-dönə.

Görənə Rövşəniyi Gülşəni der:
– Nədir, sor halum andan dönə-dönə.



* * *

356. Tərk eyləyüb inkarimi, gəl iqrar et ərənlərə,
Dabşur inanın varıni, gəl, iqrar et ərənlərə.

Bulğıl bir tanrı xasını, tərk eyləmiş riyasini,
Kol silə könlün pasını, gəl, iqrar et ərənlərə.

Gedür könüldən təşvişi, fikr etməgil yazü qışı,
Uçub getmədən can quşu, gəl, iqrar et ərənlərə.

Tərk eyləgil nəfsi, yüri, qəbr etmədən sənə evi,
Könüldən çıxaru dedi, gəl, iqrar et ərənlərə.

Ərənlərə inkar edən, şeytan kibi odur azan,
Dilər isən doğru-düzün, gəl, iqrar et ərənlərə.

Gördü gəlübən gedəni, malü mülkün tərk edəni,
Toprağə vermədən təni, gəl, iqrar et ərənlərə.

Başdan qoyub ayax yola, çəkmə ayağun kibr ilə
Yüz yerə sürüb icz ilə, gəl iqrar et ərənlərə.

Dutar ikən əl-ayağun, axirətçün qıl yarağun,
Bəla dürür aydurduğun, gəl, iqrar et ərənlərə.

Dünya işin əldən buraq, axır üçün qılğıl yaraq,
Yəqin degül yolun iraq, gəl, iqrar et ərənlərə.

Tərk elə səndən sənligin, yolun urucu bənligin,
Tövbən edüb peşmanligi, gəl iqrar et ərənlərə.

Aç gözünü kur olmadan, topraq içinə dolmadan,
“Mən rəbbükə”[24] sorulmadan, gəl, iqrar et ərənlərə.

Ərən edər: Rəbbün tanı, könlünə salub mehrüni,
Həq evindən qov şeytani, gəl, iqrar et ərənlərə.

Hər kim gözün açmaq dilər, diriyikən gora girər,
Ərən yüzin həqdən görər, gəl, iqrar et ərənlərə.

Ərən yüzin bunda görən, Rəbbin tanar onda inan,
Gerçək budur, sanma yalan, gəl, iqrar et ərənlərə.

Aç can ilə dildən gözi, tərk eyləgil batil sözü,
Həqdən görüb iman yüzi, gəl, iqrar et ərənlərə.

Həq der bənəm ərənlərə, xəstələrin soranlara,
Xidmət edübən bunlara, gəl, iqrar et ərənlərə.

Ərən dedügi, Gülşəni, eşq özidir baq gör bəni,
Ondan der, eşit, Rövşəni: – Gəl, iqrar et ərənlərə.

* * *

357. Gerçək həqqi sevir isən, gəl, könül ver ərənlərə,
Həqqi bilmək uyur isən, gəl, könül ver ərənlərə.

Ərənlərə könül verən, sevər həqqi şəksiz gözən,
Ey həqqə doğru yol soran, gəl, könül ver ərənlərə.

Çığar könüldən təşvişi, həqdən edübən cünbüşün,
Ayax yerinə qo başın, gəl, könül ver ərənlərə.

Qüdsül-həram, beytül-yə'qin tufan dilərsən, ey rəfiq,
Candan bulub ana rəfiq, gəl, könül ver ərənlərə.

Düş izinə ərənlərin, doğru yola girənlərin,
Bil neydügini anların, gəl, könül ver ərənlərə.

Ərən izin izlər isən, yüzi nədir gözlər isən,
Gördügüni gizlər isən, gəl, könül ver ərənlərə.

Könüldən aç can gözini, ta görəsən ər yüzini,
Eşitmə şeytan sözünü, gəl, könül ver ərənlərə.



Tən gözini yumub açan, candan gözün görər rəvan,
Ər yüzini həqdən inan, gəl, könül ver ərənlərə.

Surət degil ərən yüzi, ta görə anı tən gözi,
Mə'nayimiş çün ər özü, gəl, könül ver ərənlərə.

Görə kimdir surət gözü, seçər gecədən gündüzü,
Tərk edübən ol göz sözü, gəl, könül ver ərənlərə.

Rövşənidən surət görən, mə'ni yüzin bilməz inan,
Bəs kim görər deyüb soran, gəl, könül ver ərənlərə.

Ey Gülşəni, eynül-yə'qin görmək dilərsən ər yüzin,
Açmaq içün mə'na yüzin, gəl, könül ver ərənlərə.

* * *

358. Eşit sözüm, ey Gülşəni, gəl, gedəlüm eşq elinə,
Şahdır o mülki-Rövşəni, gəl gedəlüm eşq elinə.

Aydın elinin şahinə, günəşdən aydın mahinə,
Yüz sürməgə dərgahinə, gəl, gedəlüm eşq elinə.

Hər kim dilər yüzin görə, təbdil edə narın yüzə,
Dilərsən anı göz görə, gəl, gedəlüm eşq elinə.

Eşq elidir cərrül-vətən, iman olan, ey zülfə tən,
Görmək dilərsən anı sən, gəl, gedəlüm eşq elinə.

Tərk eylə əqlin nəqşini, yolun uran qılmaşını,
İstər isən nəqqaşını, gəl, gedəlüm eşq elinə.

Çoxdur o yolda çün xətər, başdan keçən [tənin] qoyar,
Budur, eşit, doğru xəbər, gəl, gedəlüm eşq elinə.

Eşq ərinə mənzil məqam, mülki-məhəbbətdir təmam,
Ey istəyən Darüssəlam, gəl gedəlüm eşq elinə.

Dilər isən vəchi-vədud, ola sana rəvan şühud,
Tərk edübən səndən vücud, gəl gedəlüm eşq elinə.

Ey gün kibi rövşən gözün, Aydın qılub aydın yüzin,
Edüb səadət yıldızın, gəl, gedəlüm eşq elinə.

Eşidüb anlagil sözi, tey qıl gecəylə gündüzi,
Açgil məhəbbətdən gözi, gəl, gedəlüm eşq elinə.

Eşq özüdür, eşit, əcəb, sevgilüsin qılan tələb,
Deyən odur bu əl hesab, gəl, gedəlüm eşq elinə.

Ey Rövşənidən Gülşəni, candan göz açub gör bəni,
Kimdir deyən sana tanı, gəl, gedəlüm eşq elinə.

* * *

359. Ol pəripeykər cəmalın bir dəxi görsəm, nolə?
Görməgə bu nəzərdən canumi versəm, nolə?

Eşidürəm ol pəriyi verməyən can görəməz,
Can verən dəm görisər yüzin sevsəm, nolə?

Bilməzəm başda xəyalum, ya düşümdür görünən,
Sevgilü şirin canumdan dilbərə yürsəm, nolə?

Saydım aqil görəməz ol pəri peykər yüzin,
Ussu gedər çün görənin, görməsə sərsəm, nolə?

Sübhdəm ayağə dursa pir içün ol sərvinaz,
Düşüb ayağə, yüzümi gün kibi sürsəm, nolə?

Rövşəni Aydın elinə verdi imandan vətən,
Gülşəni kibi sürübən ol elə varsam, nolə?



* * *

360. Məhəbbət sirridir adəm ki, faş olmaz bəyan ilə
Bəsiti ol dürür gedən xəfi nisbət nişan ilə.

Sorana adəmi eşqi nə qüdrətdür məhəbbətdən,
Cəvab olmaz, derəm andan sual içün bəyan ilə.

İki aləm vücudini ədəm nisbət qılan bilür
Nədəndir adəmi eşqün ikisüz bir rəvan ilə.

Məhəbbət Qafinə girən bilür ənqa sifət eşqi,
Çü Simurği anun sirdir xəfi nisbət məkan ilə.

Məvəddət eşqilə dövrün məkan ilə zəmanı yox,
Bilinməz müşkili, bihəll odur andan cəhan ilə.

Nədir kəsrət ki, vəhdətdən nəhayət söz əyan olur,
Məhəbbət eşqilə andan dükənməz vəchi-şan ilə.

Nə bilsün görməyən eybin şəhadət vəchinə nisbət,
Ki ol sirrdir xəfi nisbət əyan ikən nihan ilə.

Görən eynül-yəqin eşqi məhəbbətdən açub gözün,
Demin qılur nəzər qeyrə o rubənddən güman ilə.

Təsəvvürdən qılan zənnin yəqin təsdiq içün məşhur,
Qaçan şəksüz edər iman o ğeyb içün cinan ilə.

Dükənməz dövr ilə eşqün cəhani var məhəbbətdən,
Odur baqi, ğina, sözün mədari cavidan ilə.

Görənlər eşqün əmrindən nədür kaf ilə nun sirrin
Bilür qüdrətdən ol hikmət olandır "Kün məkün" ilə.

Sual etmə derəm, münkir, məhəbbətdən nədür eşqi,
Məhəbbətdən olub bədtər rəvandan imtəhan ilə.

Nə deyüb anladım eşqin məhəbbətdən sana fərqin,
Çü birdir iki söz cəm'i anın pirü cəvan ilə.

Qılan bey'ü şera bilür verüb təqdirü ayini
Məhəbbətdən bəha eşqə aluben canü can ilə.

İki aləm mətaini verüb bir cövhəri eşqi
Alan sirat içün derəm o dürri rani-kan ilə.

Bilinməz qəhr ilə lütfi məvəddətdən nədür eşqün,
Çü birdir iki söz lütfi olan dəm qəhrəman ilə.

Mürəkkəbdən bəsit oldur ki, həll etməz bəyan anı
Qılub müşkil o yəxşidən, bilinməyüb yəman ilə.

Könüldən can verən eşqə məhəbbət zövqini bilür,
Nə ləzzətdür məzaq andan nəvahi-mehriban ilə.

Nə deyüb anladım eşqün bəyanını məhəbbətdən,
Bilinməz Gülşəni çün ol xəfi sirr tərcüman ilə.

Soraram, Gülşəni, deməz bana şəh Rövşəni, nedim,
Məhəbbətdən nədür dil kim, bəyan olmaz lisan ilə.

* * *

361. Sual etdim bu gün bən bir tülabə,
Neçün daim sürərsən yüz türabə?

İnildündən dəlindi dərtlü bağrum,
Fəğanündən cigər dəndi kəbabə.

Neçün bağrın dəlündi, gözlərün yaş,
Səbəb nədir sataşdun bu itabə?

Gözün yaşı rəvan olmuş səhərlər,
Gecələr varmadun bir ləhzə xabə.



Əlif bükülmüş qəddün, çünki dönmüş,
Əgüldügi düzülmüş san rübabə.

Tütünündən boyandı gögə göglər,
Fəraqundən qara yerlər sərabə.

Qərarun yoq gecə-gündüz dönərsən,
Səbəb nədir irişdün bu əzabə?

Xəbər necə verübdür sanə dövran
Ki, dövr içrə düşərsən busi-tabə?

Nə cövr etdi sana bu çərxi-ğəddar
Ki, dərdin dəftəri sığmaz hesabə?

* * *

362. Hər zənn ilə yaqayın suzi təsdiq edən imanə,
Düşər təsvirindən zənn ilə ol gümanə.

İnkar edər müşkül iqrarinə dönübən,
Sidqini kizb edən dəm irişmədən iqanə.

Xeyr ilə şərri seçməz, zərrəbini nəf' bilüb,
Təsdiq edən təsəvvür yaxşı deyüb yəmanə.

Qeybə şəhadətini bilməyüben hər əbləh
İqrarini cənanın təsdiq edər zəmanə.

Hər nə desəm yəqindən imani-qeybə, şəksüz
İnkar idi əmadən, sanma sifət görənə.

Nəqdi-hidayət ilə küfri-zəlalət alan
Quru ticarət edər düşübəni ziyanə.

Bilməyüben əlimdən nədir imani-mütləq,
Salehdir anı qılub hər məqsədi-zəmanə.

Cüzdür əməl imandan, cəhl ilə hər müflis
Cüz-küll bəsitə yox der ol nəql eyliyanə.

Saleh əməl imandır şəksüz yə'qinü bizənn
Fərq etmə rəybün andan iqan içün miyanə.

İman əhli rəyibün dildə həva-həvəsdir,
Mö'min demə həvadən küfr ilə yel qovanə.

Hər dildə kim həvadır təsdiqi-Nuh cinandan,
Görməz iman yaqından ancılayın rəvanə.

Ey Gülşəni, sor axı həqqül-yəqin gözündən,
Sidq ilə Rövşənidən təsdiq nədir cənanə.

* * *

363. Düşübən qərq olmıyanlar eşqünün sevdasinə,
Bərdə qalub bəhrə girməz dürrinün almasinə.

Rəşk edər görəndə gözüm-könlüm, nedim?
Girəməz çün gər könüllə gözümün əzasinə.

Can ilə nəqdi-rəvan özünə nəm var verim
Al ilə almax diləsə gözlərün alasinə.

Bilməzəm uyur-oyanux olduğun, heyrət budur,
Vərəli eşq ilə könlüm fikrinin sevdasinə.

Kim bilür könlüm xiyalın fikrin ilə, ey pəri,
Kim nə vəch ilə düşübən zikrinin sevdasinə.

Görübən biari-eşqi əql ilə ar etmə kim,
Tərk edüb eşq ilə arın düşəsən rüsvasına.

Rövşəni qalinə verüb Gülşəni halini der,
Şövq ilə baş vermişəm uş eşqünün qovğasinə.



* * *

364. Bana dərdün gərək, dərmansız, ey məh,
Çü bir dəm olamazam ansız, ey məh.

Nədür zövqü nişati biləməzəm
Cəhanda xəlq olanun sənsiz, ey məh.

Verüp eşqünə can, çün dərdin ol dəm:
Qoma qalmağə bəni cansız, ey məh.

Canumə can imiş dərdün çü bildim,
Necə pəs diriləm cansüz, ey məh.

Sənün dərdünlə verməyən rəvanın
Canın verüb gedər imansız, ey məh.

Nədür dərdündən özgə höccəti-eşq,
Anunçün olmazam bürhansız, ey məh.

Soruban Rövşəniyə sirri-eşqi
Olamaz Gülşəni irfansız, ey məh.

* * *

365. Eşq ilə yüzin görəli billah,
"İxlas" ilə oxuram "hüvəllah".

Vəhdətdən oxur həqqün kəlamın,
Kəsrət itirüb olanlar agah.

Arifə sədrün bəyani-həqqi
K'oldur aparan həqiqətə rah.

Şəhlıx dilə, eşqə qul oluban
Bil bəndəsini, nədən olur şəh.

Birdir, iki görmə bəndə, şahi,
Tovhidə görə olub şəhanşah.

Birdən törədən sanü hesabi,
Kəsrətlə qılubən olma gümrəh.

Vahid əhədün sənusidir bil,
Birdir nə isə ədədə işbah.

Gər yüz bin isə ədəd nə birdən,
Turur zində gah, gahü bigah.

Sanü sənidən sanadın anı,
Birdir iki sana qissə kütah.

Birdən törədi nə isə mövcud,
Birdir sanılan bu xahü naxah.

Bir bil günəşi sitarə yüz bin
Görsədə yüzin gecədə çün mah.

Məhv olduğu dəm gözət günəşdən
Qaldırsa başın dəmi-səhərgah.

Birdir iki söz vəhdətə nisbət,
Bu Gülşəniyi Həqq "qul hüvəllah".

* * *

366. Məhtabə verən tabiş mehründən imiş, ey məh,
Rövşən qılan ol tabi ay yüzin imiş, ey məh.

Məh tabişə düşdügi dövri-qəmər içində
Zülfündən imiş, çünki görsəd görünə gəh-gəh.

Alnunda hilal əbrun görən iki eyd eylər,
Yüzün görüb andandır xəlqün dedügi məh-məh.

Bir yerinə gər yüz can verəydi bana xaliq,
Qurban edübən sana verərdüm anı dəh-dəh.

Hər kim özündən keçər, bənlik olandan qaçar,
Zikr deyəndə qaçər: "La ilahə illəllah".

Zikr etmə vəsvas ilə, könlündə xənnas ilə,
Fikrün yeyüb dərd ilə: "La ilahə illəllah".

Əridüb Allah adın qoma həva tək divün,
Andan degil, ey pak: "La ilahə illəllah".

Dildə həva zikrini tərk edübən fikrini,
Andan degil, ey Gülşəni, "La ilahə illəllah".

* * *

368. Ey hüsn elinün həmişə şahi,
İqlimi-cəmali, mehrü mahi.

Can verməyübən yüzün görəməz
Kimsə ki sana qıla nigahi.

Mehr ilə görən yüzini, billah,
Bilür nəyimiş məhi-ilahi.

Hüsn iqliminin çü şahi sənsən,
Xublərdür olan onun sipahi.

Yüzün görən edər iki bayram,
Qaşun dü hilal onun güvahi.

Nə qıldı məlahət ilə vəchün,
Görsətmədi gün kimi kəmahi.

Qəddüni görən rəvankən, ey sərv,
Mehrünə yetər çəkəndə ahi.

Zülfün görəli bilindi qədrün,
Leyli nəyimiş? Saçun siyahi.



Mehr ilə görəli tacuni məh,
Qor ay başinə günəş külahi.

Yunis kimi ğərq edən rəvanın
Dəryadə bulur nə yuddi mahi?

Yusif kimi Misri-hüsnə girən
Çahdən çıxubəni buldi cahi.

Arif deməzəm iki cəhanda
Bir bilməyənə kuh ilə kahi.

Ğafil yatubən uyuma, talib,
Tərk et oyanub bu xabgahi.

Eşqün yoluna girüb qayıtmaz,
Əldən qomayub bu doğru rahi.

Nasih, məni eşq ilə günahkar
Qılub deməgil ana mənahi.

Zahid sana taəti-riyadan
Xüşki-dimağ edər təbahi.

Eşq ilə könül bəlayə düşsün,
Ondan qıla görmiyə pənahi.

Bu Gülşəniyə demən günahkar,
Çün səvab olur [onun] günahi.

* * *

369. Aqili-aləmdir, ey can, eşqinün divanəsi,
Sana olub aşinavü özünün biganəsi.

Düşəli sevdayi-eşqün başimə məcnunsifət
Söyləsə səm'umə girməz nasihün əfsanəsi.

Leyli eşqün məni Məcnun qılandan, ey sənəm,
Kə'bə kimi yüzün oldu gözümün bütxanəsi.

Görəli divanə könlüm nərgisün sərxoşluğun,
Məst olup heyrətdən istər kol ola meyxanəsi.

Cismün imiş cani-aləm, həm müqəddəs ruhi-pak,
Ey əzəldən kamil insan, Adəmün cananəsi.

Qılmadı pərvər sənün tək dürrüni bəhri-vücud
Kim, ədəmdən ola safi ol sədəf dürdanəsi.

Görübən şəm'i-cəmalun tabişin könlüm necə
Yanmayup mehr ilə netsün pəs degüz pərvanəsi.

Gün kimi yüzünə baxub yandurur könlüm əvin,
Mehrün ilə çünki yoxdur ondan özgə yanəsi.

Gəncmiş eşqün ki, gizlər bu yıxux könlüm anı,
Rövşəni nəqdinün olub Gülşəni viranəsi.

* * *

370. Nə bilsün içməyənlər cami-eşqi?
Nədür sərxoş o meydən kami-eşqi?

İçən eşqün şərabini ayılmaz,
Saça ta sübh ilə ol şami-eşqi.

Qoma nərgis sifət camuni əldən,
Dilərsən bulma ondan kami-eşqi.

Keçürmə mən kibi sərxoşluq ilə
Ayığ olmayuban əyyami-eşqi.

Möhübbət xəmrin içənlər ayılmaz,
Bilə ta neydügin əncami-eşqi.

Görənlər qarə bən ay kimi yüzdə
Bilür nədür o yüzdən dami-eşqi.



Bana həsrət odundan özgə degüz,
Nədür püxtə qılan xami-eşqi?

Nə sevdadur başumə biləməzəm,
Xəyaldan fikr ilə əvhami-eşqi?

Cahanda gün kimi eşq ilə şöhrət
Buluban bil nədür bədnami-eşqi.

Soraram Gülşəniyə Rövşəni der: –
Bana e'lam edübən nami-eşqi.

* * *

371. Yandırdı şövqün odi tutuşdurub rəvani,
Müştaqə qeyrətündən deyəli "ləntərani".

Ay kibi yüzün içün gün kimi yanubən uş,
Şövq ilə gecə-gündüz görmək dilərəm ani.

Lövhi-əzəl yüzündür müshəf kimi oxuram,
Ümmül-kitab ondan səb'ən min əl-məsani.

Ayinəyi-məhəbbət vəchündən özgə nədür,
Mir'at olan liqayə, ey sirri "mən rəani".

Surətdə mə'ni yüzün günəş kimi doğaldan
Bilində xəlqə nədür gənci-xəfi əyani.

Kövsər ləbündən imiş abü-həyati sordum,
Xızrun rəvani nisbət hər cani-cavidani.

Gəlmədi sənciləyin Ənqasifət cəhanə,
Ey Qafi-qüdrət içrə mövcudi-laməkani.

Sordum ləbündən, ey can, varmı dəhanun içün,
Verməz cəvabum ondan yox deyübən nişani.

Günəş kimi yüzündən, ey məhliqa, görünməz
Nə zərrədür dəhanun vəhy olmasa bəyani.

Bir gəz yüzüni görən, iki cəhanü canın
Tərk etmədən o neylər həm eyni kün fəkani?

"Me'racü qab"ə qoysan qaşın işarətündən,
Eyn ül-yə'qin görəndür tərk eyləyən gümani.

Candan görüb rəvanun tən baxa deyə arif
Cismün cəhanə candur, ərvahə ruhi-sani.

İqlimi-hüsn içində sultan imiş cəmalun,
Yusif sifət nezirün yoxdur cəhanda cani.

Can verübən yüzüni görən bilür nədür can,
Ey cani-canə məzhər, həm surəti-məani.

Ey Rövşəni, cəhanda gün kimi yox nəzirün,
Ay kimi Gülşəni ta görsədə xəlqə ani.

* * *

372. Qafil olan aşiqün bilmədi sevdasini,
Məcnunə sor Leylinün şurişü qovğasini.

Eşq ilə Məcnun olan, valehü məftun olan,
Bilür imiş, ey fülan, mehr ilə şeydasini.

Aşiqi bixud sifət valehü bimə'rifət,
Söyləyübən mənqəbət oxuyamaz tasini.

Zahid olub matəmi, sor ana nədür qəmi,
Qarə geyüb ölmədin nişə dutər yasini?

Eşq ilə Məcnun olan bidilə sor Leylinün
Sidrəvü Tuba sifət qədd ilə balasini.



Sorağını mə'nidən görməyən adəm degül,
Ta ki bilə çün küllün elm ilə əsmasini.

Eşq ilə könül gözün açubənü görmiyən
Can ilə canan yüzin nə bilə simasini?

Tən gözünü yumuban, can gözünü açmıyan
Kora dönüb görəməz Rövşəni binasini.

Bəndə demək eşq ilə qulluq edən şah imiş,
Sanmıyasız bəndədür eşq eli Darasini.

Eşq ilə şah olanun bəndəligin qılmayan
Şah oluban bilmədi qul ilə mövlasını.

Elmi-lədun hikmətin əql ilə bilə demən
Eşq ilə yer görməyən surətü mə'nasini.

Rövşəninün feyzidir əbri-bəharisifət,
Gördügi dəm Gülşəni seyl ilə dəryasini.

* * *

373. Baqıban ol dilrüba çün ney dilin yad eylədi,
Vəsl ilə hicrandən anı qurtarub şad eylədi.

Görsədüb mehr ilə vəchin talibinə bir nəzər,
İki aləm zövqin ana kamilən dad eylədi.

Aci-datlu, qəhrü lütfin vəsl ilə hicran kimi
Aşiqinə pərvərişdən gör nə irşad eylədi.

Qılubən viranə könlüm gənci-eşqin qoməğə
Yenidən qılub imarət, özgə bünyad eylədi.

Görəli şəm'i-cəmalun könlüm uş pərvanəvəş
Yandırub özin ol oddan, ğəmdən azad eylədi.

Gülşəni könül verübən eşqə bidil olalı
Rövşəni ismin dilində zikrü övrad eylədi.

Rövşəni pərvər qılubən ay kimi tabişi-nur,
Gülşəni deyübən ana sevgüsin ad eylədi.

* * *

374. Eşidüb dərd ilə zarum nolaydı
Canumdan sevgilü dilbər gələydi.

Alalı könlümi verməz bana çün,
Nola gəlüb canum dəxi alaydı.

Dutub könül quşin seyd etmək içün
Nolaydı ün çəkü[bən] qövl salaydı.

Uyuyan könlümə can dəxi bu dəm
Varurdi kuyinə gər yol bulaydı.

Əcəb bayram edərdim son nəfəsdə,
Əgər dilbər bəni qurban qılaydı.

Həzəran bidili var Rövşəninin
Demə, ey Gülşəni, bana qalaydı.

Görüb bülbül kimi zarumi dilbər,
Nolaydı gül sifət bana gələydi.

* * *

375. Ey cəmalun "küntü kənz"ün gövhəri-yek danəsi,
Gənc imiş eşqün ki, qıldı könlümi viranəsi.

Qibleyi-vəchün görəldən xəlqi-aləm Kə'bədə,
Der Mina tərkin urdu Qüds ikən bütxanəsi.



Vəhdətün bəhrinə girən bildi kim, kəsrət təmam,
Vəchünə nisbət sədəfdür, ey cəhan dürdanəsi.

Düşdi zülfün görəlidən bəndə könlüm dəlirüb,
Necə qurtula o qeydün bilməzəm divanəsi?

Gözlərün sevdasidür şeyda qılan, ey məh, bəni,
Sərxoş ol sevdadan olur nərgisün məstanəsi.

Şəm'i-rüxsarün görəldən tutuşuban yandı dil,
Necə yanmasun o şəm'ün şövq ilə pərvanəsi?

Saqiyi-bəzmi-əzəldən eşq ilə lə'lünmisən?
İçəli bildüm nədəndür ol meyün peymanəsi.

Gözləründən əsrük olur bir nəzər sərxoş görən,
Camın içən bilür oldur cami-Cəm meyxanəsi.

Nasih edər: – "Eşq ilə yandurmə canun!" – "Pəs nedəm?"
Çünki yoxur ondan özgə suziş ilə yanəsi.

Söyləmə əfsanə vaiz qissəxanə dönübən,
Çün yalandur əksər ondan söyləyən əfsanəsi.

Uğrasan könlümə, müşfiq dilbərün kuyində sor,
Eşq ilə möhnət çəkübən oldumi usanəsi?

Vəslinə şükranə dilər bəndən ol ziba nigar,
Nəqdi-candan özgə nəm var bilməzəm şükranəsi.

Rövşəninün mehrinə can verməden den neyləsin,
Gülşəniyi-bidil, çün oldur sevgilü cananəsi.

* * *

376. Bir nəzər görən cəmalun iki aləmdən varini,
Verübən ol vəchə görə canü dildən varini.

Eşq görən möhübbət sirrini nuri-ilah,
Rəmz ilə bilür nə desəm sirri həq əsrarini.

Oqıyan "Qəd həy kum nurü min Allahi"[25] bilür
Kəşf ilə "elmül-yəqin"dən vəhyi həqq ənvarini.

Sirr ilə sirdən xəfidir sayi hüsnün eşq ilə,
Sirr ələndən kim bilisər seyrinün ətvarini.

Kim bilür məclayi-hüsni həq möhübbətdən neşün
Sevgilü insanə verdi nur edübən narini?

Adəmi qüdrət olanə sor əmanət neydügin,
Çün möhübbətdən bilür nədür əmanət barini.

Görməyən bu gün qiyamət qamətini həşr ilə
Görəməz qopsə qiyamət nəşrə görə yarini.

Rövşənidən Gülşəninün görməyənlər hüsnini
Biləməz Firdovsə nisbət Gülşəni gülnarini.

* * *

377. Nedəm münkir görəməz Rövşəniyi,
Günəşdən aydın ol zuyi-səniyi.

Həsədden özgə nədür, biləməzəm,
Ğərəzdən kor edən ol kişini.

Həsəddür döndürən şeytani dünə
Həqə münkir olan batil dəniyi.

Nəşün kora dönər münkir nəzərdən
Çıxarmadan bəsərdən kəndisini?



Həsəddən can çəküp dilər ölümin,
Qul olsun hiqd ilə ol mürdəsini.

Verüb canın həsəddən hər münafiq,
Qomaz axır nəfəs başdan mənisini.

Eşit pəndim həsudə olma həmdəm,
Qılub məhrəm özünə rindəsini.

Xəçən fasiqlə mö'min bir olisər
Ki, həmdəm müslimü ərmənisi.

Həqə münkir olan batili nedəm
Anubən rədd ilə bu güzəştini.

Dönüb bəsti-yəhudə münkiri-dün
Əgər fəqr ilə kəndüdən ğənisini.

Nə yüzdən bilməzəm münkir, münafiq,
Görəməz Rövşənidən Gülşəniyi.

Həsəddən görəməz Aydın elindən
Günəşdən aydın rövşən didəsini.

* * *

378. Cəhan xəlqini İsa dəm nəfəsdən zində can idi,
O dəmdən verilən canın həyatı cavidan idi.

Məsihadəm olan nəfxi məgər suri-qiyamətdür
Ki, ölübən-dirilübən tenün candan rəvan idi.

"Nəfəxt fih min ruhi" dəmindən dirilib bilgil,
Nədür qüdsi-nəfəs heyydən ki, həq vəchinə şan idi.

Cəhanə fərdü əhədün nəzirün gün kimi yoxdur
Ki, kənz olub nihan ikən həqün həyyi əyan idi.

Dəhanun gün kimi, yüzün görünməz zərrəyə bənzər,
Nişanun kim verər anun, verən zənndən güman idi.

Ləbündən dirilən ölməz həqirvəş zində can olub,
K'onun camın içən özü həyat ikən məkan idi.

Yüzün lövhində yazılu "əla-l-ərş" istədi xəttin,
Gözün tifli-səvadından əcəb rövşən bəyan idi.

Rümuzin içidən eşqün əzəl lövhi kimi vəchün
Bəyazın eyni-can edüb səvadından rəvan idi.

Boyun me'racini görüb əgərçi qəd çəkər Sidrə,
Sənün qədün tək uzuni xəçən nazik miyan idi?

Yigitdir, eşq ilə pirə qocaldı deməgüz, billah,
Görübən Gülşəni nisbət neçə piri cəvan idi.

* * *

379. Arif necə deyə tən candan görüb rəvani
Cismün cəhanə candur, əhvahə ruhi-şani.

Aqlığı-hüsn içində sultan imiş cəmalun,
Yusif sifət nəzirün yoxdur, cəhani-cani.

Hüsnün məlahətindən şirin nə var cəhanda
Zövq əhlinə ki, candan datlu qılar dəhani?

Can verübən yüzüni görən bilür nədür can,
Ey cani-canə məzhər, həm sultani-mə'ani.

Ey Rövşəni, cəhanda gün kimi yox nəzirün,
Ay kimi Gülşəni ta görsədə xəlqə anı.



* * *

380. Dilərsən eşq ilə görmək yüzüni,
Aça gözün kimi candan gözüni.

Səni sənsüz belə gör itirübən,
Dilərsən neydügin bilmək özüni.

Açubən can qulağın dinlə, nədür
Sana şövq ilə candan dilsuzini.

Məlahət aləmində zövq edüb var,
Nədür candan ğəzənc içün düzüni.

Şəhadət kövkəbidir Gülşəni uş,
Görənlər Rövşənidən yulduzuni.

Yırax-yaxın çü yoxdur dil yolunda,
Nə deyüb anladım andan izüni.

Həvadan sanmanuz eşqün yolunda,
Həvəsdən yuyuban cəvan tozuni.

* * *

381. Eşq əriyəm deyənün dinlə nədür halını?
Demə məhal eşidüb anlar idün qalini.

Əqlə məhal olan iş eşq ərinə hal imiş,
Fikr edübən əql anun anlamaz əhvalini.

Xızr ilə Musa yetər höccətü bürhan dəlil,
K'etmədi aqil qəbul aşiqin əf'alini.

Biləməzəm münkirə nə deyübən anladım
Haləti-aşiq kimi arifin əsrarini.

Eşq ərini sanmanuz rəngə qılub aldana,
Ağü qəra tərk edən neylər anun alini.

Zali-cəhan aşiqi al edüb aldayamaz,
Rüstəmi-eşqün nedər əhli-xirəd Zalini.

İki cəhan tərkini tac edəli Gülşəni,
Bildi nədür tərk ilə Rövşənidən dalini.

* * *

382. Ədəm mülkində bənsüzin vücudim kənz idi məxfi,
Nədən məxfi idi sorsan, cəli olmaz, desəm keyfi.

Gecə-gündüz zəman ilə məkani yoğ ikən dəhrin,
Ədəmdən varmadı degüz vücud ilə şəfa seyfi.

Ədəm mülkinə girməyən vücud elini yəm etməz,
Anunçün girüb ol mülkə qılurəm dəmbədəm tövfi.

Cəhənnəmdən bəsər canum ədəmdən qorxuban yanar,
Əzab ilə bana bəsdir vücud ilə ədəm xövfi.

Ədəm tacini geymədün başunə tərk ilə, talib,
Biləməz navücud ilə geyər sufi olan sufi.

Ədəm mülkinə girməyən vücudi-safi tən bilməz,
Anun içün ədəm dilər vücudin sufiyi-safi.

Sanadım Gülşəni nisbət ədəm şahinə zill olan,
Vücud ilə bilür nədür iki aləmdə bikeyfi?

* * *

383. Demin, əgər işi hər kim incidər alimləri,
Ögmə, həqqdən qəhr edər çün müntəqi zalimləri.

Görübən alimlərün kamilligin hər bixirəd
Nəqsə nisbət etməz, illa cahilün kamilləri.

"Oxub elmi əməlsüz qalmayın" çün dedi Həqq
Kim eşək nisbət verəndur həlm ilə hamilləri.



Bilməzəm necə uyardım ğəflət içrə, oniçün
Ölü nisbət uyur ikən bixəbər xamləri.

Bir görən yüz bin soranda mə'ninün ummalari
Bilür andan neydügini birlügin şamilləri.

İzzətü ikram edün dedi rəsulillah bana,
Nisbət edüb, hörmət içün elm ilə alimləri.

Hər münafiq, münkiri-həq batilə könül verən
Qəlbinə nisbət qılur ol pakdil salehləri.

Rövşənidən Gülşəniyi incidənlər sənsüzin
Adilə nisbət edəndir bitə'yin zalimləri.

* * *

384. Müşkil oldu bana həlsüz, bilməz oldum dini,
Heyrətüm budur, göz açub görməz oldum dini.

İki aləm bir cəhətdən görünəli gözümə
Axırından fərq edübən seçməz oldum dini.

Bir derəm iki cəhani birlik ilə görəli
Birə iki der kimi ayırmaz oldum dini.

Görəli eynül-yəqindən bikəmal dünya yüzin
Düş kimi xabi-xiyaldən yormaz oldum dini.

Surətən mə'ni qılandır ta'ətilə saətün,
Bilməmiş kimi yatandan sormaz oldum dini.

Eşidəli axirətçün "məzrə" dedi rəsul,
Çevirüb yüzimi ondan yorməz oldum dini.

Na'mi-hal sahvani deyəli xeyrül-bəəğər,
Ol səlahitdən özgə görməz oldum dini.

Bilməyübən dünyə derlər axirət əsbabinə,
Qılmadan əsbab ana sərf etməz oldum dini.

Verübən fisqü fəsad ta'ətün nəqdin rəvan,
Yaxşi ikən yamənə çərx etməz oldum dini.

Düşübən şövqündən artux Gülşəni axır nəfəs
Axirətsüz can verübən almaz oldum dini.

* * *

385. Çü yoxdur fani dünya e'tibari,
Cəhani-baqi istə, qoy bu dari.

Diləmə izzətün zilli-təmə'dən,
Dilərsən olmayasan xəlq cəvari.

Qərar etmə bu dari-fani içrə,
Bulunca istəyüb darül-qərari.

Gecə-gündüz qılub sidq ilə taət
Dilə Həqdən məded, qulluxda yari.

Sor Həqqə, sidq ilə qullux qılani,
Əmanət qulluğ imiş Həqq bari.

Həva ki, tapmayub əbdi-İlah ol,
Riyadən qılmayub, şöhrətlə kari.

Qılub ixlas ilə virdü nəmazın,
Niyaz eylə ana dərd ilə zari.

Dilərsən bulmağ ixlas riyadən,
Həva gərdindən et könlüni ari.

Həvəsdən bütə tapıb müşrik olma,
Çü gümrəh andan olur tağı, vari.

Həvadan rəddi-Hudur Gülşəniyə,
Könül pak et, dilərsən nuri-nari.



* * *

386. Sevdügimdən bir nəfəs ayru düşərsəm va məni,
Verınədin nedim o dəmdə den bana təndən cani.

Ağlayuban gülməz oldu matəmi nisbət yüzüm,
Olalı hüzn ilə könlüm həmü ğəmmün mə'dəni.

Rindü bədnamü məlamət, ar ilə namusi yox,
Eşq ilə rüsva cəhanda bir bənüm kimi xani?

Desəm, ey şirin canumdan sevgilü dilbər bana,
Nedim, ol qeyrətlənübən sevməzəm der bən səni.

Bənligin tərk etməyəndir düşməni eşqün ki, bən
Sevmədügin bilmədim anun kimsədən "ma"vü "mən"i.

Yelübən badi-həvadən hər yənayə yel kimi
Uymağın badi-həvayə eşq sanur hər dəni.

Görəli bikeyf eşqün vəchini der Gülşəni:
– Rövşənidir görünən bikeyf, billah, Rövşəni.

* * *

387. Quru yerə axıduram sanmagüz göz yaşini,
Tifli-çeşmim anub ağlar Rövşəni xoştaşini.

Dilərəm rövşən gözümün yaşini faş etməyəm,
Sirr ilə eldən anunçün ağlar oldum yaşini.

Ölmədən ölümün anan matəmi banum kimi
Gecə-gündüz ağlar imiş yəs dutub öz başini.

Quruyub tükəndi yaşi ağlamaxdan gözümün,
Nedəyüm göz kimi rövşən quru qəllaşini.

Meyl edüb mehr ilə gözdən seyr edən dəmdə nedim?
Gözədür sevdayi-könlüm mərdümün umaşini.

Qocalub keçdükcə ömrüm yigid olur çün könül,
Anun içün kimsə bilməz o yigidün yaşini.

Rövşənidən diləgüm bu, Gülşəni, axır nəfəs
Aydın edə ayü gündən sinəm içi, daşini.

* * *

388. Cahanda bulamaz bir doğru yari,
Günəşdən safi ola, qəlbi ari.

Sanadım yarunəm deyəni, der həm
Olandır könlümün ğəmdən ğübari.

Bana yarım deyəndir çünki əğyar,
Neçə qılsam pəs ana e'tibari?

Tikənsüz gül bulunmaz dünyada, çün
Qəbul etmək gərək gül kimi xari.

Ayıtman qovlinə yarım deyənün
Yalanlar sözüni çün karü bari.

Necə düşmən kimi yarun əlindən
Fəğan edəm gecə-gündüzdə zari?

Cəhanda Rövşənidən özgə yarun
Bəni, ey Gülşəni, yandırdı nari.

* * *

389. Eşq ilə keçürməyən vəqt ilə ovqatini,
Necə tədarük qıla əql ilə mafatini?

Varlığını məhv edüb yoxlığa irişməyən,
Zikr ilə bilməz nədür sə'y ilə isbatini.

Nə'lilə asarini, şəm ilə kəftarini
Həq görüb eşitməyən bilmədi miqatini.



Yüz bini bir görməyən, özünə düş sormayan,
Tə'birini yormayan bilmədi ayatini.

Kim bilisər münkirün dildə xəfi sirrini,
Eyni-yəqindən çü ol zənn edə afatini.

Nəfsi-həva mərkəbin çabsə həvəsdən rəvan,
Meyli-həvadan anun kim bilisər atini.

Rövşənidən, Gülşəni, nəfsi-rəbi bilməyən,
Anlayamaz nə desən vəsfə nəzər zatini.

* * *

390. Ey könül, çün kimsə bilməz gövhərün miqdarini,
Sanmagil anı ərəzvəş bulmadın bazarini.

Cövhəri nadan nə bilsün, istə bul cövhərşünas,
Cövhərün ana satubən, al bəha dinarini.

Bilməyüb satən bəhasuz yarini əğyarə bax,
Bir pula dəgməz çü satən dü cəhanə yarini.

Cövhərini satubən alan bəha vəchin ərəz,
Ana bənzər gül satubən ala nəfdə xarini.

Hər ki yarın qılmadı candan əzizü bibəha,
Seçməz ol nadan, nə bilsün yar ilə əğyarini.

Misri-dildə hüsni-Yusif satılurkən, can bəha
Verübən alanə sorun Yusifün miqdarini.

Olmayan Məcnun biləməz Leylinün hüsni nədür,
Vamiqi Əzrayə sorun eşq əri əsrarini.

Gül bilür gülşəndə neçün şövq ilə bülbül ötər,
Zar olan dəm həsrət ilə görübən gülzarini.

Sirri-mə'şuqi nə bilsün eşqə könül verməyən,
Can verən aşiq bilür, çün mə'şuqun göftarini.

Hər kimin fe'li yalandur qovlini gerçəkləmən,
Çünki fe'lilə yalanlər qövlinin iqrarini.

Aşiqəm deyüb həvayə meyl edən talib bilür,
Zahidi-xudbinə dönüb hiç edər kirdarini.

Demə aşiqdir özündən hər ki bizar olmuya,
Çün sevər mə'şuq candan aşiqün bizarini.

Aşiq oldur kim bəladan eşq ilə möhnət çəkə,
Çünki eşq istər həmişə aşiqün azarini.

Sufinin zikri mükərrər "lə"dir, "illa" aşiqün
Ləblərindəndür mükərrər söyləsə idkarini.

Sanma Mənsur ola aşiq eşqüni rəh qılmadan
Özünə dari-səlamət ol məlamət darini.

Eşq ilə bədnam olubən rindü rüsvadan sorun,
Namü nəng ilə nədəndir eşq ərinin arini.

Mehr ilə könül verəndən eşqə, sor, eşqi nədür,
Can verən bidil bilür çün haləti dildarini.

Təlx edər sufi dəhanın zikr ilə aşiq dili
Ləblərindən datlu qılur zikrü fikrü varini.

Datlu der qəndi-mükərrərdən ləbün zövqün dadan,
Anun içün zikr edər talib anun təkrarini.

Neyşəkər der qəddüni görən məlahətlə rəvan,
Kim çəkər şirin qədündən özgə şükri-barini?

Doldu zülfün qoxusundan aləmə mişki-Xütən,
Çin imiş çeşdüni-tərki-nafəyi-tatarini.



Görmədim ağzun kimi dürdən sədəfpərvər qılub,
Görsədici lə'lü ləbdən lö'lö'nün şəhvarini.

Kə'bəyi-hüsnün görən der qıla yüzünə rəvan,
Eşqi inkar edüb, andan tərk edər iqrarini.

Mö'minəm, der eşqə münkir bilmədən iman nədir,
Özinə məzhəb qıluban küfrünün əsrarini.

Görəli Musa şəcərdən nari-eşqün tabişin,
Bildi nur imiş o yüzdən ol təcəlli narini.

Eşq idi Musa əsasi, həm yədi-beyzayi, bil,
Əjdəha kim yuddi xamu sahirun kirdarini.

Eşq imiş nurini nardan görsədən, ey Gülşəni,
Rövşənidən vəchə nisbət nur olan ənvarini.

* * *

391. Şövqünlə yanub, ey gözəlüm, dad edəyümmi?
Dərdün dilümi dağlasa, fəryad edəyümmi?

Göz gördi, könül sevdi səni çün, degil, ey can,
Gözümlə könül sevgün ilən şad edəyümmi?

Könlümi yaxub yandırıyar həsrətün odi,
Dağlamağa andan yeni bünyad edəyümmi?

Mə'mur edərəm deyü yaxar könlümi eşqün,
Yaxduğin anın qəhr ilə abad edəyümmi?

Firqətlə yanub ah ilə vəhdür könül işi,
Canumə dəxi ol işi övrad edəyümmi?

Dağ urma dilər mehrün odi canumə, degil,
Yandırub anı dil kimi mö'tad edəyümmi?

Bağrım qanıdur zövqün ilə canda şərabum,
Dil şərhi qılub şövqün ilə var edəyümmi?

Bin can alınur bir baxışından, nəzər ana,
Canü dəlalün baxışa varar edəyümmi?

Ğeyrət qılıyar vəchün içün gözümə könlüm,
Mehrünlə dili gözümə minqar edəyümmi?

Dil ruzinə sən açıbənü gün kimi rövşən
Yolun gözədüb şövqünə mərsad edəyümmi?

Yanub yaxılur mehrün ilən çünki rəvanum,
Dil yedüdübən bən dəxi dad edəyümmi?

Qul olmayımış səltənəti sən şəhə bildim,
Ol qulluğ içün bəndəni irad edəyümmi?

Tərk etdi könül Gülşəniyi, Rövşəni görüb,
Düşməz önünə adın anub yad edəyümmi?

* * *

392. Daşın atar arifə tə'n ilə gözsüz fəqi,
Bilməz atan ana daş Nəmrüdə dönər şəqi.

Hər kim atar daşını əhli-həqə tə'n ilə,
Kafəri-mütləq odur, tanımadı çün Həqi.

Mö'min isən, de bana, qeydi-məiyyət nədür?
Həqq dedügin möhsinə olduğu dəm müttəqi.

Elmə görə cüzvü küll çünki hüviyyətdə bir,
Xas ilə ama pəs, degüz, hardan alur rövnəqi?

Müşkülümüz həll qılun elmi-həqə eyn ikən,
Eyni-yə'qindən rəvan kəşf edübən muğləqi.



Görsədünüz ğeybi-bab fəth edüb, ey zulbab,
Rövzəni-dildən rəvan qaldırubən məfrəqi.

Həl qılubən bəndi-dil üqdə qomun arada,
Qeyd edübən can kimi əhli-dili mütləqi.

Zahir ilə hökmi-şər bağlamadı dilümi,
Qılmaz idi dökülüb üqdə canı mabəqi.

Batin ikən həq desəm zahirilur çeşm edər
Yağdırubən başumə daşü kəsək müstəqi.

Rövşənidən sirri faş eyləmə başdan, saxın,
Gülşəni kimi müdam sərxoş ikən den həqi.

* * *

393. Zikrim budur, yarəbb, həman bana səni gərək, səni.
Fikrim kibi, ey müstəan, bana səni gərək, səni.

Tərk edübən canü cəhan sənün içün, ey cani-can,
Zikr edübən verdim aman, bana səni gərək, səni.

Nəfsüm imiş düşmən bana, yolum uran öndən sona,
Budur sözüm, yarəbb, sana, bana səni gərək, səni.

Düşmən bana bəndən əyan, nəfsüm imiş bərü bəyan,
Tərkin urub dərəm həman, bana səni gərək, səni.

Olu büti biinü an qomayuban bəndən nişan,
Sana verəm, ey müstəan, bana səni gərək, səni.

Qaçubəni bəndən sana, vermə bəni səndən bana,
Bundan dərəm öndən sona, bana səni gərək, səni.

Gördüm yüzüncə canda can verübəni, ey müstəan,
Şəksüz yaqından bigüman, bana səni gərək, səni.

Görmək yüzin eynül-əyan, eşq əhlinə təsdiqi-can,
Görüb derəm, yarəbb, rəvan bana səni gərək, səni.

Vəchündən imiş kün-fəkan nədir olan, ey bigüman,
Anı görüb derəm əyan, bana səni gərək, səni.

Rövşənidən eyni-əyan vəchün görüb, yarəbb, həman
Xətm edübən derəm rəvan bana səni gərək, səni.

* * *

394. Əzəldən qismətüm Həqqün rizasi,
Qəzadəndir qədər, eşq ibtidasi.

Müqəddərdir qəzadən hökmi-xaliq,
Nədən məxluq edər səd iqtibasi.

Mübəddəl ola sanmın sünnətüllah
Əzəlsüz biəbəd hökm-iqtibasi.

Zəlalət diləyən bulmaz hidayət,
Olub salehəməl şeyi-cəzasi.

Müşayyət birdən iki şanə nisbət
Olupdur cüzvü küllün iltibasi.

İradətlə müşəyyət ixtiyari
Degil cəbr ilə xəlqi-həq qəzasi.

İradətlə müşəyyətdən yaradır
Nə isə xəlqün andan iltimasi.

Müşəyyətlə iradətdən yerişür
Həqün xəlqə məvane'lə ətasi.

Əgər xeyir həqq ola fe'li xəlqün,
Nədür əmr ilə nəhyin pəs rəvasi?



Kim etməz fe'li-həqqə nisbətin fərq,
Saçub xeyr ilə kim şərri-nasi.

Müşəyyət məzhəridir hümməti-am,
Hidayətdən xəvasın istifasi.

İrişür xəlqə Həqdən fe'lə nisbət
Zəlalətlə inayət ibtidasi.

İradətdən məşiyyət Gülşəniyə
Olubdur Rövşənidən Həqq qəzasi.

* * *

395. Tələb edər, əya gözüm çirağı,
Eşitməgə cəvabun, dut qulağı.

Bənim budur sorarsan sərgüzəştim
Ki bilər idim bir yücə tağı.

Keçirmişdim sərədən göglərimi,
İrürmişdim səri-yayə budağı.

Doquz ay dırnəşübən dürlü quşlar
Budağımda dutərlərdi otağı.

Ötərdi tutivar qumrivü turrac
Keçürdim bir zəman bu rəsmi-çaqi.

Həva mürği həvəs bağı gəzərkən
Ömür quşinin üzülmüş duzağı.

Qəza qoydi məgər dəsti-xudayə
Ki, bir şəxs irübən saldı bucağı.

Dəlüb bağrumi daqdı bir kəməndi,
Sürünübən dolandum hər soqağı.

Soqaqlarda neçə müddət yüzümə
Gəlüb keçən basarlərdi ayaği.

Zəkəriyya kibi tabımdən biçubən
Tələb içün düzətdilər yərağî.

Yedi Əyyubləin bağrumi qurtlar,
Cigər qanın dökər gözüm qəbaği.

Dəmür mixlər toqutdi yürəgümə,
Qəza dəsti ilə çərxün çomaği.

Əgilərəm nedəyim, dust deyübən,
Gözüm yaşı sular bustanü bağî.

Fələk kimə yedürdi bir qaşuq bal
Ki, sonra sunmadı tas ilə ağî?

Süleyman kim sorardı təxtini, bil,
Qara toprağə vermişdir bin ağî.

Sənindir kim cəhani Qaf bər Qaf,
Dutub hökm ilə qılmışdı yəsaği.

Girüb zülmətdə dergən abi-heyvan,
Dolu zəhr ilə sunərdi susaği.

Qanı Xosrov, qanı kişvər, qanı Sam?
Bəlürməz birinin uci-bucaği...

Ə'layi-əliyytən bəndə tanılmaz,
Heqün fəzli dürür əlhəqq dəyaği.

Kimə yar oldı dövran bu cəhandə
Ki, sonra olmadı anunla yaği?

Səbr səccadəsin altına salmış,
Təvəkküldən quşanmışdır quşaği.



* * *

396. Nedim elm ilə yox cəhlün təmizi,
Müməyyiz seçməz ətlas ilə bezi.

Çü həqdən batili seçməz müməyyiz,
Qiyas edər ari suya kəmizi.

Surətdən mə'niyi fərq edə bilməz
Bərabər görübən dəstimlə xizi.

Müməyyiz yoq, nedim bu dövrə nisbət
Ki, fərq edə bilüb yaz ilə güzi.

Nə desəm anlamaz, çün bitəmizə
Qərarə ağ ikən inkarla yüzi.

Cəhanda istəyübən bulamazam
Qərəzsüz hökmedici bir əzizi.

Dönüb Ənqayə bulunmaz cəhandə,
Adından özgə xəlqə görə gözi.

Nə deyüb anladım hər bitəmizə,
Nə gündür yum deyəndə bana ruzi.

Məhəbbət şaniyəm anı hüviyyət,
Kimə desəm ki, etməyə sitizi.

Həqiqətdən kimə etsəm bəyani,
Məcazə qaçubən edər kərizi.

Nedim batin deyüb hər yola düşməz
Anıdan batil ilə Həqqdən izi.

Günəş kimi ciladır Rövşənidən
Çəkənə Gülşəninün izi tozi.

Dükənməz Rövşənidən Gülşəninün
Həqayiqdən rümuz ilə kənuzi.

* * *

397\. Ey aşiqlər, ey sadiqlər, sorun bana, netdim axı,
Könül ilə can verübən sevdügimə yetdim axı.

İstədügim bəndə imiş, bulalıdan bən sözini
Vəhdət elinə girübən bən kəsrətə atdım axı.

Birlik ilə diriləli bir görürəm ta ki vari,
Seçməyübən nəf'ü zəri bir-birinə qatdım axı.

Açılalı iki dükan, qılmaq içün ıssı ziyan,
Cənnəti-didarə rəvan bənsiz özüm satdım axı.

Heyrət bana bəndən, yoxluxluğu bənü səndən
Varlıx bulalı bibədən yox[luğu] unutdum axı.

Rövşənidən, ey Gülşəni, verəli dil canü təni,
Bildim nədir canlar canı, ər nəfəsin dutdum axı.

* * *

398\. Bənəm eşqün məhəbbətdən zühuri,
Müqəddəs Adəmün nurdan füturi.

Nə əvvəl, nə axır fitrətümə,
Ana nisbət bəyanumdur zəruri.

Nəfəxət fihi min ruhi dəmini
Biləndən sor müqəddəs bəndə nuri.

Müəllim Adəmin rəhmani elmin
Hüsuli deməzəm bilüb hüzuri.

Həqə nisbət irax-yaxın deməzəm,
Biləldən bir ana qürb ilə duri.

Sifətdir birdən iki vəchə görə
Müsəmmadan verən ismə müruri.



Verən ismə sifətdir an ilə şan
Bilinüb ana nisbət deyü huri.

Əhədin vəsfilə deməz "bəli"lər
Müsəmmadan nədir ismi-Səburi.

Soruban Rövşənidən, Gülşəni, bil
Nöşün az dedi Həqq əbdi-şükuri?

* * *

399\. Nə deyübən bildürəm qüdrəti-Həqq adəmi,
Nufixədən əqdəm olan sirri-dəmə həmdəmi.

Nəfxəyi min ruhina kim bilisər neydügin,
Qüdrəti-həqdən nədür olmıyubən həy dəmi.

Adəmə dəm nəfx edən dəmdən əzəl dəm nədir,
Həmdəm olan sirri-dəm qüdrət ilə əqdəmi.

Eşqi-məhəbbət dəmin birdən iki vəch ilə
Gör nəyimiş anlayın sirri i'lan bu dəmi.

İstəyübən bulmazam bu dəmdə həmdəm nedim,
Ta ki edəm dəm sifət sirri-qədəm məhrəmi.

Sirri-nəfəxt nədir kim bilisər olamadın
Vəhy ilə Ruhül-qüdüs nəfxəsinün Məryəmi.

Eşq ilə məhbubə sor sirri-məhəbbət nədir,
Ta ki deyə sevgüdən həqqə nəzər əkrəmi.

Eşq ilə pərvər bulan adəmi məhbub olur,
Ay ilə günəş sifət tabişi-hüsni səmi.

Eşqü məhəbbət sevüb sevdirir özin ana,
Kim keçər ol ikidən birlik ilədir həmi.

Rövşənidən eşq ilə pərvərişin bulmayan
Ay kimi gündən-günə nəqs ilə bulur kəmi.

Rövşənidən eşq ilə, Gülşəni, həmdəm olan
Bilür imiş sirr sifət dəmdən olan əqdəmi.

* * *

400. Nedim tərk etməyən qal ilə qili,
Çü anlamaz anunla hali-dili.

Münafiq, münkirün inkari halə
Nədir hüccət desün qaldan dəlili.

Dolupdur münkirün qəlbi mərizdən,
Demək səhhət bulur qalup əlili.

Sirati-müstəqimi qoyub ol gün
Edüpdür rahi-təfriqdən səbili.

Edər bətlan qalan halə höccət,
Deyüb həqq batilə bürhan dəlili.

Nədir inkardən özgə ol cilisün
İki aləmdə dil bilə dili.

Məhal anlar desəm halumi münkir,
Çü fərq etməz Mikayıldən vəkili.

Biləməzəm neçün münkir, münafiq
Səfhədən incidür əbdi-Cəlili.

Edən cəhl ilə qalin əhli-halə
Əziz ikən olur xəlqün zəlili.

Yələr yüz qapuyə bir ətmək içün
Maldan həris olub can ilə dili.



Qənaət etməyübən kəsrət istər,
Bəgənməz qisməti-Həqdən qəlili.

Eşitməz vəhy ilə həqqün kəlamın
Ki, zərraq olur rizqün kəfili.

Sığır kibi eşitməz münkir olan
Nida Həqdən ki, incitmən Xəlili.

Sor axı, Gülşəni, şəh Rövşənidən,
Nədür münkir olanın sanə dili?

* * *

401. Çü şeyx olmağ imiş başun sədayi,
Urub tərkin anun qıldım vədayi.

Neçün mütləq vücudum qeydə salım,
Olub çuban sifət heyvanə rayi.

Necə qoyun-quzu kimi eşitdüm
Xəvas ilə ədəmdən ma'i-mayi.

Tükənməz münkirün halümə qali
Həsədtən oluban qətlümə sayi.

Çü gördüm təhlükə qalumi qaldan,
Rəvan tərk eylədim andan mətayi.

Kimi bid'ət diləyir zikri-Həqqə,
Kimi mən' ediyir vəcdü səmayi.

Cədəldür münkirün işi Həqq ilə
Edübən daima batil nizayi.

Qaçurər Rüstəm ilə Zal edübən
Nedim münkir münafiq hər şücayi.

Görüb hər əbdi-bətni münkiri-dün
Edər köpək özündən ol ciyayi.

Eşitməz kər kimi əmrini Həqqün
Qulaği münkirün nəhy ilə dayi.

Dönüb heyvanə istər münkiri-xər
Sığır nisbət yətub-içmə məraği.

Sor axı Gülşəni, şəh Rövşənidən
Nə qeyd oldi sana mütləq vədayi.

Çü nəfs olur kəmaldan tərki-də'vət,
Səxin, nəqsün kəmalə etmə dayi.

* * *

402. Nedim surət urar mə'ni yoluni,
Çü sağdan fərq edər anun soluni.

Səğü sol birdürür mə'niyə nisbət,
İki surət edər birdən qoluni.

Tənindir görsədən birdən iki yüz,
Xələşdən zar edən dil bülbülüni.

Gülüstani-mə'anidə tikəndir
Ğəzaniçün həvasuz Düldülüni.

Məhəbbətdən yananun eşq oduna
Qılur rövşən gözün çak lö'lö'üni.

Satubən izzətin zilli-təmə'dən
Bəha alma rəvan nəqdün puluni.

Pəlas etmə libasın təlbis ilə
Qılub xirqə sana heyvan çuluni.



Əgər kisvət pəlas olaydı şeyxə,
Anunla şeyx olurdi at quluni.

Günəş nisbət ziyayi-Rövşənidən
Geyən kisvət çıxarmazmış dilüni.

Nedim, ey Gülşəni, şah Rövşənidən
Seçən bilməz nədir şəhdən quluni.

* * *

403. Nedim sirrim xəfi ikən bəyanımdan əyan oldu,
Məhəbbət eşqilə halım xəfi sirrdən bəyan oldu.

Dönüb Məcnunə Leylidən bilindi neydügin halım,
Məqali-eşq içün andan cünunum tərcüman oldu.

Qılalı mə'rifət əbkəm lisanım nitqi-eşq içün
Sükutum ol bəyan ilə məhəbbətdən ziyan oldu.

Müvəddət nitqidir neyçün bəyani-eşq ilə natiq,
Kəlami-nəfsi ol dildən müqəddəs ruhi-şan oldu.

"Ələst" ilə "bəli" nitqi uraldan söylənür eşqün,
Məhəbbətdən cəvab ilə sualə çünkim an oldu.

Nədür vəch ilə ilhamın dili eşqi-məhəbbətdən
Ki, andan ənbiya nisbət, vəli, natiq misal oldu.

Eşidübən fəbi nitqi-məhəbbətdən nədür anla
Ki, ol nitqi-məvəddətdən bəyani-dil rəvan oldu.

Nə əvvəl var, nə xud axır məhəbbətdən o nitq içün,
Əgərçi əvvəlü axır anınçün "kün fəkan" oldu.

Zəman ilə məkan olmaz ona "lövlak"ə nisbətdən
Xəlaiylə məla ana zəmansüz laməkan oldu.

"Hüdus ilə qidəm nitqin eşidürəm" – deyən cahil,
Yəqindən elm ilə demək, o, şəksüz bigüman oldu.

Necə faş edəsən sirri məhəbbətdən olub tanıq
Ki ondan Gülşəni nisbət bəyanın cavidan oldu.

Nedim, ey Gülşəni, qalun mükərrər şəkkərə bənzər
Ki, şirin ol məqalından məzaqım cani-can oldu.

* * *

404. Bağar eşqün məhəbbətdən zühuri,
Əzəlsüz biəbəd qüdrət füturi.

Mükərrər sanmayasız eşqə nisbət
Tükənməz dövr ilə eşqün süduri.

Nədir bənsüz məvəddət vəchinə an
Bana dövran olan fərdən qəruri.

Məhəbbətdən nedim bənsiz, bilinməz,
Nədür eşq ilə dövranın süruri.

Bana birdən ikidir müşkül olan,
Nəzərdən həll içün elmi-zəruri.

Sübutum məhv ilən dəm biləməzəm,
Nədür elmi-hüsulimün hüzuri.

Biləməzəm nədəndir eşqə nisbət
Behiştü Ədn ilə qılmanü huri.

Ədəm nisbət vücudimlə bilinməz
Nədir yaxın-irax, nəzdikü duri.

Nə bilür yoğ olan varlıqla, nədür
Məhəbbət eşqilə matəm süruri.



Sor axı, Gülşəni, şəh Rövşənidən,
Nədir Aydın günəşdən narü nuri?

Bilindi Rövşənidən Gülşəniyə,
Kim imiş münkir olan gözlü kuri.

* * *

405. Eşq bənim bənligüm alalı bildim ani,
Bulmadım itürmədən anı, bən ilə səni.

Bənlə sən eşq ilə, sığmaduğin rəşk ilə,
Bildim olalı belə sevmədigin sən bəni.

Varlığını yoğ edən, fəqr ilə gəlüb gedən,
Bilür imiş kim, nədən eşq ğənidir ğəni.

Eşqə könül verməyən bilməz eşidüb inan,
Neydügin ol cani-can cüz'-küllə verən cəni.

Sözüm eşit, can ərin keyfini, eşqün soran,
Sən sənə sənsüz yürən eşq ilə eşqi təni.

Eşqi qılana tələb, mehr ilə den lütfi-Rəbb,
Eşq kimi əbul-əcəb sadəvü zəngin xəni?

Rövşənidən görmədin biləmədim, Gülşəni,
Eşqə könül verübən diri ikən öləni.

* * *

406. Ey novbahari-hüsnün gülşəndə novbahari,
Nərgis kimi əlündən qoyma yerə əyaği.

Al yənağun görəldən gülşəndəki qızıl gül,
İçi yanub o yüzdən canına qoydi daği.

Hüsnün cəhan qəzasın cənnətsifət qılıbdır,
Vəchün görəndir edən cənnət bu səhi bağı.

Gülşəndə mehrün ilə od kimi qızarub gül,
Gün kimi görsədə yer dağımdan bin çirağı.

Yerün yüzi saçından bəzəndi bəzmün içün
Döndərübən otağa zinətlə lalə dağı.

Yerün yüzi səninçün bəzəndi düşünübən
Ta gün kimi dutalu sənün içün otağı.

Gün kimi Rövşənidən, ey Gülşəni, ziyavəş
Pərvər bulalı oldun Aydın eli çirağı.

* * *

407. Can verübən görmiyən eşq ilə didarini,
Sürünübən canının bilmədi miqdarini.

Yusifinə verməyən nəqdü rəvanın bəha,
Bilmədi eşqün nədür candakı bazarini.

Canü cəhan tərkini urmuyana eşq ilə
Biləmədi deməgə fərq yar ilə əğyarini.

Eşqə "bəli" deyenün başına yağsa bəla,
Deməgüz inkarinə, tərk edə iqrarini.

Mehr ilə pərvanəvəş yandurəli canumi
Bildim ol odun nədür nurə görə narini.

Aqilə aşiq halın dilə gəlüb söyləsəm,
Arturuləm münkirün halına inkarini.

Elmi-lədun hikməti arifün əhvalıdır,
Cahil olan anlamaz aləmün əqvalini.

Seyri-süluk etməyən eşq ilə hal anlamaz,
Anun içün qal edər halətün ətvalini.

Rövşəninün pəndidir Gülşəniyə dəmbədəm,
Münkirə faş etməgil arifin əsrarini.



* * *

408. Ey bixəbər, bu dəmdən dirilübən dəmi duy,
"Sirri-nəfəxt"dən heyyi, qüdrətdən Adəmi duy.

Surət degil dirilən "min ruhinə" dəmindən,
Mə'nidən adəm olub, o dəmlə həmdəmi duy.

Dəmdən dirilən adəm həmdəm olur dəm ilə,
Bulub həyatun andan, anunla məhrəmi duy.

"Gənci-xəfi" demişəm sirri-iradət ilə
Ol dəm nə sirrdən imiş qüdrətdən iqdami duy.

Dəmdən bulan həyatın dəmdür rəvani-bikeyf,
Misri sifət o dəmdə rəmz ilə mədğəmi duy.

Zahir vücudi-batin biəvvəl axır ikən,
Qüdrətlə məbdə olan hikmətlə xatəmi duy.

Dəmdir məhəbbət ilə qüdrəti-vücudi-bikeyf,
Eşq ilə dövr edən dəm hikmətlə dirhəmi duy.

Dəmdən budur vücudi-mə'dumi-cudə nisbət
Fəqrün qənisi olub mövcudə Hatəmi duy.

Dəm elmidir hüzuri insan olana Həqdən,
Tərki-xüsul edübən elm ilə ə'ləmi duy.

Ruhül-qüds dəmindən zində Məsihi nisbət
Olubənü o dəmdən nəfx ilə Məryəmi duy.

Ey Gülşəni, nə dəmdən qəlbünə daxi nisbət
İrişdi Rövşəni san sirrilə, məhrəmi duy.

1. *Kün* – Quran Allahın "Ol" əmri ilə varlıqları yaratması. (Yasin, 82)
2. *Küntü nəbiyyən* – Mən Peyğəmbər idim.
3. *Ə'ruci qabe qövseyn* – Qabe qavseynə yüksəldim. Peyğəmbərin (s) Merac səfərində Allaha iki qövs (kaman) qədər yaxınlaşması.
4. *Sirri lövlak* – Allahın Peyğəmbərə (s) "Əgər sən olmasaydın aləmləri yaratmazdım" qüdsi hədisə işarədir.
5. *Küntu-kənzən* – Allahdan Peyğəmbərə (s) vəhy olunan "Mən gizli bir xəzinə idim..." qüdsi hadisə işarədir.
6. *"Nəfəxtu fihi min ruhi..."* – "Ona öz ruhumdan üfürdüm..." Allahın Adəmi yaradıb ruh verməsini ifadə edir (Quran, Əl- hicr, ayə 29).
7. *Darül-Xulud* – Axirət evi, əbədi qalacaq yer, cənnət.
8. *Vərhəm* – "Rəhm et" [bizə] Quran ayəsiylə duaya işarədir.
9. *Bəla* – "Ələstu birəbbikim? Qalu: – Bəla!" – "Mən sizin rəbbiniz deyiləmmi?" Dedilər: – Bəli." Allahın əzəldə ruhlardan aldığı əhdi (misaq)ı, ifadə edən Quran ayəsinə işarədir.
10. *Səbül-məsani* – "yeddi qoşalar". Quranın "Fatihə" surəsinin yeddi ayəsinin təkrarlanması – namaz oxunması mənasındadır.
11. *"Ələm nəşrəhləkə sədrək"* – İnşirah surəsinə (ayə 1) (sənin köksünü yarmadıqmı?) Hz. Məhəmməd balaca ikən mələk gəlib onun köksünü yarmış və qəlbini təmizləyib Peyğəmbərlik sirləri ilə doldurmuşdur.
12. *Lillahi ə'la mə'luhu* – Bütün varlıqlar Allaha aiddir.
13. *Fi və ən billahi vəchum* – Ondandır və Allahdan sifət (surət) tapandır.
14. *Qul lən yusibəna* – "De heç vaxt bizə Allahın nəsib etdiyindən qeyri bir ziyan dəyməz".
15. *Ənəl eşq* – "mən eşqəm"
16. *Ulul əbsar* – bəsirət (yüksək ağıl və düşüncə) sahibləri
17. *Fəbi yəntəq* – Nitq ilə (məntiqlə) danış (cavab ver).
18. *Əvhi la xovfun ələyhim* – "Bildir (ki): Onlara heç bir qorxu yoxdur!" (Quran ayəsi).
19. *Kə ovliyaullah* – Allahın övliyaları kimi
20. *Leysə fid-dar* – evdə deyil (klassik ədəbiyyatda "evdə ev yiyəsindən başqası yoxdur" mənasında da işlənir).
21. *Əl minnətu lillahi* – Minnət sadəcə Allahadır.
22. *Min ladun* – onun (Allahın) "yanından Allahdan gələn geybi elm, elm-i ledun, ilham.
23. *Əllemehül-əsma* – Adları (isimləri) ona öyrətdi: Allah Adəmə əşyanın adlarını tə'lim etdi (Bakara, 31).
24. *Mən Rəbbükə?* – Rəbbin kimdir? (qəbirdə verilən sual).
25. *Qəd həyyəkum nuru min Allahi* – "Allahdan olan nur sizi diriltdi".



# LÜĞƏT

## A

*Ab* – su
*Abad* – gələcəkdə sonu olmayanlar, həmişəlik olanlar
*Abdal* – dərviş, qələndər
*Abdar* – sulu, məlahətli
*Abdəst* – namazdan qabaq əl-üzünü yuma, dəstəmaz
*Abid* – ibadətlə məşğul olan
*Abi-heyvan* – dirilik suyu
*Abü gil* – aləm, dünya; su və torpaq
*Abü həva* – iqlim
*Abü tab* – təmtəraqlılıq, dəbdəbəlilik
*Ac* – fil dişi; şirmayı
*Ad* – günahlarına görə Allah tərəfindən cəzalandırılmış qəbilənin adı
*Adab* – ədəb; qayda-qanun, tərz, üsul
*Add* – bədbəxtlik, kədər, böyük təhlükə
*Adəm* – dinlərə görə yer üzərində ilk insan, ilk peyğəmbərin adı
*Adil* – ədalətli, insaflı, düz iş görən
*Afaq* – üfüqlər
*Agah* – xəbərdar; gözüaçıq
*Ağaz* – başlama, başlanğıc
*Ağuş* – qucaq
*Akil* – yeyən, yeyici
*Aqibət* – son nəticə, nəhayət
*Al* – qırmızı; yalan, hiylə
*Al* – ocaq, nəsil; sülalə, bir nəsildən olan adamlar
*Aləmara* – aləmi bəzəyən, gözəl
*Ali-əba* – İslam dininə görə peyğəmbərin ailə üzvləri; özü ilə bərabər ocağına mənsub olan beş nəfər
*Altun* – qızıl
*Amm* – kütlə, xalq, kütləvi; avam, qara camaat; seyid olmayan, Məhəmməd (s) nəslindən olmayan
*Anəstu narən* – odu tapdım (Musanın Turi-Sinanda od tapması ayətinə işarədir)
*Ara* – bəzəyən, zinətləndirən, şənləndirən
*Ari* – təmiz, saf; çılpaq, yalın; boş, məhrum
*Arif* – bilən, bilik sahibi; tanıyan
*Arıtmaq* – təmizləmək, arıtmaq, paklaşdırmaq
*Asa* – dinc, rahat
*Asi* – itaət etməyən; üsyançı; günahkar; özündən çıxan, coşan
*Asif* – kəskin, güclü külək
*Asim* – ismətli, namuslu
*Assi* – xeyir, fayda, mənfəət
*Aşam* – "aşamidən" felinin indiki zamanı; içən
*Ati* – gələcək, gələcək zaman
*Atil* – tənbəl, ətalətli
*Avaz* – səs, səda
*Avər* – gətirici, gətirən
*Aviz* – asılan, asılı
*Ayas (Ayaz)* – aydın
*Ayat* – ayələr
*Ayəndə* – gələn, gələn və gedən
*Azər* – od; atəşgədə; atəşgah; oda qulluq edən mələk
*Azuq* – azuqə
*Azürdə* – incimiş, əziyyət görmüş, qəmli

## B

*Bab* – qapı
*Bad* – külək, yel; boş yer, yox olma; məhv olma

*Badə* – çaxır, şərab; şərab piyaləsi
*Bak* – qorxu, xov; çəkinmə, ehtiyat
*Baqi* – qalan; daimi, həmişəlik, əbədi
*Baş* – yara, çiban
*Başəd* – ola bilər, ola bilsin, ehtimal
*Batin* – iç, iç üz, iç tərəf; gizli, açıq olmayan
*Bay* – varlı, dövlətli
*Baz* – müəyyən bir işin və ya şeyin həvəskarı, düşkün
*Baz* – şahin, tərlan
*Bazicə* – oyuncaq
*Bey'ü şera* – alqı-satqı, ticarət
*Bə'd* – sonra
*Bəd* – pis, yaman
*Bədəl* – əvəz, bir şeyin yerini tutan, onu əvəz edən şey
*Bəqa* – daimilik, əbədilik
*Bəqər* – qaramal, inək
*Bəlağ* – xəbər vermə, bildiriş; rəsmi məlumat
*Bərxudar* – xoşbəxt, arzusuna yetişən
*Bəsan* – kimi; oxşar, bənzər, tək, təki
*Bəşər* – insan, adam // insanlar, adamlar
*Bətalət* – işsizlik, bikarlıq, tənbəllik; bihudəlik
*Bətlan* – yalançılıq, sadiq olmamaq
*Bi* – farscada sözlərin əvvəlinə gətirilərək inkar bildirən ön şəkilçisi; ərəbcədə isə "ilə" mənasında işlənir.
*Bibak* – qorxusuz, qorxmayan
*Bigi* – kimi, təki
*Bixəfa* – qorxusuz
*Bilad* – şəhərlər, ölkələr
*Biliş* – bilik, mə'rifət
*Biliş* – qohum, yaxın,
*Bilməcə* – tapmaca
*Biməmat* – ölümsüzlük
*Bud* – varlıq, həyat
*Buqul* – göyərti (yeməli)
*Bul-füzul* – lüzumsuz və fəzlə söz danışan, boşboğaz
*Bulmaq* – nail olmaq, tapmaq, əldə etmək
*Büxl* – paxıllıq, xəsislik, simiclik
*Bülənd* – yüksək, uca
*Bün* – çətinlik
*Bünyad* – özül, kök, əsas, bina, təməl
*Büraq* – İslam əsarətinə görə Məhəmməd peyğəmbərin (s) me'rac gecəsi mindiyi adambaşlı və atbədənli bir varlığın adı
*Bürhan* – dəlil, isbat, sübut
*Bürran* – kəsici, iti
*Bürudət* – soyuqluq, soyuq; münasibət və əlaqədə sərinlik
*Büryan* – yanan, yanmış
*Büt* – bütpərəstlərin ibadət etdikləri rəsm və ya heykəl, sənəm; gözəl
*Bütlan* – yalançılıq, əhəmiyyətsizlik, sadiq olmamaq
*Büzurg* – böyük

## C

*Ca* – məkan, məhəl
*Cah* – yer; mənsəb, məqam, rütbə
*Came'* – toplayan, cəm edən; yekun
*Camid* – donmuş, donuq; inkişaf etməyən
*Canib* – yan, tərəf, cəhət
*Carub* – süpürgə
*Cəbin* – alın
*Cəd* – çalışma, can atma
*Cəmmazə* – iti gedən dəvə



*Cərr* – özünə doğru çəkmə, cəlb etmə, dartma, çəkmə
*Cəşn* – şadlıq, şənlik, qonaqlıq məclisi, bayram şadlığı
*Cibal* – dağlar
*Cifə* – leş, qoxumuş cəmdək; sərvət, var-dövlət
*Cim* – ərəb əlifbasında "c" hərfinin adı
*Cud* – comərdlik, əliaçıqlıq
*Cüda* – ayrı, başqa
*Cünbində* – yeriyən, hərəkət edən, yellənən
*Cünbiş* – hərəkət
*Cür'ə* – bir udumda içiləcək şey, bir qurtum içki
*Cürm* – günah, təqsir
*Cüstü cu* – axtarma, araşdırma

## Ç

*Çah* – quyu; çənə çuxuru, zənəxdan
*Çaharyar*–(4 yoldaş) – Məhəmməd peyğəmbərin dörd yaxın dostu və silahdaşı Əbubəkr, Ömər, Osman, Əli
*Çak* – yırtıq, cırıq
*Çakər* – nökər, qulluqçu, kölə
*Çalak* – cəld, çevik, tələsik
*Çapuk* – cəld, iti, yeyin
*Çar* – dörd; fəlsəfədə dörd ünsür (torpaq, su, hava və od)
*Çəlipa* – xaç
*Çənd* – neçə, neçə dənə
*Çəri* – əsgər, qoşun
*Çizginmək* – dairəvi hərəkət etmək, nəyinsə çevrəsinə dolanmaq
*Çovgan* – keçmişdə atla oynanılan top oyunu; həmin oyunda topu vurmaq üçün başı əyri uzun ağac
*Çub* – ağac, taxta, əl ağacı
*Çunü çəra* – ("niyə və necə deməklə səbəb soruşma") boş danışıq, yorucu söhbət

## D

*Dal* – ərəb əlifbasında "d" hərfinin adı
*Daniş* – bilik, elm, məlumat
*Danla* – sabah
*Dara* – sahib, malik, malik olan
*Dəğa* – hiylə, xəbislik; hiyləgər, xəbis
*Dəqaiq* – dəqiqələr
*Dəqq* – çalma, döymə, vurma
*Dəlürmək* – dəli olmaq, ağlını itirmək
*Dəm* – göz yaşı; an, vaxt
*Dəman* – güclü, qüvvətli, dəhşətli, vaxt
*Dərhəm* – qarma-qarışıq, başayaq, alt-üst; kədərli, kədərlənmiş
*Dəst* – əl
*Dəvab* – heyvanlar, minik və yük heyvanları
*Dəvvar* – dövr edən, daima dolanan
*Dulab* – su çarxı, quyudan su çəkmək üçün çarx
*Dun* – alçaq, rəzil; aşağı
*Dur* – uzaq
*Duruşmaq* – çalışmaq, səy etmək
*Duş* – çiyin
*Duzəx* – cəhənnəm
*Dü* – iki
*Düxul* – daxil olma, girmə
*Dün* – gecə
*Dürr* – inci
*Dürüğ* – yalan
*Düş* – yuxu
*Düşnam* – söyüş, söymə
*Düşvar* – çətin

## E

*E'lal* – ərəb dilində saitlərin yerinin dəyişməsi
*Edisər* - edəcək
*Eşik* – qapı önü, astana, həyət
*Etmək* (edmək) – söyləmək, demək
*Eyb* – nöqsan, təqsir
*Eyd* – bayram
*Eyn* – ərəb əlifbasında hərfin adı
*Eyn* – göz; çeşmə, bulaq
*Eyzən* – yenə, elə, həmçinin

## Ə

*Ə'da* – düşmənlər
*Ə'ma* – kor, nadan
*Əbd* – qul, kölə
*Əbdal* – əvəz, əvəz edən şeylər
*Əbid* – qullar, kölələr
*Əbkəm* – dilsiz, lal
*Əbqa* – tərk etmə, uzaqlaşma
*Əbr* – bulud
*Əbrar* – doğruçu adam; nəcib adam, müqəddəs adam
*Əbru* – qaş
*Əcz* – acizlik, bacarıqsızlıq, taqətsizlik
*Əda* – tərz, üslub
*Ədd* – sayma, hesablama
*Ədəm* – yoxluq, olmama
*Ədn* – cənnət
*Ədu* – düşmən
*Əfif* – namuslu, təmiz, saf
*Əğləb* – daha qüvvətli
*Əxyar* – hami, xeyirxah
*Əjdər* – əjdəha
*Əkbər* – böyük, ulu
*Əklü şürb* – yemək-içmək
*Əkrəm* – kəramətli, comərd
*Əqaid* – əqidələr
*Əqdəm* – daha qədim olan, ən əvvəl gedən, ən qabaq olan
*Əqəl* – ən kiçik, ən azı
*Ələf* – quru ot
*Ələm* – kədər, dərd, əzab
*Ələm nəşrəh* – Quranın Əl-İnşiraq surəsinin başlanğıcı; aydın; açıq, bəlli; hərfi mənası – biz yarıb açmadıqmı?
*Ələn* – açıq, aşkar, aydın
*Əl-ğiyas* – kömək edin! köməyə!
*Əlhəmdülillah* – Allaha həmd olsun, şükür Allaha
*Əlif* – ərəb əlifbasında birinci hərfin adı və əbcəd hesabında bir rəqəmin işarəsi
*Əma* – korluq, nadanlıq
*Əməm* – kar
*Əmləh* – çox məlahətli, duzlu, gözəşirin
*Əna* – yorğunluq, zəhmət, məşəqqət, əziyyət
*Ənasir* – ünsürlər (qədim alimlərin fikrincə bütün təbiət hadisələrinin əsasını təşkil edən və tərkib hissələrinə ayrılmayan torpaq, su, od və hava)
*Ənbaz* – ortaq, şərik
*Ənbiya* – peyğəmbərlər, nəbilər
*Əncüm* – ulduzlar
*Əndəlib* – bülbül
*Ənduh* – qəm, qüssə, kədər, qayğı
*Ənduxtə* - əldə edilmiş, xəzinə
*Ənəlhəqq* – "mən Həqqəm!", "mən Allaham!" (məşhur sufi mübəlliğlərindən Mənsur Həllacın dara çəkilərkən söylədiyi sözdür)
*Əngur* – üzüm
*Əngüşt* – barmaq



*Ənid* – inadçı, tərs, hacət
*Ənidə* – kobud, kəskin, sərt
*Ənis* – yaxın adam, yoldaş, həmdəm
*Ənqa* – Qaf dağında yaşayan əfsanəvi bir quş
*Əpsəm* – səssiz, dinməz, lal; kiri, sus!
*Ər* – "əgər"in qısaldılmış forması; kişi, adam
*Ərən* – ərkən, igid, ər
*Ərənlər* – təcrübəli, gün görmüş, ağıllı adamlar
*Ərər* – ardıc kolu; sərv, sərv ağacı
*Əraz* – təsadüfi hadisə, əlamət
*Ərş* – göy səma
*Ərus* – gəlin
*Ərzan* – ucuz
*Ərzü səma* – yer-göy
*Əsafil ("əfsəl"in cəmi)* – alçaqlar
*Əsas* – gecə qarovulçusu
*Əsb* – at
*Əsfəl* – ən alçaq, lap aşağı
*Əsfiya* – "səfi"nin cəmi
*Əsrük* – sərxoş, məst, kefli
*Əşrar* – ("şərir"in cəmi) pis şeylər, yaman adamlar
*Əta* – vermə, bağışlama
*Ətqiya* – Allahdan qorxanlar, dindarlar, möminlər
*Ətvar* – tövrlər, vəziyyətlər
*Əya* – ey!
*Əyan* – gözlə görünən, aşkar, aydın, zahir, bəlli
*Əyu* – yaxşı
*Əza* – incitmə, əziyyət, cəfa; zərər, ziyan
*Əzhar* – çiçəklər, güllər
*Əzhər* – aydın, aşkar, bəlli
*Əzrəq* – göy rəng, mavi

## F

*Fariğ* – boş, asudə
*Fariğülbal* – ürəyi asudə, könlü rahat; dinc, qayğısız
*Fariq* – ayıran, fərqləndirən, təfavüt qoyan, ayırıcı
*Fatir* – yaradan, xəlq edən
*Fəda* – qurban; əvəz
*Fəğfur* – çini, farfor; Çin imperatorunun titulu
*Fəlah* – müvəffəqiyyət, səadət, xoşbəxtlik
*Fər'* – budaq, qol-budaq
*Fərəc* – sevinc
*Fərr* – parlaq işıq, nur, aydınlıq
*Fi* – ərəb əlifbasında "f" hərfinin adı
*Fiqh* – şəriət məsələlərindən bəhs edən dini elmlərdən biri
*Firaq* – ayrılıq, hicran
*Fövq* – üst, yuxarı
*Fühul* – görkəmli adam, tanınmış
*Fürqan* – ayırma, ayırd etmə
*Füsul* – "fəsl"in cəmi, ayırma, bölmə
*Fütur* – boşalma, süstlük; usanma, təngə gəlmə, bezikmə
*Füzul* – artıq, lazımsız söz və ya şey

## G

*Gahi* – arabir, hərdənbir
*Gav* – öküz, inək
*Gəbr* – atəşpərəst
*Gəhl* – gözə sürmə çəkmə
*Gənc* – xəzinə, dəfinə
*Gənduzin* – özünü
*Gəndüm* – buğda
*Gərdun* – dolanan, dönən; fələk, tale; göy

*Gərdü qubar* – toz-torpaq
*Gərm* – isti, qaynar
*Gərmü sərd* – isti-soyuq
*Giryan* – ağlayan
*Gu (y)* – de, söylə, danış; deyən
*Guy* – top, kos
*Gülgun* – gül rəngli, qızılgül rəngində olan, al
*Gülriz* – gül saçan, gül yağdıran
*Gümrah* – yol azmış, yol itirmiş adam; doğru yoldan çıxmış, azğın, bədəncə sağlam
*Gürd* – igid, pəhləvan, qəhrəman
*Gürg* – canavar, qurd
*Güruh* – camaat, böyük dəstə
*Güşad* – geniş, açıqlıq
*Güvah* – şahid, şahidlik
*Güz* – payız
*Güzidə* – seçilmiş, bir şeyin ən yaxşı qismi
*Güzin* – seçən, ayırıb bəyənən

## H

*Halik* – məhv olan, həlak olan
*Həba* – narın; toz; bihudə, əbəs
*Həbt* – qovulmaq, zəhməti zay olmaq
*Hədda* – dəmirçi
*Həmaqət* – axmaqlıq, səfehlik
*Hərir* – ipək, ipək parça
*Həsud* – həsəd aparan
*Həyy* – diri, canlı
*Həzar* – bülbül
*Həzl* – zarafat, lətifə, hənək, zarafatla deyilən söz
*Hicab* – pərdə, örtük; utanma, utancaqlıq
*Hidayət* – doğru yol tapma; rəhbərlik
*Hin* – vaxt, zaman, çağ
*Hirman* – məhrum olma, əli üzülmə; qovulma, xaric olma
*Hu* – O (Allah)
*Hüccət* – sübut, dəlil
*Hüda* – doğru yol
*Hüdhüd* – şanapipik
*Hüllə* – ağuş
*Hülul* – girmə, daxil olma; gəlib çatma, yetişmə
*Hüsul* – hasil olma, ələ gəlmə

## X

*Xab* – yuxu, röya
*Xaçan* – nə vaxt, nə zaman
*Xanı* – hanı
*Xarü xəs* – çırpı, çör-çöp
*Xasir* – yoldan azan; uğursuz
*Xass* – xüsusi, ayrıca, əlahiddə
*Xassü am* – qocalardan tutmuş uşaqlara qədər; hamı
*Xavər* – şərq, günçıxan, gündoğan
*Xədd* – yanaq, üz
*Xəfi* – gizli, məxfi
*Xəla* – boşluq
*Xəlt* – qarışdırma; rabitəsiz danışma, münasibətsiz söz söyləmə
*Xəm* – bükülmüş, əyilmiş, qıvrım, buruq
*Xəndan* – gülən, gülər; gülə-gülə, gülərəm; tamam açılmış gül
*Xirqə* – bez və ya qumaş parçası; dərvişlərin geydikləri üst paltar
*Xu* (xoy) – xasiyyət, qılıq
*Xub* – yaxşı; gözəl, qəribə
*Xun* – qan
*Xunriz* – qantökən, zalım, qəddar
*Xüld* – həmişəlik, əbədilik, cənnət, behişt



*Xülud* – əbədilik, ölməzlik, əbədi həyat
*Xüm* – küp
*Xürd* – kiçik, balaca; narın

## İ

*İbha* – daimiləşdirmə; əbədiləşdirmə, olduğu kimi saxlama
*İftirah* – başlanğıc, açılış
*İftiraq* – ayrılma, fəraq
*İxfa* – gizlətmə
*İxlal* – rəxnə salma, pozma, xələl qatma
*İxlas* – təmiz məhəbbət
*İxvan* – qardaşlar
*İkmal* – kamala çatdırma, tamamlama, bitirmə
*İqan* – yəqin etmə
*İqd* – boyunbağı; düzülmüş inci, cavahir və s.
*İqsam* – and içmə; andı qəbul etmə
*İqtiza* – vacib, lazım
*İla* – bəzi ərəb sözlərinin əvvəlinə gələrək -qədər, dək, cən mənasında işlənən qoşma
*İlah* – Allah, Tanrı
*İlla* – ...dən başqa, ...dən savayı, yalnız
*İltiqa* – dolaşıqlıq
*İltiza* – qoparma, çıxarıb atma
*İma* – işarə ilə anlatma
*İmamət* – imamlıq etmə, məzhəb işlərinə rəhbərlik etmə
*İnfisal* – ayrılma, uzaqlaşma, çıxma
*İnşirah* – şənlik, şadlıq, məmnunluq
*İntəha* – sona çatma, axıra yetişmə; tükənmə, bitmə, son, axır, nəhayət
*İrfan* – bilmə, xəbərdar etmə; təsəvvüfdə Allahı dərk etmə
*İrişmək* – yetişmək, çatmaq
*İrsal* – göndərmə, yollama
*İsfənd* – üzərlik
*İsma* – eşitdirmə, dinlətmə
*İssi* – sahib, yiyə, malik
*İstiğna* – əlindəki ilə kifayətlənmə, qane olma
*İstiğran* – batma, qərq olma, dalma
*İstima'* – dinləmə, eşitmə, qulaq asma
*İstirca'* – qaytarma, geri çağırış; qayıtmasını (qaytarılmasını) istəmə
*İstiva* – taraz olma, müvazinətdə olma
*İşbu* – işarə əvəzliyi
*İştiyaq* – arzu etmə, şikayətlənmə
*İtfa* – söndürmə, odu keçirmə
*İtmam* – tamamlama, axıra çatdırma, sona yetirmə
*İttiqa* – saqınma; qorxu, çəkinmə, ehtiyat; özünü qoruma, özünü gözləmə
*İttiqan* – qətiyyətlə inanma
*İttila* – xəbərdar olma, agah olma
*İttisal* – bitişmə, yapışma
*İzəd* – zərdüştilərdə xeyir və nur allahı; iranlılarda Allah, Tanrı
*İzz* – izzət, əzəmət, şan, ləyaqət

## J

*Jalə* – şəbnəm, şeh

## K

*Kaf* – ərəb əlifbasında "K" hərfinin adı
*Kafü nun* – "künfəykün" sözünün qısaldılmış forması, "kaflə nun" kimi də işlədilir
*Kar-bar* – iş-güc

*Kasəlis* – kasa yalayan
*Ketman* – gizləmə, gizlətmə
*Keyvan* – süheyl ulduzu; yüksəklik
*Kəc* – əyri, əyilmiş; səhv, xəta
*Kəlağ* – ala qarğa
*Kəlb* – it
*Kəlim* – müsahibə, söhbət edən
*Kəm* – əskik, nöqsan; pis, yaman; az
*Kənz* – xəzinə, dəfinə
*Kəşti* – gəmi
*Kibi* – kimi
*Kibriya* – böyüklük, calal
*Kirdigar* – Allah, xaliq
*Kisvət* – paltar, üst-baş; qiyafə, zahiri görkəm
*Kizb* – yalan
*Kövdən* – yabı; anlamaz, qanmaz, nadan
*Kövn* – olma, əmələ gəlmə, var olma
*Ku* – harada? Hanı?
*Kuf* – dağ
*Kus* – böyük təbil, nağara
*Kustax* – arsız, sırtıq, üzlü, utanmaz
*Kusuf* – günəşin tutulması
*Kuzək* – uşaq
*Küfr* – kafirlik, Allaha inanmama
*Küll* – çoxlu, bol, bolluca
*Kün* – ərəbcə "kanə", farsca "kərdən" felindən: "ol"
*Kün-fəkan* – dünya, aləm
*Kün-fəyəkun* – dini bir təbir olub, məcazi mənada "xaraba", "alt-üst", "darmadağın" yerində işlənir.
*Künh* – bir şeyin sonu, ən son nöqtəsi; fəlsəfədə mahiyyət
*Küş* – öldürən, öldürücü

## Q

*Qabil* – qəbul edən, mümkün ola bilən
*Qaqmaq* – vurmaq, çırpmaq
*Qaliyəbu (ğaliyəbu)* – ətirli
*Qalü qil (qiylü qal)* – qalmaqal, səs-küy, hay-küy
*Qəbz* – tutma, ələ alma
*Qəlil* – az
*Qəllaş* – dərbədər, ədəbsiz, hiyləgər
*Qəltan* – diyirlənən; yuvarlanan; yumru, girdə, dəyirmi, bulanan
*Qəni (ğəni, ğəna)* – dövlətli, malik, zəngin
*Qərin* – yaxın, qohum; tay, oxşar
*Qətət* – itiləmək
*Qina, ğina* – kifayətlənmə, qənaətlənmə; varlılıq, zənginlik; sərvət, dövlət
*Qövl* – söz, danışıq
*Qövm* – bir nəsildən olan
*Quqnəs* – feniks (əfsanəvi quş)

## L

*La (lə)* – ərəbcə sözlərin əvvəlinə gətirilən inkar şəkilçisi olub bir şeyin yoxluğunu bildirir
*Lacəram* – şübhəsiz, əlbəttə
*Laəqəl* – heç olmazsa, az da olsa
*Lafü kəzaf* – hap-gop, bihudə söz
*Lağər* – arıq, ətsiz-cansız, zəif
*Lahiqə* – bir şeyin sonuna əlavə edilən digər şey, əlavə
*Lailah* – (Qurandakı "La-ilahə-illəllah" ifadəsinin qısaldılmış forması) Allahdan başqa Allah yoxdur
*Lam* – ərəb əlifbasında "l" hərfinin adı



*Laməkan* – yersiz, yurdsuz, məkanı olmayan; fəlsəfədə: məkan xaricində olan
*"La şey"əm* – şey (əşya) deyiləm
*Layə'qəl* – ağlı başında olmayan, ağılsız, divanə, dəli
*Layəzal* – həmişəlik, əbədi
*Leyk* – lakin
*Leyl* – gecə
*Lə'b* – oyun, əyləncə, oyuncaq
*Lö'bət* – oyuncaq
*Lə'n (ət)* – qarğıma, nifrin, qarğış, lənətləmə
*Ləc* – tərslik
*Ləduniyyət* – ilahiyyət elmi
*Ləgəd* – şıllaq, təpik
*Lək* – yüz min
*Ləmyəzəl* – həmişəlik, əbədi
*Ləntərani* – (Quranda Allahın Musa (ə) peyğəmbərə xitabən bildirdiyi bir ayədən) "Məni görə bilməzsən" mənasında işlənən ifadə
*Ləvhü lə'əb* – oyun, əyləncə, faydasız iş
*Liqa* – üz, çöhrə, sima; görüş, rastlaşma
*Lil əcəb* – çox təəccüblü
*Lisan* – dil
*Löv* – əgər
*Lövn* – rəng, boya

## M

*Ma* – inkar bildirən ön şəkilçisi; o ki, o şey ki; hələ, o qədər? Nə? (sual əvəzliyi)
*Ma* – su
*Mabəşi* – qalıq
*Mafat* – itirilmiş, yox olmuş, puç olmuş
*Mafiha* – onda olan şey, onda nə ki var, onda olan bütün şeylər
*Maivü məni* – xudpəsəndlik, xudbinlik
*Malamal* – lap dolu, dopdolu
*Manənd* – bənzər, oxşar, tay, kimi
*Masəva* – nə isə başqa, nədənsə, ayrı, yalnız
*Maü tin* – su ilə çamır (torpaq), insan
*Mazi* – keçən, keçmiş zaman
*Mehrab* – məscidlərdə qiblə cəhətdəki divarda qayrılmış və pişnamazın önündə durub namaz qıldığı yer
*Meracü qab* – Peyğəmbərin (s) Merac səfərində Allaha iki qaşın məsafəsi qədər yaxınlığını bildirən Quran ayəsinə işarədir
*Məazüllah* – Allaha pənah
*Məbdavü məad* – əvvəl və axır
*Məfluc* – iflic xəstəliyinə tutulmuş
*Məğləğ* – aydın olmayan
*Məhafil* – ("məhfil"in cəmi) məclis, yığıncaq yeri
*Məhət* – dayanacaq yeri, dayanacaq
*Məhvuz* – qorunan, saxlayan
*Məqal* – "olan oldu, keçən keçdi" mənasında işlənən ərəbcə ifadə
*Məqdur* – ayrılmış, bölünmüş
*Məqrun* – birləşmiş, yaxın
*Məqtə* – qəzəlin təxəllüs olan beytindən qabaqkı beyti
*Məlaz* – sığınacaq yer, daldalanacaq
*Məlça* – tərəfini saxlama, qoruma
*Mən rəani* – kim məni görər
*Mənif* – uca, hündür
*Mənzər* – görünüş, obraz
*Mərahim* – mərhələlər

*Mərsəd* – nəzarət məntəqəsi, müşahidə yeri
*Məsa* – axşam
*Məsən* – bülöv
*Məss* – əl vurma, toxunma, təmas, dəymə
*Məstur* – yazılmış
*Məşhud* – şahidlik etmiş (şəxs və ya yer)
*Məşiyyət* – iradə
*Məşriq* – günəşin doğulduğu yer və ya tərəf, şərq
*Mətlə'* – günəşin çıxdığı yer, qəzəlin ilk beyti
*Məzad* – auksion, hərrac
*Məzhər* – bir şeyin zahir olduğu yer, təzahür, yetişmə
*Məzrə'* – əkin yeri, tarla
*Miqaq* – təyin olunmuş vaxt və ya yer
*Muxtar* – sərbəst, asılı olmayan
*Mübah* – izn verilmiş, mümkün ola bilən
*Mübin* – aydın, aşikar
*Müəlla* – yüksək, uca
*Müənbər* – ənbər qoxulu
*Müəttər* – ətirlənmiş
*Müfid* – faydalı, mənfəətli
*Müfsid* – fəsad törədən, fitnəçi, araqarışdıran
*Mühəl (məhal)* – mümkün ola bilməyən, qeyri-mümkün, çətin
*Müxəyyər* – seçməkdə sərbəst olan, istədiyi kimi seçən
*Müjə* – kiprik
*Müqərrər* – qərarlaşdırılmış, qərar verilmiş
*Müqəvvəs* – tağşəkilli, qövsşəkilli
*Müqəyyəd* – bağlı, maraqlanan
*Müqtəda* – təqlid edilən adam; rəhbər, başçı
*Mül* – şərab, çaxır
*Müləvvən* – rəngli, əlvan, rəngarəng
*Mümasil* – tay, bərabər, oxşar
*Müməyyiz* – ayıran, fərq qoyan, yaxşını pisdən seçən, ekspert
*Mümtəni* – imtina edən, mümkün olmayan
*Münəzzəm* – bərabər, tənzim olunmuş
*Münqəriz* – tükənən, bitən, ardı və nəsli kəsilən, məhv edilmiş
*Müntəva* – son dərəcə, son, nəhayət, axır
*Mürğ* – quş
*Mürsəl* – göndərilmiş, yollanmış
*Müshəf* – kitab, Quran
*Müstəme* – eşidən, qulaq asan // dinləyən, dinləyici
*Müstərih* – rahatlanan, dincələn
*Müşrik* – bütpərəst
*Mütəhhər* – təmiz, təmizlənmiş
*Müttəqi* – Allahdan qorxan, dindar, mömin
*Müzaf* – qatılmış, əlavə edilmiş
*Müzər* – zərərli, təhlükəli
*Müztər* – borclu, məcbur

**N**

*Nab* – xalis, saf, təmiz
*Nahid* – Zöhrə ulduzu, Venera
*Naxun* – dırnaq
*Naqə* – dişi dəvə
*Naqus* – zəng
*Nar* – od
*Narvən* – qarağac; kölgəli ağac
*Nas* – adamlar



*Nasih* – nəsihət verən, öyüd verən, nəsihət, nəsihətçi
*Nasir* – kömək edən, köməkçi
*Navək* – ox
*Neydügin* – nə olduğun
*Neyl* – nail olma, məqsədə yetişmə
*Nəcm* – ulduz
*Nəəm* – bəli; hə; düzdür
*Nəhy* – mə'n etmə, qadağan etmə
*Nəxl* – xurma ağacı
*Nəkbət* – bədbəxtlik, fəlakət, düşkünlük
*Nəqat* – "nöqtə"nin cəmi: nöqtələr
*Nəqi* – saf, pak.
*Nəqs* – əskiklik, nöqsan, eyib
*Nəqz* – pozma, sındırma, ləğvetmə
*Nəmud* – görünüş, xarici görünüş
*Nəngü nam* – ad-san, şöhrət
*Nəsnə* – şey
*Nəşvü nüma* – böyüyüb artma, boy atma, inkişaf
*Nəv (noy)* – yeni, təzə
*Nəvahi* – qadağan olunmuş şeylər və ya işlər
*Nik* – yaxşı, xoş
*Nilgun* – göy, mavi, laciverd
*Nun* – ərəb əlifbasında "n" hərfinin adı
*Nur* – işıq
*Nüma* – göstərən, peyda olan
*Nümud* – görünüş, təəssürat
*Nüzul* – aşağı enmə, göydən yerə enmə, nazil olma

**O**

*Ovbaş* – alçaq
*Ovdət* – qayıtma, geri dönmə
*Ovn* – kömək, yardım (etmə)
*Ovraq* – vərəqlərin cəmi
*Ovsaf* – vəsflər
*Ovsət* – ortada olan, ortadakı
*Ovtad* – mismar, mıx

**Ö**

*Övrad* – ("vird"in cəmi) virdlər, əzbərlər
*Öyüz* – qotur

**P**

*Pa* – ayaq
*Pabənd* – ayağıbağlı; əsir, dustaq
*Pabus* – ayaq öpmə; yaltaq
*Parsa* – zahid, abid; vicdanlı, əxlaqlı
*Pərtöv* – işıq, nur
*Pindar* – təsəvvür; zənn, sanma
*Pişva* – rəis, başçı, rəhbər, öndə gedən
*Pürçin* – qıvrılmış, çox qıvrım

**R**

*Ram* – tabe olan, boyun əyən
*Raz* – sirr, gizli şey
*Reyb (rəyb)* – şübhə, şəkk, inamsızlıq
*Rəhnüma* – yol göstərən, bələdçi
*Rəxnə* – sönük, yırtıq; zərər, ziyan, xələl
*Rənc* – zəhmət, əziyyət, narahatlıq
*Rəs* – yetişən, çatan
*Rətbü yabis* – hər nə var, mövcud olan şey; cəfəngiyat, hədərən-pədərən
*Rəvat* – "ravi"nin cəmi; hekayətçi, nağılçı
*Rəyb* – bax: reyb
*Rəz* – meynə, tənək

*Rəzzaq* – ruzi verən, bəsləyən
*Riş* – saqqal
*Rövnəq* – parlaqlıq, gözəllik
*Rövşən* – aydın, işıqlı
*Ru* – üz, çöhrə
*Ruz* – gün, gündüz
*Ruzü şəb* – gecə-gündüz; həmişə

### S

*Sad* – ərəb əlifbasında "s" hərfinin adı
*Sağışə* – say, hesab
*Sai* – səy edən, çalışan
*Salik* – bir yol ilə gedən; bir yolu təqib edən
*Samit* – sakit, susan, lal
*Sapmaq* – düşmək (əyri yola), doğru yoldan çıxmaq
*Sav* – söz, söhbət
*Sayru* – xəstə, azarlı, zəif, halsız
*Seyd* – ov; ovlama
*Sə'bül-məsani* – Həmd surəsi, yəni Quranın birinci surəsinin 7 ayəsi
*Səbğ (səbağі)* – rəngləmə, rəng, rəngləmə işi
*Səbil* – yol; yol üzərində savab üçün su saxlanan bina, ehsan olaraq paylanan hər şey
*Səbuk* – yüngül; iti
*Səbz* – yaşıl
*Sədrə* – lotos ağacı
*Səqət* – bir şeyin işə yaramayan hissəsi; nöqsan; şikəst
*Səla* – çağırış, dəvət
*Səlx* – soyma, üzmə, dərisini çıxarma; ayın son günü
*Sərkar* – başçı, böyük
*Sicn* – zindan, cəhənnəm
*Siqlət* – ağırlıq, sıxıntı, iztirab
*Sirat* – yol; dini əfsanəyə görə cəhənnəm üzərində qurulmuş qıl körpü
*Sirişk* – göz yaşı; damla, zərrə
*Sitiz* – dava, qovğa, qalmaqal, vuruş, döyüş; qabalıq, kobudluq
*Soqaq* – küçə
*Sovmə* – ibadətgah, ibadət yeri, hücrə
*Sövq* – qabağına qatıb sürmə; səbəb olma, təhrik etmə
*Su* – tərəf
*Sufi* – sufi təriqətinə mənsub olan adam
*Suxtə* – yanmış, yanıq
*Sunmaq* – uzatmaq, vermək, təqdim etmək
*Sur* – toy, toy-büsat; qonaqlıq
*Surax* – dəlik, deşik
*Surə* – Quranın bölündüyü 114 fəslin hər biri
*Susən* – zanbaq
*Sücud* – səcdə etmə
*Südur* – zahir olma, hasil olma, çıxma, baş vermə
*Süluk* – rəftar, rəftar etmə, hərəkət tərzi; sufiliyə mənsub olma, riyazətlə məşğul olma
*Sürx* – qırmızı
*Sürud* – nəğmə, şərqi, mahnı

### Ş

*Şab* – cavan, gənc, dəliqanlı, igid
*Şabaş* – afərin! əhsən! toylarda oynayanlara, çalğıçılara verilən pul
*Şağil* – işləyən, məşğul olan (hər hansı bir işlə)
*Şamü səhər* – gecə-gündüz; həmişə, daima



*Şan* – əzəmət, qədr, mərtəbə, şöhrət, ad-san
*Şanə* – daraq, çiyin
*Şeş* – altı
*Şey'* – əşya, predmet
*Şeyb* – ağarmış, saç-saqqal, qocalıq
*Şeyda* – dəlicəsinə vurğun
*Şeyx* – yaşlı adam, qoca; təriqət başçısı
*Şəb* – gecə
*Şəbab* – gənclik, cavanlıq
*Şəbu ruz* – gecə-gündüz
*Şəğər* – ağac
*Şəhamət* – igidlik
*Şəkva* – şikayət, şikayət etmə
*Şəqavət* – bədbəxtlik; yaramazlıq; quldurluq, qaçaqlıq
*Şəllü* – zəif, əzgin
*Şəmsü qəmər* – ay və günəş; ay və gün
*Şəng* – gözəl ədalı, gözəl
*Şərm* – utanma, həya, xəcalət
*Şəyyad* – hiyləgər, kələkbaz, aldadan
*Şəyyar* – şumlanmış yer
*Şin* – ərəb əlifbasında "ş" hərfinin adı
*Şir* – süd
*Şita* – qış
*Şitab* – tələsmə, sürət, çeviklik
*Şitabən* – tələsən, iti gedən, yüyürən
*Şiz* – yunan qozu, qoz
*Şum* – uğursuz
*Şumar* – say, hesab
*Şumul* – şamil olma, əhatə etmə, qavrama
*Şuridə* – qarışıq, dağınıq; aşiq, vurğun
*Şurü şər* – hay-küy, qışqır-bağır, gurultu-patıltı
*Şüca* – igid, qorxmaz, qəhrəman
*Şümar* – say, hesab
*Şürb* – içmə
*Şüru'* – başlama, şüru etmə, girişmə
*Şüstü şu* – yuyub yaxalama, yuyub təmizləmə
*Şütur* – dəvə

### T

*Tab* – qüvvət, güc, taqət; yanma, işıq saçma
*Taban* – parlaq, parıldayan, işıqlı
*Tabü təvan* – taqət, güc, qüvvət
*Taət* – itaət, boyun əymə
*Tahir* – təmiz, pak
*Tak* – tənək, meynə
*Tale'* – tülu edən, doğan, çıxan; bəxt, qismət
*Taleh* – yola gəlməz, islah olunmaz adam, günahkar, təqsirli
*Tamu* – cəhənnəm
*Tanuq* – şahid, tanış
*Tapan* – xidmət edən; səcdə edən
*Tapu* – xidmət, qulluq
*Tar* – qaranlıq
*Tarü mar* – dağılmış, alt-üst olmuş, məhv edilmiş
*Taş* – dışarı, xaric
*Teyr* – quş
*Teyran* – uçağan(lar)
*Teyy* – sarıma, bükmə; kəsmə; keçmə; keçib başa çatma
*Teyyib* – yaxşı, gözəl, xoşa gələn
*Tə'n* – söymə, danlama, başa qaxınc etmə
*Təalallah* – ("Allah yüksəkdir") nə gözəl! nə yaxşı

*Təali* – yüksəlmə, ucalma, artma
*Təam* – yemək, xörək, bişmiş
*Təb* – qızdırma, isitmə
*Təcəlli* – əyan olma, görünmə, zahir olma, təzahür etmə
*Təəb* – yorğunluq; zəhmət, məşəqqət, əziyyət
*Təəhhüd* – öhdəsinə alma, boyun çəkmə, yerinə yetirəcəyinə söz vermə
*Təəllüq* – asılı olma, asılma; xas olma, mənsub olma, aid olma, aidlik
*Təəmmül* – ətraflıca düşünmə, mülahizə, tədqiq, mütaliə
*Təəyyüd* – bayram münasibəti ilə bir-birini təbrik etmə
*Təfərrüd* – tək olma, yalnız qalma; tayı olmama, özbaşına qalma
*Təfərrüq* – dağılma, ayrılma
*Təfrid* – ayırma; təcrid etmə
*Təhəmmül* – qatlaşma, səbr etmə, dözmə
*Təhərrüz* – saqınma, qorunma
*Təhəşşüd* – yığılma, toplanma
*Təhəyyür* – heyran olma, heyrətə düşmə
*Təhəyyüz* – mövqe qazanma, yer tutma
*Təhi* – boş
*Təht* – alt, aşağı
*Təqərrüb* – yaxınlaşma, yaxın olma, yanaşma
*Təlbis* – gey(in)mə; saxtakarlıq, aldatma, hiylə
*Təlx* – acı
*Təməssül* – bənzəmə, oxşama; bir şəkil və surətdə təcəssüm etmə
*Təməyyüz* – tay-tuşundan ayrılma, fərqlənmə, seçilmə
*Tən* – bədən, can
*Təng* – dar, darısqal
*Tənz* – zarafat, tə'nə
*Tərানə* – nəğmə, mahnı
*Tərəh* – qəm, qüssə
*Tərib* – sinə
*Tərif* – yeni, təzə; az tapılan, nadir
*Təriq* – yol, məslək; vasitə, səbəb; tərz, üslub
*Tərrar* – oğru, dolandırıcı
*Təvaf* – Həcc mərasimində Kə'bənin ətrafını dolanma mərasimi
*Təvam* – ekiz
*Təzahür* – görünmə, zühur etmə
*Tiğ* – qılınc, xəncər, ülgüc
*Tih* – çöl, susuz quru səhra
*Timar* – xəstə
*Tin* – palçıq, çamır
*Tinət* – maya, əsil, zat, təbiət, xasiyyət
*Tir* – yaydan atılan ox
*Tiz* – iti, kəskin
*Tov'* – könüllü hərəkət etmə
*Töv'əm* – əkiz; tay, bənzər, oxşar; uyğun, münasib
*Töv'əmiyyət* – əkizlik; oxşarlıq; uyğunluq, münasiblik
*Tövq* – boyunbağı; boyunduruq
*Tulab* – dolab, göy
*Tur* – Ərəbistan yarımadası ilə Misir arasında yerləşən Sina yarımadasında bir dağın adı (əfsanəyə görə Musa peyğəmbərlə Allah arasında ilk danışıq yeri həmin dağ olmuşdur).
*Turağ* – dayanacaq, dayaq
*Tutiya* – gözə sürtülən dərman; çox az və çətin tapılan şey haqqında
*Tüğyan* – coşma, coşqunluq
*Tühur* – çox təmiz, təmizlənmiş
*Tülu* – doğma, çıxma (günəş və s.)



*Türab* – torpaq, toz
*Türfə* – əcayib; qiymətli, nadir
*Türrə* – alından sallanan qıvrım tellər, zülf
*Tütün* – tüstü
*Tüyur* – quşlar

**U**

*Ud* – Hindistanda bitən və yandırıldıqda xoş iy verən ağac adı; Şərq musiqi aləti
*Ulaşdırmaq* – bağlamaq, birləşdirmək, yetirmək
*Ulu* – böyük, yüksək, uca, ali
*Ur* – lüt, çılpaq
*Ur* – vur
*Uş* – budur, bax, artıq (ədat)
*Uş bu* – bax bu
*Uyxu (uyqu)* – yuxu

**Ü**

*Ücb* – məğrurluq, xudpəsəndlik, özünü bəyənmə, kibr
*Üftadə* – düşmüş, yıxılmış; düşkün; mübtəla
*Üftanü xizan* – yıxıla-dura, yıxıla-yıxıla
*Üqba* – axirət, o biri dünya
*Üqdə* – düyün, həlli çətin olan iş, müşkül məsələ; insanın son dərəcə arzu edib nail ola bilmədiyi və qəlbində niskil və düyün kimi qalan şey
*Üqul* – "əql"in cəmi: ağıllar, ağıl, idrak
*Ülüləbsar* – bəsirət sahibləri, uzaqgörənlər
*Ülvi* – yüksək, uca; ilahi, səmavi
*Ümm* – ana
*Ümman* – böyük dəniz, dərya
*Ün* – səs, nida
*Ünsür* – mürəkkəb cisimləri təşkil edən bəsit üzvlərin hər biri; hər bir şeyin tərkib hissəsi
*Üruc* – yuxarı çıxma, göyə qalxma
*Ürvə* – ilgək, ilmə; qulp, dəstək; rabitə, əlaqə
*Üşdə* – bu, bax bu
*Üşətmək* – əl çəkmək, çəkinmək, unutmaq, sındırmaq
*Üşmək* – yıxılmaq
*Üşşaq* – aşiqlər

**V**

*Varmaq* – getmək, yetişmək
*Vas'e* – geniş, enli, əhatəli
*Vasil* – yetişən, çatan; qovuşan, birləşən
*Vav* – ərəb əlifbasında "v" hərfinin adı
*Vaveyla* – eyvah, heyif, təəssüflər; qışqırıq, bağırtı, fəryad
*Vəbal* – günah, təqsir, xəta, yaramaz hərəkət; cavabdehlik; ağırlıq, əzab
*Vəch* – üz, sima, surət
*Vədud* – sevən, sevinc, məhəbbət bəsləyən
*Vəhlə* – an, dəqiqə, dəm
*Vəra* – arxa, ard, geri
*Vərd* – qızılgül
*Vücud* – var olma, varlıq
*Vürud* – gəlmə, gəlib çatma, yetişmə

**Y**

*Yabis* – quru, qurumuş
*Yaqmaq* – yandırmaq
*Yapmaq* – etmək, tikmək
*Yar* – ağız suyu
*Yari* – dostluq; yoldaşlıq

*Yavuz* – sərt, şiddətli, yaman

*Yazı* – çöl, ova, düz

*Yekbar* – bir dəfə, bir dəfədə

*Yəban* – çöl

*Yəd* – əl; kömək; vasitə.

*Yədi-beyza* – ağ əl (Musanın əlinin işıq verməsinə işarədir).

*Yax* – buz

*Yəlda (yelda)* – ilin ən uzun gecəsi

*Yəm* – dəniz, okean

*Yəsar* – var-dövlət; sol, sol tərəf

*Yəzdan* – Allah

*Yılmaq* – sürünmək, hərəkətdə olmaq

*Yoğ* – yox

*Yövm* – gün

*Yunis* – dini əsatirə görə naqqa balığı tərəfindən udularaq dənizləri gəzən peyğəmbərin adı

*Yusif* – dini əsatirə görə fövqəladə gözəlliyi ilə məşhur olub Misirdə qul kimi satılmış və sonradan peyğəmbər olmuş adamın adı (ədəbiyyatda gözəllik və sədaqət rəmzi kimi işlədilir).

*Yümn* – uğur, bərəkət, bəxt

*Yüsrü yəsar* – rahatlıq; sərvət, dövlət, rifah

**Z**

*Za* – ərəb əlifbasında "z" hərfinin adı

*Zat* – mahiyyət; əsil, cövhər

*Zəbun* – əsir, giriftar edilmiş; cüzi, çox az, əhəmiyyətsiz

*Zəc* – ulduz cədvəli

*Zəğr* – mane olma; məcbur etmə; əziyyət vermə

*Zəmir* – iç, hər şeyin iç üzü, batin; ürək; bir şeyin daxili mənası

*Zərq* – keçmişdə sufilərin geydikləri göy paltar, riya, ikiüzlülük

*Zərrü nəf'* – zərərli və mənfəətli, zərər gətirən və mənfəət verən

*Zəval* – zaval, tələf olma, məhv olma, göy cisimlərinin batması

*Zi* – malikiyyət və sahiblik mənası verən ədat

*Zib* – bəzək, zinət

*Zill* – kölgə; himayəçi, hami

*Zində* – diri, yaşayan,

*Ziy* – yaşamaq

*Züha* – günəş işığı, səhər çağı

*Zülcalal* – calal sahibi

*Zünnar* – xristianların riyazət əlaməti olaraq bellərinə sarıdıqları qurşaq



## KİTABDAKILAR

Buraxılışa məsul: *Umud Rəhimoğlu*

Texniki redaktor: *Mübariz Piri*

Kompyuter səhifələyicisi: *Allahverdi Kərimov*

Kompyuter operatoru: *Lalə Cəfərli*

Korrektor: *Tofiq Qaraqaya*

